


INDEX
INTERNATIONAL



COPERNICUS

RESEARCHBIB

ACADEMICRESOUR
CEINDEX




**ISSN 2409-8817**

**AZƏRBAYCAN RESPUBLİKASI ELM VƏ TƏHSİL NAZİRLİYİ**
**AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL İNSTİTUTU**

# *ELMİ ƏSƏRLƏR*
## cild 90, № 2, 2023

# *НАУЧНЫЕ ТРУДЫ*
## том 90, № 2, 2023

# *SCIENTIFIC WORKS*
## volume 90, № 2, 2023

**"Elmi əsərlər" 1934-cü ildən çıxır**
**İldə 6 nömrə nəşr olunur**

**Redaksiyanın ünvanı**:
Bakı şəhəri, Zərifə Əliyeva küçəsi, 96
Tel: 493-96-21, 493-30-06
E-mail: a.abbasov@arti.edu.az
gulizade.gunel@mail.ru
http://www.arti.edu.az/az/

*Azərbaycan Respublikasının Təhsil İnstitutu Elmi Şurasının 29 dekabr 2022-cü il tarixli iclasının qərarı ilə nəşr edilir.*

*Təsisçi: Azərbaycan Respublikasının Təhsil İnstitutu*
*"Elmi əsərlər" məcmuəsi Azərbaycan Respublikası Ədliyyə Nazirliyinin*

*11 iyul 2002-ci il tarixli 23 №-li əmri ilə qeydə alınmışdır.*
*Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir*

## *ÜMÜMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN ANADAN OLMASININ 100 İLLİYİ QARŞISINDA*
## *К 100-ЛЕТИЮ СО ДНЯ РОЖДЕНИЯ ОБЩЕНАЦИОНАЛЬНОГО ЛИДЕРА ГЕЙДАРА АЛИЕВА*
## *ON THE 100 th ANNIVERSARY OF THE NATIONAL LEADER HEYDAR ALIYEV*



*UOT 37.0*

***Lalə Akif qızı Məmmədli***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı mütəxəssisi*
*https://orcid.org/ 0000-0003-0686-3627*

# ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEV NÜMUNƏSİNDƏ TƏRBİYƏ

***Лала Акиф гызы Мамедли***
*доктор философии по педагогике,*
*ведущий специалист Института Образования Азербайджанской Республики*

# ВОСПИТАНИЕ НА ПРИМЕРЕ ОБЩЕНАЦИОНАЛЬНОГО ЛИДЕРА ГЕЙДАРА АЛИЕВА

***Lala Akif Mammadly***
*doctor of philosophy in pedagogy*
*leading specialist at the Institute of Education of the Republic of Azerbaijan*

# UPBRİNGİNG ON THE EXAMPLE OF THE NATIONAL LEADER HEYDAR ALIYEV

**Xülasə**. Ümummilli Liderimiz Heydər Əliyevin həyatı və fəaliyyətli ilə tanışlıq təhsillənmə, tərbiyələnmə və inkişafetdirmə baxımından zəngin material verir. Bu məqsədlə onun müxtəlif mərasimlərdə, qurul-

taylarda, konfranslarda, görüşlərdə çıxışlarından, nitqlərindən faydalanmaq mümkündür. Dərslərdə, mühazirə və seminar məşğələlərində, sinifdənxaric, məktəbdənkənar və auditoriyadankənar tədbirlərdə təhsilalanların Heydər Əliyev nümunəsində tərbiyəsi məsələləri diqqət mərkəzində dayanmalıdır.

***Açar sözlər**: Ümummilli Lider, Heydər Əliyev nümunəsində tərbiyə, xalqın rifahı üçün çalışmaq, nümunə olmaq, xalqın sevimlisi olmaq*

**Резюме.** Знакомство с жизнью и деятельностью нашего Общенационального Лидера Гейдара Алиева предоставляет богатый материал с точки зрения образования, воспитания и развития. С этой целью можно извлечь пользу из его выступлений, речей на различных церемониях, съездах, конференциях и встречах. На уроках, лекционных и семинарских занятиях, внеклассных, внешкольных и внеаудиторных мероприятиях вопросы воспитания обучаемых на примере Гейдара Алиева должно быть в центре внимания.

***Ключевые слова**: Общенациональный Лидер, воспитание на примере Гейдара Алиева, работать на благо народа, стать образцом, быть любимым народом*

**Summary.** Acquaintance with the life and work of our National Lider Heydar Aliyev provides rich material in terms of education, upbringing and development. To this end, one can benefit from his speeches, speeches at various ceremonies, congresses, conferences and meetings. At lessons, lectures and seminars, extracurricular, extracurricular and extracurricular activities, the issues of educating students on the example of Heydar Aliyev should be in the spotlight.

***Keywords**: National Leader, education on the example of Heydar Aliyev, work for the benefit of the people, be an example, be loved by the people*

Təhsilalanlarda Azərbaycan dövlətçiliyinə, tarixi şəxsiyyətlərimizə hörmət və məhəbbət hisslərinin, sədaqətin formalaşdırılması müasir mərhələdə ümumtəhsil, orta ixtisas, texniki peşə və ali məktəblərin qarşısında duran ümdə vəzifələrdən biridir. Həmin tarixi şəxsiyyətlərdən biri Ulu Öndər Heydər Əliyevdir. Təhsil ocaqlarında Ümummilli liderimizin həyat və fəaliyyəti ilə bağlı aparılan söhbətlər, digər tədbirlər, təlim prosesinin imkanlarından faydalanmaq şagirdləri və tələbələri həm maarifləndirir, həm də tərbiyələndirir.

Ulu Öndərin həyatı və fəaliyyətli ilə tanışlıq təhsillənmə, tərbiyələnmə və inkişafetdirə baxımından zəngin material verir. Bu məqsədlə Heydər Əliyevin müxtəlif mərasimlərdə, qurultaylarda, konfranslarda, görüşlərdə çıxışlarından, nitqlərindən faydalanmaq mümkündür.

Dünyanın görkəmli şəxsləri, dövlət və hökumət rəhbərləri Heydər Əliyevin şəxsiyyətini, dövlət xadimi və başçısı, diplomat və böyük siyasətçi kimi fəaliyyətini son dərəcə yüksək dəyərləndirirdilər və Ulu Öndərdən söz düşəndə yenə də yüksək qiymətləndirməkdədirlər.

Dərslərdə, mühazirə və seminar məşğələlərində, sinifdənxaric, məktəbdənkənar və auditoriyadankənar tədbirlərdə həmin fikirlərlə təhsilalanların tanış olmaları məqsədəuyğundur. Diqqət yetirək:

*Mərhum Heydər Əliyev Azərbaycanın xoşbəxtliyi və firavanlığı, bölgədə və dünyada sülh naminə göstərdiyi fövqəladə xidmətlərlə türk və dünya tarixində şərəfli yer tutmuşdur (*Türkiyə Respublikasının Prezidenti Rəcəb Tayyib Ərdoğan)*.

*Uzaqgörən və istedadlı idarəçiliyi sayəsində Azərbaycanın hər sahədə inkişaf etməsini və bugünkü nüfuzlu mövqeyə çatmasını təmin edən Heydər Əliyevi şəxsən tanıdığıma görə böyük şərəf və xoşbəxtlik hissləri keçirirəm.

Azərbaycanın əmin-amanlığı və çiçəklənməsi üçün göstərdiyi səylərlə yanaşı, Heydər Əliyev bütün Qafqaz bölgəsinin sülhün bərqərar olduğu bir məkana çevrilməsi istiqamətindəki fəaliyyəti ilə də daim xatırlanacaqdır.

Heydər Əliyevin dəyərli töhfələri ilə başlanmış müştərək layihələr dost və qardaş dövlətlərimizi bir-birinə daha da yaxınlaşdıraraq, ölkələrimiz arasındakı münasibətlərin sarsılmaz təməllər üzərində qurulduğunu bir daha sübut etmişdir (*Türkiyə Respublikasının sabiq Prezidenti Əhməd Necdət Sezər*).

*Heydər Əliyev XX əsrin görkəmli liderlərindən biri kimi müasir demokratik Avrasiyanın yeni tarixinin bugünkü qurucularındandır (*Qırğızıstanın Xalq Yazıçısı Çingiz Aytmatov)*..

*Bütün dünyada layiqli hörmət və böyük nüfuz qazanmış görkəmli dövlət xadimi həyat-

dan getmişdir. Uzun illər ərzində Heydər Əlirza oğlu Əliyevin səmərəli fəaliyyəti xalqlarımızın ümumi tarixi ilə bilavasitə bağlı olmuşdur. O, Rusiya və Azərbaycanın strateji tərəfdaşlığının təməlini qoymuş, dostluğumuzun və qarşılıqlı anlaşmamızın möhkəmlənməsinə böyük şəxsi töhfə vermişdir (*Rusiya Federasiyasının Prezidenti Vladimir Putin*)

*Heydər Əliyev Cənubi Qafqazda uzun müddət ərzində ən əsas şəxsiyyət olmuşdur (*Amerika Birləşmiş Ştatlarının sabiq prezidenti Corc Buş*).

*Bu qeyri-adi şəxsiyyət Azərbaycanı çiçəklənmə yoluna gətirib çıxarmışdır (*Fransa Respublikasının sabiq prezidenti Jak Şirak*).

*Heydər Əliyevin Azərbaycanın inkişafında və ölkələrimiz arasında əlaqələrin gücləndirilməsində əvəzsiz xidmətləri olmuşdur. 1998-ci ilin iyul ayında Birləşmiş Krallığa səfəri zamanı onunla olan görüşümüzü çox yaxşı xatırlayıram (*Kraliça II Yelizabet*).

*Heydər Əliyev Azərbaycanın böyük lideri idi. O, böhranlar dövründə öz ölkəsinə sabitlik gətirdi. Azərbaycan xalqı onun qoyduğu irs ilə fəxr edə bilər. O, Azərbaycanla Birləşmiş Krallıq arasında hazırda mövcud olan güclü əlaqələrin təməlini qoydu (*Böyük Britaniyanın sabiq Baş naziri Toni Bleyer*).

*Beynəlxalq aləmdə tanınmış siyasətçi, Çin Xalq Respublikasına dostluq münasibəti bəsləyən, Çin xalqının qədim dostu olan cənab Heydər Əliyev Çin-Azərbaycan dostluq münasibətlərinin inkişafında böyük rol oynamışdır (*Çin Xalq Respublikasının sabiq Sədri Xu Szintao*).

Dünyanın sayılıb-seçilən, söz və hakimiyyət sahibi olan insanlar da Ümummilli Liderimizin necə böyük şəxsiyyət olduğunu təsdiqləyirlər.

Ulu Öndərin çıxışları, nitqləri, müxtəlif tədbirlərdəki söhbətləri ilə tanış olan məktəblilər və tələbələrin Heydər Əliyev nümunəsində tərbiyə almalarına kömək göstərir, onun həyatından səmərəli fəaliyyətindən faydalanırlar.

Bu baxımdan "Mən xalqa minnətdaram" "Rossiyski fermer" qəzetinin müxbiri ilə söhbət" müsahibəsi səciyyəvidir.

Müxbirin "Sizin üçün asudə vaxt olduqca şərti anlayışdır" sözlərinə cavab olaraq Ümummilli Lider demişdir: "Həqiqətən belədir. İndi gecədən xeyli keçib, saat ikinin yarısıdır. Biz isə işləyirik. Hər gün belədir, gecəni gündüzə qatıb çalışırıq. İşə səhər tezdən başlayıram, onu, bir qayda olaraq, gecə saat dörd radələrində qurtarıram. Mən həmişə bu qayda ilə işləməyə öyrəşmişəm. Bu iş rejimi mənim üçün adi bir rejimdir" [1, c.1., s. 35].

Bəzilərinə rəhbər vəzifədə işləmək asan gəlir, belələrini vəzifənin zahiri tərəfləri, mötəbər kürsüdə özünə yer tutmaq, qarşısındakılara hökm etmək və s. daha çox maraqlandırır. Görür ki, bir çoxları onun qarşısında əyilir, çoxunun ona işi düşür, onun bircə sözü, dərkənarı ilə çox işlər düzəlir və s. və i.a.

Ulu Öndərin qənaətləri: "Onlar öz yerlərində qalmağa, vəzifələrindən bərk-bərk yapışıb onu əldən verməməyə və öz ailələrinin yağ-bal içində üzməsini təmin etməyə var qüvvələri ilə çalışırdılar" [1, c.1., s. 35].

Ümummilli Lider qurub-yaratmaq, ölkəmizin çiçəklənməsi, tərəqqi etməsi naminə gecəsini gündüzünə qatardı. Diqqət yetirək: "İşə səhər tezdən başlayıram, onu, bir qayda olaraq, gecə saat dörd radələrində qurtarıram" [1, c.1., s. 35]. Göründüyü kimi, Ümummilli liderimiz üçün vaxt anlayışı olmamışdır. Özünün dediyi kimi, *"gecəni gündüzə qatıb"* çalışıb, yorulmaq nə olduğunu bilməyib.

Heydər Əliyevin sözlərindən təəccüblənən və heyrətə gələn müxbir: "Sirr deyilsə, Siz bu qüvvəni haradan alırsınız, axı bu yaxınlarda yetmiş yaşınız tamam oldu, yoxsa Sizə yoq kömək edir?" – deyə ona növbəti sualını vermiş, aşağıdakı cavabı almışdır: "Xeyr, mən yoqla məşğul olmamışam və məşğul olmuram. Görünür, təbiətin özü mənə hansısa bir qüvvə verib. Xarakterim isə qüvvə və bacarığımı səfərbərliyə almağa vadar edir [1, c. 1., s. 35].

Bu cavabdakı "*Xarakterim isə qüvvə və bacarığımı səfərbərliyə almağa vadar edir*" sözləri xüsusilə diqqətimizi özünə cəlb etdi. Xarakterin insanın qüvvə və bacarığını səfərbər etməsi, təbii ki, mühüm məsələdir. Böyük tarixi şəxsiyyətdə məhz bu kimi mühüm keyfiyyət öz ifadəsini tapıbmış. Bu, zəfərlərin, uğurların, istənilən işin öhdəsindən gəlməyin səbəbi, səbəbkarıdır.

Ulu Öndərə məxsus müsbət keyfiyyətlərdən biri də onun siqaret çəkməməsi, spirtli içki içməməsidir. Bu, xüsusilə dövlət orqanlarında çalışan mütəxəssislər üçün zəruri müsbət adət və vərdişlərdəndir. Müsahibə zamanı Heydər Əliyev müxbirə demişdir: "*Ömrümdə heç vaxt*

*siqaret çəkməmişəm. İçkini də rəmzi olaraq dilimə vurmuşam – sağlıq deyiləndə badəni ancaq qaldırmaqla kifayətlənmişəm"* [1, c. 1., s. 35].

Ümummilli liderə məxsus müsbət keyfiyyətlərdən biri də onun səmimi olması, kin-küdurətdən uzaq olması, ona münasibətdə nankorluq edənləri gözümçıxdıya salmamasıdır. Diqqət yetirək: "Həyatda şərəflə şərəfsizliyi, şəxsi rifahla ictimai borcu, tamahkarlıqla vicdanlılığı hər bir kəs özü seçir. Mənim üçün burada suallar yoxdur. O ki qaldı bu adamlara – Allah özü hər şeyi görür. Mən kinli adam deyiləm, heç kəsi də gözümçıxdıya salmaq, təqib etmək fikrim yoxdur" [1, c. 1., s. 35].

Ulu Öndərin ən müsbət keyfiyyətlərindən biri də Azərbaycanımız, xalqımız üçün fədakarlıq göstərməsi idi. Bu xüsusda deyirdi: "Xalqım üçün firavanlıq və əmin-amanlıqdan başqa ayrı bir arzum yoxdur. Bütün varlığımı, bütün qüvvə və bacarığımı mən bu amala həsr etmişəm" [1, c. 1., s. 36].

Heydər Əliyev vaxtilə Azərbaycanda Dövlət Təhlükəsizlik Komitəsinin sədri vəzifəsində çalışmışdı. Çekist idi. Yaranmış vəziyyətlərdən lazımi və etibarlı nəticə çıxarmağı, düzgün qərara gəlməyi və qətiyyətli addım atmağı bacarırdı. Təhlükəsizlik orqanlarında qazandığı bilik, bacarıq və vərdişlər daha yüksək vəzifələrdə - Azərbaycan Kommunist Partiyası Mərkəzi Komitəsinin birinci katibi, SSRİ Nazirlər Soveti sədrinin birinci müavini və Azərbaycan Respublikasının Prezidenti vəzifələrində çalışarkən onun köməyinə gəlirdi. Qətiyyətli, qorxmaz, çevik, cəsarətli, mətin, möhkəm iradəli və mübariz, son dərəcə səriştəli idarəetmə və rəhbərlik qabiliyyətlərinə malik idi.

Ötən əsrin əvvəllərində Naxçıvan Muxtar Respublikasında yaşamalı və fəaliyyət göstərməli olduğu, Ali Məclisin sədri vəzifəsini yerinə yetirdiyi vaxtlarda xalqla birlikdə çətinliklərlə üzləşmişdi, bir yandan da o zamankı respublika rəhbərliyi onun varlığı ilə barışa bilmirdi. Hər vəchlə gözdən salmağa, onu Naxçıvan Muxtar Respublikasında tutduğu vəzifədən kənarlaşdırmağa çalışırdılar. Ulu Öndərin öz sözləridir: "Xalq Cəbhəsi həmyerlilərimə diz çökdürmək istəyirdi: fikirləşirdi ki, xalq yığılacaq və özü Əliyevi kənar edəcək. Adamlara dedim: Mən sizinləyəm, acından ölsək də, birlikdə öləcəyik. Lakin inanırdım ki, qışdan çıxacağıq" [1, c. 1., s. 39].

Xalq isə Ulu Öndəri sevir, müstəqilliyimizin ilk illərində də, sonrakı illərdə də ona öz ümidləri kimi baxır, problemlərinin həllinə məhz onun sayəsində nail olacaqlarına inanırdılar.

Yüksək mənəvi keyfiyyətlərə malik olan Heydər Əliyev insanlarda da əxlaqi saflığa düzlüyə, doğruluğa, vətənpərvərliyə, işgüzarlığa çox böyük dəyər verir, "Siz adamlara hansı keyfiyyətlərinə görə hörmət edirsiniz?" sualına cavab olaraq deyirdi: "Ağlına, elminə, ziyalılığına görə" [1, c. 1., s. 40].

Ulu öndər şeir yazmağı, şəkil çəkməyi uşaqlıqdan xoşlar və bu işlə məşğul olardı, memarlıqla maraqlanardı: "Şer yazırdım. Şəkil çəkirdim. Rəssam olmaq arzusunda idim, lakin sonra fikrimdən daşındım və memarlıq fakültəsinə daxil oldum. Müharibə başlandı, dərslər kəsildi. Halbuki mən tikmək istəyirdim. Özü də gözəl binalar tikmək istəyirdim!" [1, c. 1., s. 40].

Jurnalistin "Siz xarakter etibarilə yaradıcı adamsınız? Həyatınız boyu heç nə dağıtmamısınız?" – sualını belə cavablandırmışdır: "Bakıdakı uçuq-sökük daxmaları dağıtmışam. Adamlar həmin daxmalarda yaşamır– zillət çəkirdilər. Biz həmin adamları abad mənzillərə köçürdük. Həyatım boyu yaxşı çox şey tikmişəm. Uçurduqlarım isə adamlara mane olanlar idi" [1, c. 1., s. 40].

Heydər Əliyevin ad günü münasibəti ilə 1999-cu il mayın 10-da Klivlend klinikasında keçiriləm mərasimdə İlham Əliyev də Ulu Öndərə məxsus nəcib keyfiyyətlərdən söz açmışdır. Oxuyuruq: "Azərbaycan xalqının hələ çox uzun illər cənab Heydər Əliyevə ehtiyacı olacaqdır. Çünki Heydər Əliyev Azərbaycanda və bizim regionda sülhün, əmin-amanlığın, Azərbaycanın müstəqilliyinin, gələcək iqtisadi inkişafının təminatçısıdır. Heydər [184-185] Əliyevin Azərbaycan xalqının gələcəkdə rahat, firavan yaşaması üçün bu günə qədər gördüyü işlər və bundan sonra neçə-neçə illər ərzində görəcəyi işlər həm bizim xalqımız, həm regionumuz üçün, deyə biləm ki, bütün dünya üçün lazımdır. Mən özümü çox xoşbəxt adam hesab edirəm ki, prezident başda olmaqla, bu gün biz hamımız birlikdə burada, yeni dostların arasında bu ad gününü qeyd edirik" [2, c. 2., s. 88].

Həmin mərasimdə çıxış üçün söz alan Türkiyənin məşhur təhsil qurucusu, professor İhsan Doğramaçı demişdir: "Heydər Əliyev təkcə Azərbaycanın deyil, bütün türkdilli dövlətlərin lideridir... Bizim çox hörmətli prezidentimiz Heydər Əliyevi o qədər çox sevirəm ki, qorxuram ona göz dəyər. Ona göz dəyməsin deyə, bütün bəd gözlərə zərər olsun deyə, mən ona bir gözmuncuğu bağışlamaq istəyirəm" [2, c. 2., s. 88].

Son dərəcə səmimi, ürəkdəngələn sözlərdir.

Qeyd etdiyimiz kimi, Ulu Öndər Heydər Əliyev şəxsiyyəti öyünülməlidir, qürur hissi doğurandır, Ümummilli Lider yeniyetmə və gənclər, Azərbaycanımızın bütün vətəndaşları üçün nümunədir. Məqsədəuyğundur ki, valideynlər, müəllimlər gənc nəsli Heydər Əliyev nümunəsində tərbiyə etmək istiqamətindəki fəaliyyətlərini davam etdirsinlər.

**Problemin aktuallığı**. Məqalə Ümummilli Liderimiz Heydər Əliyevin anadan olmasının 100 illiyinə mühüm töhfədir.

**Problemin yeniliyi**. Məqalə Ulu Öndər Heydər Əliyev nümunəsində tərbiyə məsələsinə həsr edilmişdir.

**Problemin praktik əhəmiyyəti**. Məqalə gənc tədqiqatçılar, doktorant və dissertantlar üçün faydalı olacaqdır.

**Ədəbiyyat**:

1. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir: [46 cilddə] / H. Əliyev. Bakı: Azərnəşr, - c. 1. -1997. - 612 s.
2. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir: [46 cilddə] / H. Əliyev. Bakı: Azərnəşr, - c. 20. -2007. - 536 s.

**E-mail:** lale23@mail.ru

**Rəyçilər:** *ped.elm.dok., prof.* **A.N. Abbasov,**
*ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva**
**Redaksiyaya daxil olub**: 07.03.2023-cü il

*UOT 37.0*

***Şəfəq Müzəffər qızı Məmmədova***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*baş mütəxəssisi*

# HEYDƏR ƏLİYEV VƏ "AZƏRBAYCANÇILIQ" İDEOLOGİYASI

***Шафаг Музаффар гызы Мамедова***
*главный специалист*
*Института Образования Азербайджанской Республики*

# ГЕЙДАР АЛИЕВ И ИДЕОЛОГИЯ «АЗЕРБАЙДЖАНСТВА»

***Shafag Muzaffar Mammadova***
*chief specialist at the*
*Institute of Education of the Republic of Azerbaijan*

# HEYDAR ALIYEV AND IDEOLOGY "AZERBAIJANISM"

**Xülasə.** Azərbaycançılıq ümumi anlayışdır, olduqca müxtəlif məsələləri: xalqın tarixən qazandığı təcrübəni, milli-psixoloji xüsusiyyətləri, mənəvi-əxlaqi keyfiyyətləri əhatə edir. Ümummilli liderimiz azərbaycançılıq ideyasının əsasında vətənə sevgini ön plana çəkir və hər bir adama vətəni sevməyi təlqin edirdi. Məqalədə Azərbaycan gənclərinin azərbaycançılıq ruhunda tərbiyə edilməsinin Vətənə layiqli vətəndaş böyüdüb formalaşdırmağın əsas şərtlərindən biri olmasından bəhs edilmişdir.

***Açar sözlər:*** *Müstəqil Azərbaycan, Ümummilli Lider, azərbaycançılıq tərbiyəsi, gənc nəsil, soydaş*

**Резюме.** Азербайджанство – это общее понятие, оно охватывает самые разные вопросы: исторически накопленный народом опыт, национально-психологические особенности, духовно-нравственные качества. Основываясь на идее азербайджанства, наш общенациональный лидер на передний план выдвигает любовь к Родине и призывает всех любить Родину. В статье отмечается, что воспитание молодежи Азербайджана в духе азербайджанства является одним из важных условий воспитания и формирования достойных граждан Родины.

***Ключевые слова:*** *независимый Азербайджан, Общенациональный лидер, воспитание азербайджанства, молодое поколение, соотечественник*

**Summary.** Azerbaijanism is a general concept, it covers a variety of issues: the historical experience of the people, national psychological characteristics, spiritual and moral qualities. Based on the idea of azerbaijanism, our national leader puts love for the Motherland to the fore and calls on everyone to love the Motherland. The article notes that the education of the youth of Azerbaijan in the spirit of azerbaijanism is one of the main conditions for the education and formation of worthy citizens of the Motherland.

***Key words:*** *independent Azerbaijan, national leader, education of Azerbaijan, young generation, compatriot*

Azərbaycanın müstəqillik yolunda inkişafı tələb edir ki, soykökə qayıtmaq qarşıya məqsəd qoyulduğu bir şəraitdə milli tərbiyə, o cümlədən azərbaycançılıq tərbiyəsi barədə gənclər arasında təbliğat işi gücləndirilməlidir. "Azərbaycançılıq sözünün özü Vətənə, vətən övladına, millətə, xalqa məhəbbət hissi oyadır. Ona görə də "azərbaycançılıq" tərbiyəsi termini xüsusilə məktəblilər üçün, onların bu ruhda tərbiyə olunması üçün olduqca gərəklidir. Bu sözdə bir təəssübkeşlik ifadə olunur. Ümummilli Liderimiz H. Əliyev Yeni Azərbaycan Partiyasının II qu-

rultayındakı nitqində “azərbaycançılıq” terminini belə səciyyələndirmişdir: “Azərbaycanın dövlət siyasəti azərbaycançılıq əsasında qurulmuşdur.” (6, s. 162).

İqtibasdan görünür ki, “azərbaycançılıq” termini adi termin olmayıb, bir dövlətin siyasətinin əsasının, təməlinin ifadəsidir.

“Azərbaycançılıq” tərbiyəsi olduqca geniş, əhatəlidir, müxtəlif sahələri, hətta bir-birindən fərqlənən ayrı-ayrı şəraitdə yaşayan bu və ya başqa xalqa, millətə mənsub olan adamların tərbiyəsi ilə bağlı olan çox aktual bir problemdir.

Azərbaycanda yaşayan azərbaycanlılar bu ideyanın əsas daşıyıcılarıdır, Azərbaycan dövlətinin təməlidir, onu göz bəbəyi kimi qoruyub saxlayandır. Azərbaycan mədəniyyətinin, incəsənətinin, xalq adət-ənənəsinin, mərasim qaydalarının yaradılması, mühafizə olunması, inkişaf etdirilməsi və təbliği Azərbaycan vətəndaşı olan azərbaycanlıların əsas vəzifəsidir. Azərbaycanın çiçəklənməsi, hər cəhətdən inkişaf etməsi əsasən öz ərazisində yaşayan və fəaliyyət göstərən azərbaycanlılarla bağlıdır.

Azərbaycançılıq tərbiyəsi Ümummilli Liderimiz Heydər Əliyevin azərbaycançılıq ideyasından nəşət edən tərbiyə istiqamətidir. Azərbaycançılıq azərbaycançılıq ideyasının təbliğidir, həyata keçirilməsidir, böyüməkdə olan nəslin bu ruhda formalaşma istiqamətidir. “Azərbaycançılıq” ideyası ilk dəfə ümummilli liderimiz tərəfindən işlədilmiş, onun təşəbbüsü və rəhbərliyi ilə 1991-ci il dekabr ayının 16-da Naxçıvan Muxtar Respublikası Ali Məclisində qərar qəbul edilmişdir. Bu xüsusda Ümummilli Liderimiz deyirdi: “1980-ci illərin axırında, Sovetlər İttifaqı zəifləməyə başladığı zaman Azərbaycanda yaşayan azərbaycanlılar öz soydaşları, bacı-qardaşları ilə əlaqə qurmağa daha çox cəhdlər göstərmişlər. Məhz bu istək, bu arzu, bu cəhdlər 1989-cu ilin sonunda gənc azərbaycanlıları İranda, Türkiyədə yaşayan azərbaycanlılardan bizi ayıran sovetlər ittifaqının sərhəd qoşunlarının yaratdığı mühəndis istehkamlarını, tikanlı simləri vurub dağıtmağa, qırmağa məcbur etmişdir. Bu, o vaxt – 1989-cu ilin dekabrında tarixi bir hadisə olmuşdur. O günlər Arazın o tayında da, bu tayında da azərbaycanlılar bir-birinə qovuşmağa, birləşməyə çalışmışlar. Bu arzular, bu istəklər yerinə yetmiş və bu gün biz böyük xoşbəxtlik hissi ilə deyə bilərik ki, başqa ölkələrdə yaşayan soydaşlarımızla, qohum-əqrəbalarımızla azad, sərbəst əlaqə yaratmaq imkanına malikik. Biz 1989-cu ilin dekabr ayında baş vermiş bu hadisəyə xüsusi əhəmiyyət verərək 1991-ci il dekabr ayının 16-da Naxçıvanda Muxtar Respublika Ali Məclisinin bu barədə xüsusi qərarını qəbul etdik və 31 dekabr gününü Dünya azərbaycanlılarının həmrəylik günü elan etdik. Biz Naxçıvanda qəbul etdiyimiz bu qərar əsasında Azərbaycan Respublikasının Ali Soveti qərar qəbul etdi... Məni sevindirən odur ki, azərbaycançılıq artıq tarixdə həkk olunmuşdur. Azərbaycan dili, Azərbaycan xalqının ana dili, müstəqil Azərbaycan Respublikasının dövlət dili artıq dünya dilləri içərisində öz yerini tapıbdır. Dünya azərbaycanlılarında millilik, milli vətənpərvərlik hissləri günü-gündən artır, bu da bizim həmrəyliyimizin güclənməsinin rəmzidir. Mən əminəm ki, bütün bu proseslər bundan sonra da inkişaf edəcəkdir” (4, s. 14-17).

Azərbaycan mədəniyyətinin, incəsənətinin xalq adət-ənənəsinin, mərasim qaydalarının yaradılması, mühafizə olunması, inkişaf etdirilməsi və təbliği Azərbaycan vətəndaşı olan azərbaycanlıların əsas vəzifəsidir. Azərbaycanın çiçəklənməsi, hər cəhətdən inkişaf etməsi əsasən öz ərazisində yaşayan və fəaliyyət göstərən azərbaycanlılarla bağlıdır.

Azərbaycanın sərhədlərindən kənarda yaşayan, Azərbaycan dilində danışan insanların sayı təxminən 40 milyondan artıqdır. Onlar müxtəlif ölkələrdə yaşayır, əgər belə demək mümkündürsə, azərbaycanlıdır, lakin başqa ölkə vətəndaşıdır. Bunu düzgün başa düşmək üçün ümummilli liderimiz Heydər Əliyevin tarixi şərhinə nəzər salmaq yerinə düşər:

“Azərbaycanlılar min illərlə öz tarixi, etnik, doğma torpaqlarında – göyük Azərbaycanda yaşamışlar, yaratmışlar və bəşər sivilizasiyasına dəyərli töhfələr vermişlər. Dünyada gedən müharibələr, inqilablar, hərbi münaqişələr, ictimai-siyasi proseslər nəticəsində Azərbaycan parçalanmış, azərbaycanlıların bir qismi yerlərindən-yurdlarından sürgün, deportasiya olunmuş, parçalanma nəticəsində bir-birindən ayrı düşmüşlər. Bəziləri isə özlərinə iş aramaq, təhsil almaq üçün doğma torpaqlarını tərk edib başqa ölkələrdə məskunlaşmışlar. Beləliklə, tarix boyu böyük Azərbaycan torpağından azərbaycanlılar dünyaya səpələnmişlər. İndi, demək olar ki,

dünyanın bir çox ölkələrində azərbaycanlılar yaşayırlar. Rusiyada, Müstəqil Dövlətlər birliyinə mənsub olan digər ölkələrdə, Qafqazda, qonşu Gürcüstanda, Dağıstanda, İranda, Türkiyədə, Avropada, Amerikada, Şərq ölkələrində azərbaycanlıların böyük icmaları yaranıbdır. Onlarda millilik hisləri günü-gündən artır. Onlar bir-biri ilə daha sıx əlaqə qurmağa çalışırlar və həmrəylik hissləri güclənir. Azərbaycan Respublikasının əhalisi milli tərkib etibarilə müxtəlifdir. Burada ayrı-ayrı xalqların nümayəndələri (az və ya çox sayda) yaşayır və onlar da respublikamızın doğma vətəndaşlarıdır. Azərbaycan vətəndaşları arasında milli ayrı-seçkilik yoxdur. Bu, Azərbaycan dövlətinin siyasətidir".

Milli liderin sözləri hər bir Azərbaycan vətəndaşını bu istiqamətdə düşünməyə, onun tələblərinə əməl etmək əzmində olmağa vadar edir, onların etnik mənsubiyyətindən asılı olmayaraq bir ideya – Azərbaycanın mənafeyini müdafiə etmək amalı uğrunda birgə fəaliyyət göstərməyə istiqamətləndirir. Bu baxımdan ümummilli liderimizin "Müstəqil Azərbaycan dövlətinin əsas ideyası azərbaycançılıqdır. Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir" kimi fikirləri son dərəcə qüvvətli səslənir.

"Mən həmişə fəxr etmişəm, bu gün də fəxr edirəm ki, mən azərbaycanlıyam", - Heydər Əliyevin bu kəlamı Azərbaycana sonsuz sevgidir.

**Problemin aktuallığı.** Böyüməkdə olan gənclərin tərbiyəsi sahəsində deyilənlərin qorunub saxlanması, sonrakı nəsillərin bu ruhda tərbiyə olunması dövlətimizin siyasəti, valideynlərin, təhsil ocaqlarının, eləcə də böyük və ya kiçikliyindən asılı olmayaraq hər bir qurumun borcudur.

**Problemin elmi yeniliyi.** Heydər Əliyev müasir azərbaycançılıq ideologiyasının – dövrün, zamanın tələblərini, dövlətçiliyin əsaslarını, milli-etnik şəraiti nəzərə alan milli təlimin banisidir. Çünki azərbaycançılıq ideologiyası məhz onun dövründə həqiqi siyasi-ideoloji məzmun qazanaraq, mükəmməl bir dövlətçilik təliminə çevrildi və müstəqil Azərbaycan Respublikasının dövlət ideologiyası səviyyəsinə yüksəldi.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. Педагогический словарь. -М: АПН, -1960.
2. Bakıxanov, A.A. Gülüstani-İrəm / A.A. Bakıxanov. -Bakı: Elm, -1993, -350 s.
3. Qaralov, Z. Tərbiyə. 3 cilddə / Z. Qaralov. Bakı: Pedaqogika, -2003.
4. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir. I, II, III, IV, V cildlər / H.Ə. Əliyev. -Bakı, Azərnəşr, -2005.
5. Heydər Əliyev və Azərbaycan məktəblilərin gözü ilə / A. Babayev və başqalarının tərtibatında. -Bakı: Gənclik, -1998, -233 s.

**E-mail**: shefeq.2011@mail.ru
**Rəyçilər:** *ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva,**
*filol.ü.fəls.dok.* **A.H. Nəzərova**
**Redaksiyaya daxil olub:** 26.01.2023.

*UOT 37.0*

***Sahilə Biləndər qızı Əmirova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdində*
*Azərbaycan Dövlət Pedaqoji Kollecinin müəllimi*

# HEYDƏR ƏLİYEV VƏ AZƏRBAYCANDA TƏHSİLİN İNKİŞAF STRATEGİYASI

***Сахила Биландер гызы Амирова***
*преподаватель Азербайджанского Государственного Педагогического Колледжа при Азербайджанском Государственном Педагогическом Университете*

# ГЕЙДАР АЛИЕВ И СТРАТЕГИЯ РАЗВИТИЯ ОБРАЗОВАНИЯ В АЗЕРБАЙДЖАНЕ

***Sahila Bilandar Amirova***
*teacher at the Azerbaijan State Pedagogical College*
*of the Azerbaijan State Pedagogical University*

# HEYDAR ALIYEV AND EDUCATION DEVELOPMENT STRATEGY IN AZERBAIJAN

**Xülasə.** Təhsil cəmiyyət və dövlətin inkişafının əsasında durmaqla strateji əhəmiyyətə malik olan və üstün inkişaf etdirilən fəaliyyət sahəsidir. Azərbaycan Respublikasının təhsil sistemi milli zəminə, ümumbəşəri dəyərlərə əsaslanır, demokratik xarakter daşıyır. Məqalədə əsası Ulu Öndər Heydər Əliyev tərəfindən qoyulmuş təhsil strategiyası, təhsilinin inkişafında göstərdiyi əvəzsiz xidmətləri işıqlandırılmışdır. Eyni zamanda, müstəqillik əldə etdikdən sonra təhsil sahəsində qazanılan uğurlar yeni mövqedən araşdırılmışdır.

***Açar sözlər*: *Heydər Əliyev, təhsil, təhsil strategiyası, siyasət, təlim-tərbiyə, kadr təminatı***

**Резюме.** Образование – это сфера деятельности, которая имеет стратегическое значение и является высокоразвитой, обладающей основой развития общества и государства. Система образования Азербайджанской Республики основана на национальной почве, общечеловеческих ценностях и носит демократический характер. В статье были освещены образовательная стратегия, заложенная Великим Лидером Гейдаром Алиевым, и его неоценимые заслуги в развитии образования. В то же время были рассмотрены с новой точки зрения успехи, достигнутые в сфере образования после обретения независимости.

***Ключевые слова:*** *Гейдар Алиев, образование, образовательная стратегия, политика, обучение и воспитание, кадровое обеспечение*

**Summary.** Education is a field of activity that has strategic importance and is highly developed, being the basis of the development of society and the state. The educational system of the Republic of Azerbaijan is based on the national ground, universal values, and has a democratic character. In the article, the education strategy, which was founded by the Great Leader Heydar Aliyev, and his invaluable services in the development of education, were highlighted. At the same time, the successes achieved in the field of education after independence were examined from a new perspective.

***Key words:*** *Heydar Aliyev, education, education strategy, policy, training, personnel provision*

Məlumdur ki, dövlət strategiyasının ən mühüm cəhətlərindən biri təhsildir. Təhsil cəmiyyətin gələcək taleyini müəyyən edən milli sərvətdir. Siyasətin də, iqtisadiyyatın da, mədəniyyətin də gələcəyi təhsil sisteminin bugünkü vəziyyəti ilə şərtlənir. Heydər Əliyevin dediyi kimi, gələcəyimiz bu gün gənclərə nəyi necə öyrətməkdən asılıdır. Gələcəyimizi uğurla qurmaq üçün əvvəlcə bugünkü reallığın, onun müsbət və qüsurlu cəhətlərinin düzgün qiymətləndirilməsi tələb olunur. Mövcud təhsil sisteminin dəyərləndirilməsi üçün də əvvəlcə meyarlar sistemi düz-

gün seçilməlidir. Biz yaxın gələcəkdə və uzaq gələcəkdə cəmiyyətimizi necə təsəvvür ediriksə, necə arzulayırıqsa, bu gələcəyin qurucuları olan insanları da məhz həmin yöndə hazırlamalıyıq, onlara məhz həmin məqsədlərə xidmət edə biləcək əqli və əməli keyfiyyətlər aşılamalıyıq [10]. Təhsil sisteminin başlıca vəzifəsi dərin və hərtərəfli biliyə, yüksək mədəniyyətə, məsuliyyət hissinə, mütərəqqi dünyagörüşə malik olan və onu daim inkişaf etdirməyə çalışan şəxsiyyət formalaşdırmaqdır [7]. Azərbaycan təhsili milli və ümumbəşəri dəyərlər, demokratik, dünyəvi prinsiplər əsasında xalqımızın tarixinə, milli ənənələrinə müvafiq şəkildə inkişaf etdirilmişdir. Azərbaycan Dövlət Təhsil siyasətinin əsas məqsədi milli təhsilimizin inkişafına imkan və şərait yaratmaqdan ibarət olmuşdur.

Bildiyimiz kimi, 1918-cu ildə Azərbaycan Xalq Cümhuriyyəti tərəfindən ilk Xalq Maarif Nazirliyi yaradılmışdır. Nazirlər Şurasının 30 iyun 1918-ci il tarixli qərarı ilə təhsil nazirliyinə ümumi orta təhsil, ali və orta ixtisas təhsili, həm də peşə sahələrindən ibarət olan şöbələr təsdiq edilmişdir. Nazirlik yarandığı ilk gündən təhsil müəssisələrinin milliləşdirilməsi məsələsini ön plana çəkmiş, ümumi icbari təhsil layihələri hazırlamış, kəndlərdə, şəhərlərdə yeni məktəblər açmağa qərar vermişdir [8]. 1920-ci ildə Xalq Maarif Komissarlığı təşkil edilmiş və bütün təhsil müəssisələri onun tabeliyinə verilmişdir [9]. Bu dövr çox mürəkkəb olduğuna görə vahid nazirlik yaratmaq mümkün olmamışdır. AXC hökuməti millətin ərazi bütövlüyünün qorunması ilə yanaşı, xalq maarifinin inkişafı sahəsində təqdirəlayiq işlər görməsinə və xeyli qanunlar qəbul etməsinə baxmayaraq, ADR-in bolşeviklər tərəfindən işğalı milli təhsil quruculuğu sahəsində nəzərdə tutulan əsas islahatların davam etdirilməsinə imkan vermədi.

Azərbaycanda sovet hakimiyyəti qurulduqdan sonra xalq maarifi sisteminin yeni prinsiplər əsasında təşkili ilə təhsil tarixində yeni dövr başlandı. Bu işdə sovet Rusiyasının təhsil modeli əsas götürüldü, vahid dünyəvi əmək məktəbi, birgə təhsil, təhsildə hüquq bərabərliyi prinsipləri ön plana çəkildi.

1920-30-cu illərdə maarifin təməl prinsiplərindən biri əhali arasında savadsızlığı ləğv etmək sayılırdı. Bu hərəkat Xalq Maarifi Komissarlığı nəzdində yaradılmış (1920, sentyabr) Savadsızlığı ləğvetmə üzrə Mərkəzi Komissiya tərəfindən həyata keçirilirdi. Əhalinin bütün təbəqələrini əhatə edən savadsızlığı ləğvetmə məktəbləri və kursları açıldı, "Savadsızlıqla mübarizə komitəsi" (1923, dekabr) və "Rədd olsun savadsızlıq" cəmiyyəti (1924, iyul) təsis edildi. Həmin dövrdə dinə qarşı mübarizə adı altında tarixi ənənəsi olan klassik müsəlman təhsil müəssisələri – məktəb və mədrəsələr tamamilə ləğv edildi. Təhsilin məzmununda milli dəyərlər arxa plana keçdi, saxta beynəlmiləlçilik aparıcı amilə çevrildi, nəticədə təhsilin məzmunu tamamilə sovet ideologiyasına tabe etdirildi.

1959-cu ildən 1988-ci ilə kimi Azərbaycanda təhsillə bağlı Maarif Nazirliyi, Ali və Orta İxtisas Təhsili Nazirliyi adı ilə iki nazirlik fəaliyyət göstərmişdir. Bu iki nazirlikdən başqa Dövlət Texniki Peşə Təhsili Komitəsi fəaliyyətini davam etdirmişdir. Deməli, bu dövrdə Azərbaycanda iki nazirlik və bir komitə fəaliyyət göstərmişdir. Bu dövrdə vahid təhsil nazirliyi yaratmaq uğrunda tədbirlər görülməyə başlamışdır. Nazirliyin yaradılmasının zəruriliyi nəzərə alınaraq 1988-ci ildə Maarif Nazirliyi, Ali və Orta İxtisas Nazirliyi və Dövlət Texniki Peşə Təhsili Komitəsi ləğv edilmiş, bunların əsasında Xalq Təhsil Nazirliyi yaradılmışdır. Azərbaycan Prezidentinin 1993-cü il 3 sentyabr tarixli Sərəncamı ilə "Təhsil Nazirliyi" adlandırılmışdır.

***Ulu Öndərin təhsil strategiyası.*** Heydər Əliyevin təhsil strategiyasının əsasında Azərbaycan iqtisadiyyatının, sənayesinin, savadlı əhalinin inkişafına yönəlmiş strateji addımlar, hər şeydən əvvəl milli-mənəvi dəyərlərin qorunması, yaşadılması, xalqın tarixi, mədəniyyəti, ədəbiyyatı, dili, folkloru və bütövlükdə milli yaddaşının mühafizəsi və ölkənin qüdrətli gələcəyinə xidmət etməsi dururdu. Heydər Əliyev hələ 70-ci illərin əvvəlindən quruculuq missiyasını öz üzərinə götürmüş və milli təhsili parlaq zirvəyə yüksəltməyə nail olmuşdur. Ulu Öndərin təşəbbüsü ilə 1972-ci ildə M.F. Axundov adına Azərbaycan Pedaqoji Dillər İnstitutunun bazasında Pedaqoji Rus Dili və Ədəbiyyatı İnstitutu yaradılmışdır. İnstitutun işinin yeni formatda təşkili onun elmi-pedaqoji potensialının sürətli inkişafına, regionda öz sahəsi üzrə mükəmməllik mərkəzinə çevrilməsinə xidmət etmişdir. Heydər Əliyev ümumtəhsil məktəblərinin, texnikumların, texniki peşə təhsili məktəb-

lərin və ali məktəblərin səmərəli inkişafı sahəsində parlaq proqram vermiş, faydalı üsullar müəyyənləşdirmiş, ona rəhbərliyi planlaşdırmışdır. H. Əliyev "Təhsil haqqında" qanun əsasında rəsmi tədbirlər görülməsini, müxtəlif pərakəndəliyə son qoyulmasını, dərslik və dərs vəsaitlərinin yaradılmasını, klassiklərin əsərləri və şifahi xalq ədəbiyyatı nümunələri ilə kitabxanaların zənginləşdirilməsini və müəllimlərin daha məsuliyyətli çalışmalarını xüsusi vurğulamış, qarşıdakı vəzifələrin zəruri icra olunmasını göstərmişdir.

Heydər Əliyevin təhsil müəssisələri və onların maddi-texniki bazasının genişləndirilməsində əvəzsiz xidmətləri həmişə xalqımızı sevindirmişdir. Azərbaycanda 1970-ci ildə 70 min tələbəni əhatə edən on üç ali məktəbin sayı on səkkizə çatdırılmışdır. Bu dövrdə tələbələrin sayı artıb yüz beş min olmuşdur. Heydər Əliyevin böyük qayğısı və rəhbərliyi əsasında ali məktəblərin bütün sahələri inkişaf etdirilmiş, yüksək göstəricilərə nail olmuşdur. Eyni zamanda, ümumtəhsil orta məktəbləri və ixtisas məktəbləri yeni nailiyyətlər qazanmışlar. Artıq 1982-ci ildə ali təhsil müəssisələrində təhsil alan insanların sayı 100 min nəfərə çatmışdır. Azərbaycanda təhsil alanlarla yanaşı, SSRİ-nin digər ali təhsil müəssisələrində də soydaşlarımızın oxuması məqsədi ilə yüzlərlə həmyerlimiz keçmiş ittifaqın ən aparıcı universitetlərinə göndərilmişdir. Xalqa, millətə və Vətənə layiq mütəxəssislər yetişdirmək ulu öndərin müqəddəs arzusu olmuşdur.

Göründüyü kimi, Azərbaycan 70-80-ci illərdə ümummilli liderimizin siyasəti nəticəsində inkişaf etmiş, təhsil müəssisələri tikilib istifadəyə verilmiş, təhsilin səviyyəsi yüksəldilmişdir [11]. Təhsilin məzmununun müasirləşdirilməsi, əhalinin bütün təbəqələrinin təhsil alması imkanlarının yaradılması, şagirdlərin pulsuz dərsliklərlə təmin edilməsi, tələbələrin təqaüdünün artırılması, məktəbəqədər təlim-tərbiyə təhsil sisteminin təkmilləşdirilməsi, məktəblərin maddi-texniki bazasının gücləndirilməsi, kadr təminatının yaxşılaşdırılması ulu öndərin şərəfli fəaliyyətinin nəticəsidir.

Bildiyimiz kimi, Heydər Əliyev 1993-cü ildə xalqın tələbi ilə yenidən Azərbaycana hakimiyyətə qayıtdı. Bu çətin və məsuliyyətli dövrdə hakimiyyətə qayıdan Heydər Əliyev Azərbaycan Respublikasında ictimai-siyasi sabitliyin yaranmasına nail olmuş, eyni zamanda təhsilə, təhsil xadimlərinə böyük qayğı göstərmiş, təhsilin problemlərini həyata keçirməyə çalışmışdır. Heydər Əliyevin Azərbaycan Respublikasında təhsil sahəsində islahatlar üzrə Dövlət Komissiyası haqqında 1998-ci il martın 30-da nazirin sədrliyi ilə verdiyi Sərəncam bütün illər ərzində ümummilli liderimizin təhsilimizdə və təhsil işçilərinə göstərdiyi xüsusi qayğının parlaq tarixi salnaməsidir. Ümummilli liderimiz Heydər Əliyevin 1999-cu il 15 iyun tarixli fərmanı ilə "Azərbaycan Respublikasında təhsil sahəsində İslahat Proqramı" təsdiq edildi. Təhsilin sifarişçisi, icraçısı və nəzarətçisi xalqın özü oldu. Təhsil sistemində islahatların əsas məqsədi Azərbaycanın təhsil sistemini dünya təhsil sisteminin standartlarına uyğunlaşdırılması olmuşdur [3].

Ümummilli liderimiz gəncləri təhsilli, elmli və zəkalı görmək üçün onların xaricdə təhsil alması üçün hər cür imkanlarla təmin edirdi. Heydər Əliyevin Azərbaycan Müəllimlərinin XI qurultayında məktəb tikintisi, təmiri və təchizatına yardım göstərilməsi ilə bağlı çağırışı cəmiyyətdə böyük əks-səda, canlanma yaratdı. Məhz həmin müraciətdən sonra ölkədəki xarici təşkilatlar və səfirliklər də məktəb tikintisinə yardım etməyə səy göstərdilər. Heydər Əliyevin bu çağırışına ölkənin sahibkarları və xaricdə yaşayan imkanlı azərbaycanlılar da qoşuldu. Ölkəmizdə yeni məktəb binaları tikildi, məktəblər təmir edildi, ali təhsil müəssisələrinin maddi-texniki bazası yaxşılaşdırıldı. Ümummilli liderimizin qayğısı nəticəsində təhsil sistemində yaranmış güclü inkişaf tendensiyaları, yenilik və novatorluq dövrü başlandı. Təhsil sektoru üçün ayrılan büdcə vəsaitləri ildən-ilə artırıldı [8].

Heydər Əliyev Bakı şəhərinin təhsil işçiləri ilə görüşündə bildirmişdir ki, bizim gənclərimiz, orta məktəblərdə təhsil alan gənclər bütün fənlərdən yaxşı hazırlaşmalıdır. Bu günün tələbləri, gələcəyin tələbləri baxımından, dünyanın hər yerində, bütün ölkələrdə inkişaf etmiş iqtisadiyyatı, texnologiyanı, mədəniyyəti, texnikanı mənimsəmək, onları respublikada tətbiq etmək, ölkəmizin iqtisadiyyatını, mədəniyyətini, təhsilini, elmini dünya standartları səviyyəsinə qaldırmaq üçün bizim gənclərimiz gərək yaxşı hazırlaşsınlar. Məktəblər onlar üçün lazım olan fənlərin hamısının tədrisini gərək yaxşı təşkil et-

sinlər. Beləliklə, bizim gənclərimiz gərək bütün əvvəlki nəsillərə nisbətən daha yüksək təhsil almış gənclər olsunlar.

Heydər Əliyevin 13 iyun 2000-ci ildə imzaladığı və ölkənin təhsil sisteminin təkmilləşdirilməsinə xidmət edən Sərəncamı ilə M.F. Axundov adına Azərbaycan Pedaqoji Rus Dili və Ədəbiyyatı İnstitutunun bazasında Bakı Slavyan Universitetinin yaradılması ölkəmizin yeni inkişaf dönəmində atılmış mühüm addımlardan idi. Məhz Ulu Öndərin müəyyən etdiyi inkişaf istiqamətlərinə uyğun olaraq Bakı Slavyan Universiteti slavyan dilləri, ədəbiyyatı, mədəniyyəti üzrə tədrisin və tədqiqatın təşkili sahəsində regionda yeni aparıcı bir təhsil məkanının yaranması ilə nəticələndi [4].

Heydər Əliyev hərbi təhsilə də böyük qayğı göstərmişdi. Azərbaycan Polis Akademiyasının yaradılmasına, Naxçıvanda, Bakıda və digər şəhərlərdə hərbi akademiyaların təşkilinə nail olmuşdur.

Ümummilli liderimiz Heydər Əliyevin "Azərbaycan Respublikasında təhsil sisteminin təkmilləşdirilməsi haqqında" 13 iyul 2000-ci il tarixli [Azərbaycan Respublikası Prezidentinin 13 iyun 2000-ci il tarixli 349 nömrəli Fərmanı], "Azərbaycan Respublikasında ümumtəhsil məktəblərinin maddi-texniki bazasının möhkəmləndirilməsi haqqında" 4 oktyabr 2002-ci il tarixli fərmanları [1] və "Azərbaycan Respublikasında yeni ümumtəhsil məktəblərinin tikintisi, mövcud məktəblərin əsaslı təmiri və müasir tədris avadanlıqları ilə təmin olunmasına dair proqram haqqında" 17 fevral 2003-cü il tarixli sərəncamı ilə islahatın sürətlənməsinə güclü təkan verdi [6]. İslahatın gedişində elmi-tədqiqat işlərinin səmərəli aparılması, təhsil sistemi işçilərinin və təhsil alanların sosial müdafiəsinə, həm də sağlamlığına xüsusi şərait yaradılmışdır.

Heydər Əliyev demişdir: "Cəmiyyətdə hər şey məktəbdən, təhsildən başlayır". Deməli, məktəblərin mənəvi tərbiyəsi zəngin qurulmalıdır. Dövlətçiliyimizin, müstəqilliyimizin rəmzləri olan Azərbaycan bayrağına, gerbinə, himninə dərin məhəbbət aşılanmalı, respublikanın dövlət rəmzlərinin milli iftixar mənbəyi olduğu gənc nəslə şüurlu mənimsədilməlidir.

Heydər Əliyev göstərmişdir ki, təhsil sisteminin iqtisadi təminatı, maliyyə bazası qüvvətli olmalıdır. Çünki iqtisadiyyatı güclü olan ölkə hər şeyə qadirdir. Respublikamızın təhsil sistemi dünya standartlarına uyğun şəkildə formalaşır. Təhsilin maliyyələşməsindən danışarkən Heydər Əliyev qeyd edirdi ki, təhsil sahəsində kəsirlər olmamalıdır. "Çünki təhsildə olan kəsir, çatışmazlıq bizim gələcəyimizə xətalar yaradacaqdır. Buna görə də təhsil dövlət tərəfindən maliyyələşdirilir, - az miqdarda özəl təhsil ocaqları var, - bundan sonra da biz Azərbaycanda təhsilin inkişafını özümüzün siyasətimizin öncül sahəsi hesab edəcəyik, səylərimizi davam etdirəcəyik (1 sentyabr 2001-ci il) [10].

Heydər Əliyevin təhsilə, elmə böyük qayğısının nəticəsidir ki, 1993-cü ildən 2002-ci ilədək AAK tərəfindən 300 nəfərə elmlər doktoru, 2119 nəfərə elmlər namizədi alimlik dərəcəsi verilmişdir. Heydər Əliyevin rəhbərliyi ilə 1995-ci ildə müstəqil Azərbaycanın ilk Konstitusiyası yaradıldı. Konstitusiyada hüquqların təminatı həyata keçirildi, konkret təhsil siyasəti formalaşdırıldı, təkmilləşdirildi, yeniləşdirildi, islahatlara intensiv hazırlıq işləri aparıldı [ 3].

2001-ci ildən başlayaraq Azərbaycan Respublikasının Avropa Şurasına üzv olması ölkəmizin Qərb dövlətləri ilə inteqrasiyasını sürətləndirdi. Azərbaycan öz ali təhsil sisteminin inkişaf prioritetlərini dünyada, o cümlədən Avropa Təhsil məkanında gedən proseslərə qoşmaqla öz mövqeyini xeyli möhkəmləndirdi. Hazırkı mərhələdə ali təhsil sahəsində həyata keçirilən islahatların əsas istiqamətini də məhz bu prinsip təşkil edir. Müasir dövrdə Avropa ölkələri təhsil sistemlərinin inteqrasiyası və Ümumavropa ali təhsil məkanının formalaşdırılması xüsusi aktuallıq kəsb edir.

2002 il sentyabrın 23-də Rusiya Federasiyası və Azərbaycan Respublikası arasında təhsillə bağlı sənədlərin, namizədlik və doktorluq diplomlarının tanınması haqqında hökumətlərarası sazişlər imzalandı [5]. Azərbaycan-Rusiya əlaqələrinin bütün sahələrini daha da inkişaf etdirmək üçün imkanlar genişləndi.

**Problemin aktuallığı.** Göründüyü kimi, ümummilli lider Azərbaycana rəhbərliyi dövründə təhsilin inkişafına böyük önəm vermişdi. Ötən əsrin 70-80-ci illərində Heydər Əliyevin rəhbərliyi ilə təhsil müəssisələrinin geniş şəbəkəsinin yaradılması və bu şəbəkənin zəngin maddi-texniki bazasının formalaşdırılması, gənclərin respublikanın hüdudlarından kənarda yerləşən ali məktəblərə göndərilməsi, hərbi kadrların yetişdirilməsi, respublika Elmlər Akademi-

yasının elmi-tədqiqat institutlarında fundamental elmin inkişafının təmin edilməsi gələcəkdə milli müstəqillik üçün zəruri intellektual zəmin yaratmışdır. Ulu öndər yaxşı bilirdi ki, hər bir ölkədə yüksək ixtisaslı mütəxəssislərin hazırlanması dövlət müstəqilliyinin əsasını təşkil edən ən mühüm amillərdən biridir. Ona görə də dahi rəhbər cəmiyyətin inkişafının əsasını düzgün şəkildə təhsildə, maariflənmədə görür, bu sahənin inkişafına diqqət və marağını əsirgəməmişdir. Ulu öndər keçmiş sovet dövründə Azərbaycan təhsilinin tərəqqisinə mane olan bir sıra amilləri aradan qaldırmış, ölkənin gələcək inkişafının elmi əsaslarla qurulması üçün respublikanın mədəni sərvətlərini, ziyalılarını, ixtisaslı kadrlarını gücləndirmişdir. Yuxarıda qeyd etdiyimiz kimi, məhz bu illərdə respublikanın məktəbləri, ali və orta ixtisas müəssisələri üçün yeni binaların tikintisi geniş vüsət almış, təhsil infrastrukturu tamamilə yenilənmiş, ixtisaslı kadrların hazırlanması üçün ixtisaslaşdırılmış ali və orta ixtisas məktəbləri tikilmişdir. Respublikanın müxtəlif bölgələrində 800-ə yaxın məktəb tikilib istifadəyə verilmişdir.

**Problemin elmi yeniliyi.** Beləliklə, dediklərimizdən aydın olur ki, Heydər Əliyevin fəaliyyətində təhsil xalqın qiymətli milli sərvəti kimi həmişə yüksək qiymətləndirilmişdi. Ümummilli liderimiz Heydər Əliyev iftixarla demişdir: "Təhsil millətimiz üçün, xalqımız üçün vacib məsələdir. Cəmiyyət təhsilsiz inkişaf edə bilməz". Bu gün Heydər Əliyevin təhsil strategiyası onun mütəşəkkil və bacarıqlı davamçısı olan Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən uğurla davam etdirilir. İlham Əliyev Azərbaycanda milli təhsilin inkişafı ilə bağlı dünya mahiyyətli, iri miqyaslı layihələr həyata keçirir, apardığı xarici və daxili siyasət nəticəsində cəmiyyətin bütün sahələrində islahatlar aparır, təhsilimizi müasirləşdirmək, dünya təhsil məkanına inteqrasiya etmək üçün proqramların həllinə uğurlu istiqamət verir. Azərbaycan Respublikası Prezidentinin 24 oktyabr 2013-cü il tarixli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" təhsilimizin daha keyfiyyətli və dünya səviyyəli inkişaf istiqamətlərini müəyyənləşdirmişdir.

**Problemin praktiki əhəmiyyəti.** Məqalə tələbələr və tədqiqatçılar üçün əhəmiyyətli olacaqdır.

**Ədəbiyyat:**


1. "Azərbaycan Respublikası ümumtəhsil məktəblərinin maddi-texniki bazasının möhkəmləndirilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 4 oktyabr 2002-ci il tarixli 1051 nömrəli Sərəncamı
2. "Azərbaycan Respublikasında təhsil sisteminin təkmilləşdirilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 13 iyun 2000-ci il tarixli 349 nömrəli Fərmanı
3. Səmədov, A. Ümummilli liderimiz Heydər Əliyevin Azərbaycanda təhsilə və təhsil xadimlərinə qayğısı. Dərs vəsaiti / A. Səmədov. Gəncə, -2010. -499 s.
4. Nağıyev, A. Heydər Əliyev və təhsil siyasəti // "Azərbaycan" qəzeti. -2022, 13 dekabr. -s.4
5. Azərbaycan Milli Ensiklopediyası. -Bakı, 2007. -885 s.
6. Azərbaycan Respublikasında yeni ümumtəhsil məktəblərinin tikintisi, mövcud məktəblərin əsaslı təmiri və müasir tədris avadanlıqları ilə təmin olunmasına dair Azərbaycan Respublikası Prezidentinin 17 fevral 2003-cü il 1147 nömrəli Sərəncamı
7. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu. Bakı: Öyrətmən, -1993. -40 s.
8. Əhmədov, H. Azərbaycan təhsilinin inkişaf strategiyası. / H. Əhmədov. -Bakı: Elm, -2010, -800 s.
9. Mərdanov, M. Azərbaycan təhsili Xalq Cümhuriyyəti / illərində (1918-1920). / M. Mərdanov, Ə. Quliyev. -Bakı: Çaşıoğlu, -2003, -240 s.
10. Xəlilov, S. Təhsil, təlim, tərbiyə. / S. Xəlilov.- Bakı, "Azərbaycan Universiteti" nəşriyyatı, -2005, -650 s.
11. Гусейнова, И. Гейдар Алиев - от политического руководителя к общенациональному лидеру. / И. Гусейнова. -Баку, Тахсил, -2005, -504 с.


**E-mail:** amirovasahila1@gmail.com
**Rəyçilər***:* *ped.elm.dok., prof.* **H.H. Əhmədov,**
*ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva**
**Redaksiyaya daxil olub:** 13.02.2023

*UOT 37.0*

***Könül Faiq qızı Mahmudova***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti*
*https://orcid.org /0000-0001-7042-9257*

# PEDAQOJİ VƏ METODİK ƏDƏBİYYATDA ŞAGİRDLƏRDƏ HƏYATİ BACARIQLARIN FORMALAŞDIRILMASI MƏSƏLƏLƏRİ

***Кѐнуль Фаиг гызы Махмудова***
*доктор философии по педагогике*
*доцент Азербайджанского Государственного Педагогического Университета*

# ВОПРОСЫ ФОРМИРОВАНИЯ ЖИЗНЕННЫХ НАВЫКОВ УЧАЩИХСЯ В ПЕДАГОГИЧЕСКОЙ И МЕТОДИЧЕСКОЙ ЛИТЕРАТУРЕ

***Konul Faig Mahmudova***
*doctor of philosophy in pedagogy*
*associate professor of Azerbaijan State Pedagogical University*

# ISSUES OF FORMING LIFE SKILLS OF STUDENTS IN PEDAGOGICAL AND METHODOLOGICAL LITERATURE

**Xülasə.** Təqdim edilən məqalədə pedaqoji və metodik ədəbiyyatda şagirdlərdə həyati bacarıqların formalaşdırılması ilə bağlı məsələlər öz əksini tapır. Həyati bacarıqların formalaşdırılması ilə əlaqədar müəllim hazırlığı sahəsindəki vəziyyət, tədqiqatçı alimlərin problemə yanaşması, normativ hüquqi sənədlərdə həyati bacarıqların formalaşdırılması ilə bağlı qoyulan tələblər araşdırılır.
***Açar sözlər:*** *təhsil siyasəti, həyati bacarıqlar, müəllim hazırlığı, normativ hüquqi sənədlər, çap resursları*

**Резюме.** В представленной статье подчеркнуты вопросы, связанные с формированием жизненных навыков учащихся в педагогической и методической литературе. Исследуется ситуация в сфере подготовки учителей, связанная с формированием жизненно важных навыков, подход ученых-исследователей к проблеме, а также требования, установленные в нормативно-правовых документах относительно формирования жизненно важных навыков.
***Ключевые слова:*** *образовательная политика, жизненные навыки, подготовка учителей, нормативно-правовые документы, печатные ресурсы*

**Summary.** The presented article highlights issues related to the formation of students' life skills in the pedagogical and methodological literature. The situation in the field of teacher training related to the formation of life skills, the approach of research scientists to the problem, as well as the requirements established in the legal documents regarding the formation of life skills are studied.
***Key words:*** *education policy, life skills, teacher training, regulations, printed resources*

Ulu Öndər Heydər Əliyev elmə, təhsilə daim diqqət və qayğı ilə yanaşmış, istər Azərbaycanda, istərsə də onun hüdudlarından kənarda əldə olunması mümkün olan bütün nailiyyətlərin səbəbini elm və təhsildə görürdü.

Təhsil vasitəsilə şagirdlərdə bilik, bacarıq və vərdişlərin formalaşdırılması, onların əqli qabiliyyətinin inkişaf etdirilməsi həyata keçirilir. Tərbiyə və təhsil "təlim" vasitəsilə həyata keçirilir. Hər bir pedaqoji fəaliyyət növündə olduğu kimi müəllimin fəaliyyətində də təlim sistemli

və məqsədyönlü olmalıdır. Müəllim öyrətməyə haradan başlayıb, harada bitirəcəyini dəqiq planlaşdırmalıdır. Təlim prosesində məktəblilər bilik və bacarıq qazanmaqla bərabər, eyni zamanda yaradıcı bir şəxsiyyət kimi formalaşmalı, sərbəst düşünən bir insan kimi öz biliklərini bacarığa, daha sonra isə vərdişə çevirə bilməlidirlər. Yəni, şagirdlər əldə etdikləri nəzəri bilikləri bacarığa, bu bacarıqları isə zaman keçdikcə vərdişə çevirməyə çalışmalıdır. Nəticədə şagird öz biliklərini gündəlik həyatında yaradıcı surətdə istifadə etmək qabiliyyətlərinə malik olmalıdır. Təbii ki, bu yolda o tək deyil, bu yolda ona bələdçilik edən müəllim faktoru əsas rol oynayır.

Şəxsiyyətin inkişafı üçün ümumtəhsil müəssisələrində tədris olunan bütün fənlər xüsusi əhəmiyyət kəsb edir. Bu fənlərdən biri də biologiyadır. Hər bir fənn üzrə, eləcə də biologiya fənni üzrə həyati bacarıqların formalaşdırılması günümüzün aktual problemlərindəndir. Bu baxımdan problemlə bağlı hər hansı bir fikir söyləməzdən öncə həyatı bacarıqlar, təlim prosesində bu bacarıqların formalaşdırılması ilə bağlı təhsil sahəsindəki normativ hüquqi sənədlərə, elmi metodiki jurnallara, pedaqoq alimlərin fikirlərinə yaxından nəzər salmaq vacibdir. M. Qorkinin: "Keçmişi nə qədər gözəl bilsək, hazırda bütün yaratdıqlarımızın əhəmiyyətini o qədər asan, dərin və sevinclə başa düşə bilərik," sözlərinə istinad edərək deyə bilərik ki, doğrudan da yeni fikirlər irəli sürmək, yeni bir iş ərsəyə gətirmək üçün keçmişi, metodistlərin, alimlərin yanaşmalarını bilmək zəruridir.

Təhsil sahəsində uzun illərdən bəri aparılan islahatlar çərçivəsində səriştəyönlü, şəxsiyyətyönlü, nəticəyönlü təhsil proqramları hazırlanmış, təhsilin məzmununda köklü dəyişik-liklər edilmişdir. Təhsil sahəsində aparılan islahatların nəticəsi olaraq bir sıra normativ hüquqi sənədlər təsdiq olunmuş, çap və elektron resurslar təkmilləşdirilir. Proqram, dərslik və tədris planları dövlətin təhsil siyasətinin ümumi prinsipləri əsasında hazırlanır. Lakin hələ də nəzəri biliklərin emal olunması, bu biliklərin həyati bacarığa çevrilməsi və gündəlik həyatda tətbiq olunması məsələləri tam olaraq öz həllini tapmamışdır.

Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyi 22 may 2006-cı ildə "Həyati bacarıqlara əsaslanan təhsil üzrə Milli Konsepsiya" təsdiq etmişdir (5). Konsepsiya Azərbaycanda aparılan təhsil islahatı sayəsində – "Ümumi təhsilin keyfiyyəti və real tələbatlara uyğunluğu" probleminin həllinə istiqamətlənmişdir. Sənəd gənc nəsildə sağlam həyat tərzi və yaşamaq bacarıqları formalaşdıran, onların bu sahədə bilik və bacarıq əldə etməsinə xidmət edən sənəddir.

Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyinin təhsil islahatının aparıldığı dönəmdə həyata keçirdiyi uğurlu layihələrdən biri də ümumtəhsil məktəblərində "Həyati bacarıqlara əsaslanan təhsil" fakultativ kursunun tədrisi ilə bağlıdır (17.07.2006-ci il tarixli 571 saylı əmr). Əmrdə qeyd olunur ki, Təhsil Nazirliyi məzmun islahatları istiqamətində bir sıra beynəlxalq təşkilatlarla birlikdə layihə və proqramlar həyata keçirir. Belə layihələrdən biri də Qlobal Fond və digər təşkilatlar tərəfindən həyata keçirilən "Azərbaycanda İİV/QİÇS-ə qarşı cavab tədbirlərinin gücləndirilməsi" layihəsidir (8). Bu layihə dünya təcrübəsində geniş tətbiq olunmuş, Azərbaycanda 2006-cı ilin yanvarından həyata keçirilməyə başlamışdır. Layihə çərçivəsində ümumtəhsil məktəblərində "Həyati Bacarıqlara Əsaslanan Təhsil" üzrə fakultativ kurs tədris olunmuşdur. Məzmununa görə inteqrativ olan bu kursun tədrisi əsas etibarilə biologiya müəllimlərinə həvalə edilmiş və məqsəd şagirdləri sağlam həyat tərzi və yaşamaq bacarıqlarına yiyələndirmək, bu sahədə müvafiq bilik, bacarıq və vərdişlərin strategiyaların formalaşdırmaqdan ibarət olmuşdur. Kursun məzmununun təhlili onu göstərir ki, dörd cilddə hazırlanmış vəsaitə sağlamlığın qorunması ilə yanaşı, insan hüquqları, vətəndaşlıq və digər qlobal sosial problemlər də daxil edilmişdir. Müxtəlif öyrənmə üsullarından istifadə etməklə şagirdlərdə sağlam həyat tərzinin formalaşdırılması, dəstəklənməsi, insanın mühitə adaptasiyası, müsbət davranışların təbliği, gündəlik həyatda rast gəlinən çətinliklərin öhdəsindən gəlmək, problem həll etmək, tənqidi, yaradıcı düşünmək, sağlam münasibətlər qurmaq və s. kimi bacarıqların formalaşdırılması həyata keçirilmişdir.

Normativ hüquqi sənədlərin məzmuna nəzər saldıqda bu rəsmi sənədlərdə təhsilalanlarda həyati bacarıqların formalaşdırılmasının ön plana çəkildiyi aydın görünür. Azərbaycan Respublikası Nazirlər kabinetinin 2020-ci ildə təsdiq etdiyi "Azərbaycan Respublikasında ümumi təhsilin dövlət standartları" sənədinin 10-cu

bəndində (Ümumi təhsilin ibtidai, ümumi orta və tam orta təhsil səviyyələrində tədris edilən fənlər üzrə ümumi təlim nəticələri) ümumi orta təhsil səviyyəsində tədris edilən biologiya fənni üzrə təlim nəticələri aşağıdakı kimi təsnif edilir:

- canlıların quruluşunu, onların bir-birilə və cansız aləmlə qarşılıqlı əlaqəsini izah edir;
- canlılarda gedən bioloji prosesləri şərh edir;
- bioloji biliklərini tətbiq edir;
- ətraf aləmin və sağlamlığın qorunması ilə bağlı təqdimatlar edir.

Tam orta təhsil səviyyəsi üzrə:

- səviyyələr üzrə canlıların quruluşunu və bioloji proseslərin qanunauyğunluqlarını şərh edir;
- ekoloji problemlərin həll yollarına və sağlamlığın qorunmasına aid layihələr hazırlayır;
- bioloji biliklərinin tətbiqi sahələrinə dair təqdimatlar edir (6).

Göründüyü kimi, təhsil sənədində də bioloji biliklərin tətbiqi xüsusi olaraq vurğulanır.

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" sənədində qeyd olunur ki, kurikulumlar iqtisadi inkişaf məqsədlərinə xidmət edən bilik və bacarıqları, səriştəni aşılayan məzmuna malik olmalıdır. İqtisadi uğurlar əldə etmiş ölkələrdə biliklərə əsaslanan iqtisadiyyatın yaradılması sosial-iqtisadi siyasəti prioritet olduğundan, kurikulumlarda innovasiyaların əhəmiyyəti, təhsilalanların müxtəlif sosial fəaliyyətə təşfiq olunması və onların tədris bacarıqlarının inkişafı xüsusi vurğulanır.... Bu baxımdan təhsilin məzmunun formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyi önə çəkilir. Səriştə əldə olunmuş bilik və bacarıqları praktiki fəaliyyətdə səmərəli tətbiq etmək qabiliyyətidir. O, şəxsin qazandığı bilik və bacarıqları konkret fəaliyyətin nəticəsinə çevrilməsini təmin edir. Səriştəyə əsaslanan təhsil inkişafa daha səmərəli xidmət göstərir (7).

Müxtəlif illərdə həm dövlət qurumları, həm tədqiqatçılar həyati bacarıqların formalaşdırırılması, xüsusən də sağlam həyat tərzi problemlərinə diqqəti xeyli artırmışlar. Pedaqoqlar, tibb işçiləri, psixoloqlar, sosioloqlar gənc nəslin sağlamlığı, onun təşkili ilə bağlı elmi-pedaqoji və metodik ədəbiyyatlar, maarifləndirici materiallar nəşr etdirmişlər.

Gənc nəslin sağlamlığı, bu işdə bədən tərbiyəsinin, sağlam həyat tərzinin rolu problemləri yerli alimlərimiz – Ə.Ş. Həşimov, Y.R. Talıbov, N.M. Kazımov, B.A. Əhmədov, Ə.X. Paşayev, H.A. Cəfərov, F.A. Rüstəmov, F.A. Sadıqov, A.Ə. Əliyev, M.S. Qasımov, H.A. Həmidovun, rus pedaqoq alimlər V.F. Bazarnıy, L.Q. Tatarnikova, V.O. Morozov, Q.K. Zaytsev, V.P. Kaznaçeyev, Z.İ. Kukanova, N.A. Qolikov, M.Q. Kolesnikova, A.S. Batuyev və digər alimlərin əsərlərində öz əksini tapmışdır.

Təhlil və araşdırmalar onu deməyə əsas verir ki, istər Azərbaycanda, istərsə də Rusiya ölkələrində biologiya fənni üzrə həyati bacarıqların formalaşdırılması məsələlərinə daha çox sağlamlıq aspektindən yanaşılmış, bu sahə hərtərəfli tədqiq olunmamışdır.

Problemlə bağlı fəlsəfə və elmlər doktorluğu üzrə yazılmış dissertasiya işləri təhlil edilmişdir.

Problemə sağlamlıq aspektindən yanaşan fəlsəfə doktorluq mövzusu "Yeniyetmələrdə sağlam həyat tərzinin tərbiyə edilməsinin yolları" olan Gülnarə Hüseynağa qızı Hüseynova öz tədqiqatında II fəslin "Yeniyetmələrdə asosial hərəkətlərə meylliliyin aradan qaldırılması yolları" III paraqrafında yeniyetmələrin fərdi və ictimai ziyanlı meyllərə qurşanmasından danışılır. O, bu paraqrafda narkotik maddələrə aludəçilik, alkoqolizm, siqaret kimi zərərli vərdişlərin yeniyetmə orqanizminə mənfi təsirini göstərir, eyni zamanda da bunların səbəbləri, statistik məlumatları qeyd edir. Müəllif müasir dövrdə yeniyetmələrin sağlamlığı üçün xüsusi təhlükə yaradan yoluxucu xəstəliklər və onların yoluxma yolları, yayılmasını əks etdirən statistik məlumatları, yoluxmanın qarşısının alınması yolları, deviant davranış və onu törədən səbəblərdən, ona qarşı mübarizə aparmaqdan bəhs etməklə bu sadalananlarla bağlı şagirdlərdə bacarıqların formalaşdırılmasının zəruriliyini qeyd edir. Bəhs olunan məsələlərlə əlaqədar Ə.Ə. Ağayev, X.A. Talıbova, M. S. Qasımov, G.M, Əhmədova, V.A. Suxomlinski, A.A. Rean, K.A. Səmədov və başqalarının əsərlərindən nümunələr gətirilir.

A.B. Əliyeva "Zoologiyanın tədrisində şagirdlərin fermer təsərrüfatı əməyinə hazırlaşdırılmasının imkan və yolları" adlı dissertasiya işində haqlı olaraq qeyd edir ki, təbiət elmləri, o

cümlədən biologiya elmləri istehsalatın elmi əsaslarla idarə olunmasında mühüm yer tutur. Ona görə də hazırkı şəraitdə biologiya elminin istehsalatın idarə olunmasındakı rolunu və elmlərin istehsalatın təsirinin açıqlaması ən vacib problemlərdəndir. Bu baxımdan təbiət fənlərinin potensial imkanları aşkar edilməlidir. Lakin həmin imkanlar hələ tam aşkarlanmamışdır. Bu sahədə tədqiqatlar az aparılmışdır.

O, qeyd edir ki, şagirdlər gələcəkdə insanın yaşayış səviyyəsini yüksəldə bilən, yaşayış tərzi ilə əlaqədar tələb olunan, cəmiyyətdə öz yaşayışını təmin edən və daha yararlı olmaları üçün tələb olunan bilik və bacarıqlara yiyələnməlidirlər.

Ü.B. Vəliyevanın "Biologiya fənninin "insan" kursunun tədrisində bioloji bilik və bacarıqların formalaşdırılması üzrə işin sistemi" adlı dissertasiyasında müəllif ümumtəhsil məktəblərində "İnsan" kursunun tədrisində şagirdlərdə bilik və bacarıqların formalaşdırılmasının imkan və yollarını müəyyənləşdirmiş, şagirdlərdə idrak fəaliyyətinin inkişafında fərdi işin təşkili xüsusiyyətlərini, tədqiqatçılıq bacarığının inkişaf istiqamətlərini ümumiləşdirmiş, biologiya təliminin keyfiyyətinin və məhsuldarlığının yüksəldilməsinə təsir göstərən amilləri səciyyələndirmişdir. Lakin müəllif bu problemə ümumi aspektdən yanaşmamış, yalnız müxtəlif fəal təlim üsullarından istifadə etməklə problemin aradan qaldırılması yollarını göstərmişdir, hazırladığı metodika isə əsas etibarilə tədqiqatçılıq bacarığının inkişaf etdirilməsinə həsr olunmuş, qiymətləndirmə mexanizmlərini də bura daxil etmişdir.

G.R. Məhərrəmova "Ümumtəhsil məktəblərində təbiət fənlərinin tədrisində ekoloji tərbiyə üzrə işin sistemi" adlı dissertasiyasında qeyd edir ki, ekoloji tərbiyədə şagirdlərin yaşadığı mühitin öyrənilməsi, şəxsi təcrübələrin araşdırılması başlanğıc nöqtə ola bilər. Bu halda sonradan ümumiləşdirmələr aparılması yaddan çıxmamalıdır. Hər bir mövzunun araşdırılması ekoloji situasiyaya şagirdlərin düzgün münasibətini, onu qiymətləndirmək bacarığını, aktiv reaksiyasını, tənqidi təfəkkürünü formalaşdırmalıdır. Şagirdlər ekoloji ziddiyyətlərin həlli yollarını öyrənərkən sadədən mürəkkəbə, lokal məsələlərdən regional, millidən beynəlxalq miqyasda həll axtarmağı bacarmalıdır.

Göstərilən bu tədqiqat işləri ilə bərabər, deyə bilərik ki, təəssüflər olsun ki, biologiya fənni üzrə formalaşdırılmalı olan ayrı-ayrı bacarıqlar, bunların həyati əhəmiyyəti, nəzəri və praktik əsasları, müasir dövrün tələbinə uyğun həyati bacarıqların formalaşdırılması ilə əlaqədar köklü elmi axtarışlar aparılmamışdır.

Təhsilalanlarda həyati bacarıqların formalaşdırılması məsələsinə, təbii ki, birtərəfli yanaşmaq olmaz. Unutmamalıyıq ki, bu bacarıqların formalaşdırılmasına birbaşa məsuliyyəti biologiya müəllimləri daşıyır. Bu baxımdan ali pedaqoji təhsil müəssisələrində müəllim hazırlığı proqramları, eyni zamanda dərsliklər və dərs vəsaitlərinin də təhlilinə böyük ehtiyac vardır. Ali təhsil müəssisəsində gələcəyin müəllimi əldə etdiyi dərin bioloji bilikləri şagirdlərə necə ötürməli olacağını, nəzəri biliklərin praktikada tətbiqinə necə nail olacağını öyrənməlidir.

Bu baxımdan ali məktəblər üçün ayrı-ayrı illərdə hazırlanmış proqramların, bu proqramlar əsasında hazırlanan dərsliklərin, dərs vəsaitlərinin imkanları daha genişdir. Bu vəsaitlərin hazırlanması zamanı əsas məqsəd gələcəyin təhsilverənlərində təhsilalanların həyati bacarıqlara yiyələnməsini ön plana çəkən, bunu tövsiyə edən mövzulara geniş yer verilməsi olmalıdır. Lakin bu istiqamətdə araşdırma aparılarkən bir sıra metodiki ədəbiyyatlarda biologiyadan praktik dərslərə üstünlüyün verilməsi ilə bağlı istiqamət verilsə də, şagirdlərdə bu fənn vasitəsilə hansı bacarıqların və necə formalaşdırılacağına diqqət çəkəcək materiallara yer verilmir.

Son olaraq onu qeyd etmək istərdim ki, nəzərə almaq lazımdır ki, bu gün ümumtəhsil məktəblərində formalaşan şagirdlərimizin əldə etdikləri bilik, bacarıq və vərdişlər növbəti onilliklərdə ölkənin gələcək inkişafına xidmət etməlidir.

**Problemin aktuallığı.** Şagirdlər gələcəkdə insanın yaşayış səviyyəsini yüksəldə bilən, yaşayış tərzi ilə əlaqədar tələb olunan, cəmiyyətdə öz yaşayışını təmin edən və cəmiyyətdə daha yararlı olmaları üçün tələb olunan bilik və bacarıqlara yiyələnməlidirlər.

**Problemin elmi yeniliyi**. Hər bir mövzunun araşdırılması ekoloji situasiyaya şagirdlərin düzgün münasibətini, onu qiymətləndirmək bacarığını, aktiv reaksiyasını, tənqidi təfəkkürünü formalaşdırmalıdır. Şagirdlər ekoloji ziddiyyətlərin həlli yollarını öyrənərkən sadədən mürəkkəbə, lokal məsələlərdən re-

gional, millidən beynəlxalq miqyasda həll axtarmağı bacarmalıdır.

**Problemin praktik əhəmiyyəti.** Ali təhsil müəssisəsində gələcəyin müəllimi əldə etdiyi dərin bioloji bilikləri şagirdlərə necə ötürməli olacağını, nəzəri biliklərin praktikada tətbiqinə necə nail olacağını öyrənməsi məqsədəuyğundur. Məqalədən təhsil müəssisələrində çalışan mütəxəssislər, müəllimlər, dissertant və doktorantlar faydalana bilər.

**Ədəbiyyat:**

1. Azərbaycan Respublikasının Ümumtəhsil məktəbləri üçün biologiya fənni üzrə təhsil proqramı (kurikulumu): VI- XI siniflər. Bakı, 2013.
2. Верзилин Н.М., Корсунская В.М. Общая методика преподавания биологии. -М.: Просвещение, -1983, -384 с.
3. Методика обучения биологии / В.С. Конюшко, С.Е. Павлюченко, С.В. Чубаро. -Мн.: Книжный дом, -2004.
4. Dervişoğlu, S., Yaman, M. ve Soran, H. Orta öğretim öğrencilerinin biyoloji dersine ve biyoloji konularına ilgilerinin belirlenmesi. Hacettepe Üniversitesi Eğitim Fakültesi Dergisi, 2004.
5. Həyati bacarıqlara əsaslanan təhsil üzrə milli konsepsiya. Azərbaycan Respublikası Təhsil Nazirliyi, -Bakı: Universal Servis MMC, -2007, -s.5..
6. https://e-qanun.az/framework/46052
7. https://president.az/az/articles/view/9779
8. https://edu.gov.az/az/printpage/13738

**E-mail:** konul-mahmudova@mail.ru
**Rəyçilər:** *biol.elm.dok., prof.* **R.L. Sultanov**
*ped.ü.fəls.dok., dos.***İ.A. Cavadov**
**Redaksiyaya daxil olub:** 16. 02.2023

*UOT 37.0*

***Lalə Zahir qızı Allahverdiyeva***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Naxçıvan Müəllimlər İnstitutunun dosenti*

## "PEŞƏ KOMPETENSİYALARI" ANLAYIŞININ PEDAQOJİ ƏDƏBİYYATDA QOYULUŞUNA DAİR

***Лала Захир гызы Аллахвердиева***
*доктор философии по педагогике, доцент*
*Нахчыванского Института Учителей,*

## К ОПРЕДЕЛЕНИЮ ПОНЯТИЯ «ПРОФЕССИОНАЛЬНЫЕ КОМПЕТЕНЦИИ» В ПЕДАГОГИЧЕСКОЙ ЛИТЕРАТУРЕ

***Lala Zahir Allahverdiyeva***
*doctor of philosophy in pedagogy,*
*associate pofessor of Nakhchivan Institute of Teachers*

## TO THE DEFINITION OF THE CONCEPT "PROFESSIONAL COMPETENCES» IN PEDAGOGICAL LITERATURE

**Xülasə.** Məqalədə peşə kompetensiyaların anlayışı və onun əks etdirən məsələlər təhlil edilir. Təhsil islahatlarının həyata keçirildiyi mərhələdən başlayaraq sonrakı dövrlərdə də qəbul edilmiş normativ hüquqi aktlarda peşə fəaliyyətini yerinə yetirərkən formalaşması zəruri olan tələblər araşdırılmış, müəllim fəaliyyəti üçün zəruri hesab edilən meyarlar təhlil edilmişdir. Elmi-pedaqoji ədəbiyyatda müəllimin peşə bacarıqları, pedaqoji ustalığı məsələlərini əks etdirən fikirlərə nəzər salınmış, Azərbaycan tədqiqatçıları ilə yanaşı xarici ölkə nümayəndələrinin peşə kompetensiyalarına aid olan fikirləri öyrənilmişdir. Belə müəyyən olunur ki, peşə kompetensiyasının formalaşması tsiklik prosesdir, çünki pedaqoji fəaliyyət prosesində yaranan yeni şərtlər və tələblərə görə peşəkarlığı daim təkmilləşdirmək zərurəti yaranır.

***Açar söz:*** *peşə kompetensiyası, pedaqoji fəaliyyət, peşə bacarıqları, təhsil mühiti, pedaqoji ustalıq, pedaqoji və psixoloji biliklər, fənn bilikləri*

**Резюме.** В статье анализируются понятие профессиональных компетенций и отражающие его вопросы. Начиная с этапа реализации образовательных реформ в нормативных правовых актах, принятых в более поздние периоды, рассматривались требования, которые необходимо формировать при осуществлении профессиональной деятельности. проанализированы критерии, считающиеся необходимыми для деятельности учителя. В научно-педагогической литературе рассмотрены представления, отражающие вопросы профессионального и педагогического мастерства учителя. Наряду с азербайджанскими исследователями изучены мнения представителей зарубежных стран, касающиеся профессиональных компетенций. Определено, что формирование профессиональной компетентности является циклическим процессом, поскольку возникает необходимость постоянного повышения профессионализма в связи с новыми условиями и требованиями, возникающими в процессе педагогической деятельности.

***Ключевые слова:*** *профессиональная компетентность, педагогическая деятельность, профессиональные умения, образовательная среда, педагогическое мастерство, педагогико-психологические знания, предметные знания*

**Summary.** The concept of professional competences and its reflecting issues are analyzed in the article. Starting from the stage when educational reforms were implemented, the requirements necessary to be formed while performing the professional activity were examined in the normative legal acts adopted in

later periods, and the criteria considered necessary for the teacher's activity were analyzed.In the scientific-pedagogical literature, the ideas reflecting the issues of teacher's professional skills and pedagogical mastery were reviewed, along with Azerbaijani researchers, the opinions of representatives of foreign countries related to professional competencies were studied. It is determined that the formation of professional competence is a cyclical process, because there is a need to constantly improve professionalism due to new conditions and requirements arising in the process of pedagogical activity.

***Key words****: professional competence, pedagogical activity, professional skills, educational environment, pedagogical mastery, pedagogical and psychological knowledge, subject knowledge*

Müasir sosial və iqtisadi şəraitdə – təhsilin müasirləşməsi, informasiya kommunikasiya texnologiyalarından istifadənin genişlənməsi, internet vasitəsilə məlumat bazalarına sürətli çıxış, sosial münasibətlərin xarakterinin dəyişməsi və s. cəmiyyətdə hər bir peşə sahibinin qarşısına, ən mühümü isə ali məktəblərin qarşısına böyük tələblər qoyur. Təhsilin inkişafında müşahidə edilən intensivlik, ali təhsilin dövlət standartının tətbiqi, təhsilin prosessual tərəfində baş verən köklü dəyişikliklərlə əlaqədar olaraq cəmiyyətdə pedaqoji kadrların keyfiyyət yönlü dəyişilməsi problemini, onun rolunu və fəaliyyəti ön plana çıxdı.

Tələbələrin, yəni bakalavr və magistrantların peşə kompetensiyalarına dair xarici elmi-pedaqoji ədəbiyyatın təhlili göstərir ki, peşə kompetensiyalarına dair müxtəlif yanaşmalar mövcuddur. Bu yanaşmaları təhlil edərkən aydın olur ki, qlobal təhsil mühitində baş verən dəyişikliklər, müşahidə edilən yeniliklər hüquqi-normativ bazanın yenilənməsini tələb edir. Bu məqsədlə respublikamızda bu sahədə tədbirlər planlı və sistemli şəkildə həyata keçir və ardıcıl olaraq yerinə yetirilir.

1999-cu ildə “Azərbaycan Respublikasının Təhsil sahəsində islahat Proqramı” (1) ulu öndər Heydər Əliyev tərəfindən müvafiq sərəncamla təsdiq edildi. İslahatın həyata keçirilməsində məqsəd təhsilin bütün pillələri və eləcə də, ali təhsildən sonrakı peşə və ona uyğun əlavə təhsil pillələrində toplanmış potensialı saxlamaq və inkişaf etdirmək, təhsil sistemini tənzimləyən müvafiq normativ hüquqi bazanı yaratmaq, cəmiyyətin Azərbaycan Respublikasının Konstitusiyasında, Təhsil Qanununda təsbit olunmuş tələbləri, siyasi, iqtisadi və sosial həyatın demokratikləşməsinə əsaslanan dövlət siyasətini həyata keçirməkdən ibarətdir.

Müasir ali təhsil müəssisəsinin hər bir tələbəsi şəxsiyyətin, cəmiyyətin və dövlətin cari və gələcək tələbatlarına cavab verən yüksək nəticə və keyfiyyətə diqqət yetirən bir şəxsdir. Ali məktəblərdə təhsilin müasirləşdirilməsi əmək bazarında tələb olunan yüksək ixtisaslı mütəxəssislərin hazırlanmasına yönəlib. Ən çox yaranan problemli məqamlar müasir təhsilin məzmunu ilə əmək bazarının tələbləri arasındakı uyğunsuzluqdur. Bu uyğunsuzluğun aradan qaldırılması məqsədilə 2000-ci il 13 iyun tarixində Azərbaycan Respublikası Prezidenti “Azərbaycan Respublikasında təhsil sisteminin təkmilləşdirilməsi haqqında Fərman” (2) imzalamışdır. Fərmana uyğun olaraq mülkiyyət formasından və tabeliyindən asılı olmayaraq, təhsilin keyfiyyətinə nəzarət səlahiyyəti Azərbaycan Respublikasının Təhsil Nazirliyinə verildikdən və ali və orta ixtisas təhsili müəssisələrinin attestasiya və akkreditasiyasını tənzimləyən müvafiq normativ hüquqi akt təsdiq edildikdən sonra qısa müddət ərzində təhsilin keyfiyyətinə nəzarət mexanizmi yaradılmışdır.

Avropada ali təhsil sisteminin yaradılması və Avropa ölkələrinin təhsil sistemlərinə inteqrasiya aktuallıq kəsb etdiyindən Bolonya prosesi ali təhsil sektorunu vahid mexanizm formasında idarəedilməsində önəmli yer tutur.

2005-ci ildə Azərbaycanın Bolonya prosesinə qoşulması ali təhsildə həyata keçiriləcək islahatları mütləqləşdirdi. Bolonya Bəyannaməsinin müddəalarını həyata keçirmək məqsədilə 2006-2010-cu illəri əhatə edən Tədbirlər Planı təsdiq olunmuşdur. Plana uyğun olaraq “Bakalavr hazırlığının məzmununa və səviyyəsinə qoyulan minimum dövlət tələblərinin strukturu” təsdiq edilmiş, 2010-cu ildə “Ali təhsil pilləsinin dövlət standartı və proqramı”nın təsdiq edilməsi haqqında, “Magistratura təhsilinin məzmunu, təşkili və “magistr” dərəcələrinin verilməsi Qaydaları”nın təsdiq edilməsi haqqında Azərbaycan Respublikasının Nazirlər Kabinetinin Qərarı təsdiq edilmişdir.

Sosial praktik və iqtisadi sahədə mövcud vəziyyətin təhlili göstərdi ki, ali təhsilin məz-

munu ilə tələb olunan biliklər arasındakı uyğunsuzluq dünyadakı qlobal böhran səviyyəsi ilə əlaqəlidir. Ancaq kadr hazırlığının iqtisadiyyatın keçmiş mərhələsinə uyğun aparılması müşahidə olunurdu.

Təhsil sisteminin modernləşdirilməsi məqsədilə qəbul edilmiş rəsmi sənədlər təhsilin nəticəsinin qiymətləndirilməsi konsepsiyalarından yüksək səviyyədə hazırlıqlı, təhsilli, tərbiyəli anlayışları kompetensiya anlayışı ilə əvəz edildi.

2007-ci ildə "Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının Konsepsiya və Strategiyasının təsdiq edilməsi haqqında" (3) Azərbaycan Respublikası Nazirlər Kabinetinin təsdiq etdiyi qərarda "Müasir dövrdə müəllimin peşəkarlığına və fəaliyyətinə qoyulan tələblər" müəyyənləşdirilmişdir. Həmin bənddə müəllimin bacarığı aşağıdakı amillərlə təyin olunur:

-metodoloji (pedaqoji-psixoloji) bacarıqlar;

-ümumi mədəni səviyyəni əks etdirən bacarıqlar;

-fənnyönlü bacarıqlar (3).

Konsepsiyada qeyd olunur ki, "pedaqoji fəaliyyətin yaradıcı istiqamətlənməsi müəllimdən aşağıdakıları tələb edir:

-öz imkanlarını obyektiv qiymətləndirmək, öz sənəti üçün əhəmiyyətli olan zəif və güclü cəhətlərini müəyyən edə bilmək (özünüidarə, özünüqiymətləndirmə, emosionallıq, kommunikativ, didaktik qabiliyyətlər və s.);

-intellektual fəaliyyət (düşüncə, yaddaş, qavrama, təsvir, diqqət) davranış mədəniyyətinə, ünsiyyət mədəniyyətinə, o cümlədən pedaqoji mədəniyyətə malik olmaq;

-inteqrasiya proseslərinə, dünya təhsil məkanının inkişaf tendensiyasına uyğunlaşa bilmək" (3)

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən 19 iyun 2009-cu ildə imzalanmış "Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu"nda müəllimin vəzifələri kimi aşağıdakılar göstərilmişdir: "Təhsil alanlarda mövqeyi formalaşdırmaq, onları vətənpərvərlik və azərbaycançılıq ruhunda tərbiyə etmək, müstəqil həyata və əmək fəaliyyətinə hazırlamaq... pedaqoji etika və əxlaq normalarına riayət etmək, müəllim nüfuzunu yüksək tutmaq, ziyalılıq nümunəsi göstərmək, ...ixtisas və elmi-pedaqoji səviyyəsini yüksəltmək, elmi araşdırmalar aparmaq, əlavə məşğələlər, sinifdənkənar və məktəbdənkənar tədbirlər keçirmək istiqamətində gənc müəllimlərin formalaşdırılmasına diqqət yetirmək lazımdır" (4).

Təhsilin təkmilləşdirilməsi, yeniləşdirilməsi və modernləşdirilməsi dövlətin daim diqqətində olmuş, bu məqsədlə bir çox sərəncamlar, fərmanlar və qərarlar qəbul edilmişdir.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli sərəncamı ilə "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" (5) təsdiq edilmişdir. Bu strategiya Azərbaycan Respublikasında təhsilin inkişafında, pedaqoji elmin inkişafında yeni bir mərhələnin açılmasını şərtləndirdi. Strategiyanın məqsədi ölkədə şəriştəli müəllim kadrları hazırlığı üçün, ən yeni texnologiyalara əsaslanan, müasir infrastruktura malik, yüksək keyfiyyət nəticələrinə görə dünya ölkələri sırasında qabaqcıl mövqe tutan Avropa standartlarına uyğun, mükəmməl təhsil sistemi yaratmaqdır. Bu məqsəddən irəli gələrək səriştəli müəllim kadrlarının hazırlanması, müəllimlərin peşə hazırlıqlarının müasir tələblər səviyyəsində təkmilləşdirilməsi, onların innovativ metodlarla tədris prosesini qurması, təhsilin məzmununun cəmiyyətin tələblərinə, iqtisadi inkişafın tələblərinə uyğun şəkildə qurulması, müəllimin idarəedicilik funksiyasını artırması, ilboyu təhsillə, özünütəhsil və özünütəkmilləşdirmə ilə məşğul olması, təhsil müəssisələrinin maliyyələşdirmə mexanizminin təkmilləşdirilməsi məsələləri xüsusi vurğulanmışdır.

Səriştəli müəllim anlayışına yuxarıda qeyd edilən strategiyada cavab verilmişdir: "Son 30-40 il ərzindəki elmi texnoloji tərəqqi, innovasiyalar və modernləşmə nəticəsində praktiki bilik və vərdişlər zənginləşməyən, sırf nəzəri xarakter daşıyan təhsil öz fundamental əhəmiyyətini itirməkdədir. Bu baxımdan təhsilin məzmununun formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyi önə çəkilir. Səriştə əldə olunmuş bilik və bacarıqları praktiki fəaliyyətdə effektiv və səmərəli tətbiq etmək qabiliyyətidir. O, şəxsin qazandığı bilik və bacarıqların konkret fəaliyyətin nəticəsinə çevrilməsini təmin edir. Səriştəyə əsaslanan təhsil sosial-iqtisadi inkişafa daha effektli xidmət göstərir" (5).

Ulu öndər Heydər Əliyev hələ 1980-ci illərdə ali məktəb işçilərinin respublika müşavirəsindəki çıxışında yeni bir pedaqoji anlayış kimi səriştəli müəllim problemini irəli sürür və yeni müəllim kadrlarının yetişdirilməsini bir vəzifə olaraq təhsil nümayəndələrinin qarşısına qoyurdu. Müəllimin peşəkarlıq səviyyəsinə, səriştəliliyinə yüksək qiymət verərək, səriştəli müəllim obrazının səciyyəsini ulu öndər belə təsvir etmişdir: " ...hər bir ali məktəb müəllimi gərək öz sahəsində səriştəli olsun, geniş ümumi məlumata, pedaqoji qabiliyyət və yaxşı vərdişlərə, mühazirə oxumaq, dərs demək, öyrətmək, tərbiyə etmək üçün bütün başqa zəruri keyfiyyətlərə malik olsun. Bunun üçün gərək ali məktəb müəllimi elmi biliklərdən əlavə, yaxşı nitq, dil qabiliyyətinə, natiqlik məharətinə, bütün başqa pedaqoji keyfiyyətlərə və vərdişlərə yiyələnsin ki, bütün bunlar üst-üstə ona həqiqətən yaxşı tərbiyəçi olmaq imkanı versin" (6, s. 91).

Tədqiqatçılar tərəfindən araşdırılan "Azərbaycan dövlət sənədlərində səriştəli müəllim hazırlığı məsələləri" adlı məqalədə isə bildirilir ki, müəllimin akademik bilikləri ilə yanaşı praktik bilikləri dedikdə müəllimin əməli olaraq bütöv pedaqoji fəaliyyəti nəzərdə tutulur. Müəllimin səriştəliliyi anlayışını da yenilik kimi qəbul edərək deyə bilərik ki, bu anlayış beynəlxalq aləmdə "kompetensiya" kimi işlənir ki, bunun da qarşılığı "uyğunlaşma", "peşəkarlıq", "məqbul sayılma" kimi ifadə edilir. Pedaqoji ədəbiyyatımızda bu "pedaqoji mərifət", "pedaqoji ustalıq" kimi də işlənmişdir (8, s. 82).

Prof. N. Kazımov "Pedaqoji ustalığın problemləri" adlı dərs vəsaitində 2004-cü ildə Rusiyada L.P. Krivşenkonun redaktorluğu ilə çap olunmuş "Pedaqogika" adlı kitabda pedaqoqun (müəllimin yox) ustalığı barədə yığcam məlumatı qeyd edir. Kitabda pedaqoq ustalığının mahiyyəti belə açıqlanır: "Pedaqoq ustalığı – biliklərin, peşə bacarıqlarının, şəxsi keyfiyyətlərin və təcrübənin qovuşması deməkdir" (7, s. 5).

Pedaqoji universitetlərdə təlimin təşkili prosesinə gələcək kadrların formalaşmasında kompetensiya əsaslı yanaşmanın daxil edilməsi müasir tələblərdən biridir. Kompetensiyaya əsaslanan yanaşmanın meydana çıxması təhsil sisteminin inkişafında müasir qanunauyğunluqdur, onun yaranması cəmiyyətin davamlı inkişaf edən ehtiyaclarına yaxınlaşmaq yollarının axtarışı ilə əlaqədardır. Bu yanaşma təhsil sistemində öyrənilən biliklərlə yanaşı, ən mühüm praktiki problemləri həll etmək və bütövlükdə şəxsiyyəti tərbiyə etmək bacarığının formalaşmasının əsası kimi böyük əhəmiyyət verilən kompetensiyalar konsepsiyasına əsaslanır. Kompetensiyaya əsaslanan yanaşma əsasında müəllimin peşə hazırlığının təşkilində peşə kompetensiyaları onun pedaqoji fəaliyyəti həyata keçirməyə nəzəri və praktiki hazırlığının ən mühüm xarakteristikası kimi qəbul edilir və müəyyən komponentlərin məcmusunu təşkil edir. Ali təhsil müəssisələrinin məzunlarının biliyinin qiymətləndirilməsi isə onların zəruri kompetensiyaları mənimsəməsinin qiymətləndirilməsi kimi təzahür edir.

Ali təhsildə kompetensiya əsaslı yanaşmanın tətbiqinin konseptual xüsusiyyətlərinin müzakirəsi bəzən suallar yaradır: "Kompetensiyaya əsaslanan yanaşmanın tətbiqinə hansı amillər səbəb oldu?" – suallına cavab olaraq daha çox bu fikir söylənilir: "Tətbiq edilən kompetensiya əsaslı yanaşmanın analitik nəzərdən keçirilməsinə və tətbiqinə ehtiyac ümumavropa və qlobal inteqrasiya prosesləri, dünya iqtisadiyyatının qloballaşması və xüsusən də təhsil sistemində davamlı olaraq artan transformasiya prosesləri". Ali təhsil sisteminə kompetensiya əsaslı yanaşmanın daxil edilməsi zərurəti təhsil sistemində gedən davamlı dəyişikliklə müəyyən edilir.

Kompetensiya anlayışı yeni iqtisadiyyatın və insan resurslarına yeni yanaşmanın nəticəsidir ki, bu da insanı tez-tez dəyişən şərtlərə uyğunlaşdırmaq zərurətindən yaranır. Kompetensiyalı şəxs müəyyən bir ixtisas üzrə işləmək üçün zəruri olan bilik, bacarıq və vərdişlərə malik olur, peşəkar problemlərin təhlilində müstəqillik və çeviklik nümayiş etdirməyi, eyni zamanda, peşəkar sahədə əməkdaşlığı davam etdirməyi bacarır. Kompetensiya, ilk növbədə, insanın öz düşüncə mədəniyyətinin, analitik əks etdirmə, qərar qəbul edən zaman müstəqillik və məsuliyyətin inkişafına dəstək, standartlarda icra meyarları vasitəsilə tələb olunan biliklərə əsaslanır. Belə aydın olur ki, kompetensiya bilik və bacarıqlarımız sayəsində müəyyən fəaliyyət növünə uyğunluqdan və tapşırıqları yerinə yetirmək qabiliyyətindən başqa bir şey deyil.

"Kompetensiya" termininin yaradıcısı olan Noam Comskinin fikrincə, kompetensiya insanın əldə etməli olduğu idealdır, ona diqqət

yetirməlisən. Bu öyrənmək, səy göstərmək, yəni məqsəd deməkdir. "Kompetensiya" öyrənmənin son nəticəsini, nəyi öyrənməli olduqlarını, məktəbin və universitetin verdiyi təhsilin sonunda nəyi bilməli və bacarmalı olduqlarını təsvir etmək üçün istifadə olunan ifadədir. "Kompetensiya" anlayışı əslində bilik, bacarıq və həyat təcrübəsinə sahib olmaqla "nəyi, nə qədər və necə bilirəm" mənasını verir.

Kompetensiya sözünün fərqli dillərdə mənasına diqqət yetirək. Latın dilindən "*competere"*, fransız dilində "*competence*", alman dilində "*kompetenz*", ispan dilində "c*ompetencia*", italyan dilində "*competenza*" kimi səslənərək kompetensiya, - yəni səriştə olaraq tərcümə olunur.

Peşə kompetensiyaları nədir və bu kompetensiyaları necə idarə etmək olar?

Hər bir mütəxəssis üçün işində ona kömək edən bir sıra bacarıqlar vacibdir. Bu bacarıqlar peşə kompetensiyaları kimi təsnif edilir. Bacarıq sözünün tərifi ilə hər dəfə iş prosesində əsas funksiyaları yerinə yetirərkən rast gəlinir.

Peşə kompetensiyaları peşə vəzifələrini və ya müəyyən bir peşə vəzifəsini yerinə yetirmək bacarığıdır. Peşə kompetensiyası iş vəzifələrini yerinə yetirməyə kömək edən bütün bilik və təcrübəyə malik olmağı göstərir. Müasir gündə fəaliyyət prosesində niyə peşə kompetensiyalarına ehtiyac yaranır? Çünki fəaliyyət öhdəliklərini yerinə yetirmək üçün səlahiyyətlərə sahib olmağın vacibliyi önə çıxır. Sahib olunan kompetensiyalar toplusuna əsasən, fəaliyyət istiqamətində iş prosesinin inkişafında kompetensiyaların rolu qiymətləndirilir.

Müasir orta məktəbin və ali təhsil müəssisələrinin tələbləri ali peşə pedaqoji təhsilinin vəzifələrinin yenidən nəzərdən keçirilməsi əhəmiyyətli dərəcədə tələb edir. Yüksək elmi-metodiki potensiala malik yeni tip pedaqoji kadrların formalaşdırılması vəzifəsi ən mühüm vəzifələrdən biri kimi qarşıya çıxır. Onun peşəkar hazırlığının psixoloji, pedaqoji və fənn-metodiki biliklərin toplanması ilə əlaqələndirmək artıq kifayət etmir. Müasir təhsil müəssisələri yalnız metodiki bilikləri yaxşı bilən və onlardan necə istifadə etməyi bilən bir mütəxəssis deyil, onun fəaliyyətinin baş verdiyi sürətlə dəyişən şərtlərə səriştəli cavab verə bilən, məktəblilərin təhsili və tərbiyəsi ilə bağlı çoxsaylı praktiki problemləri həll etmək, eləcə də mövcud təhsil vəziyyətini adekvat qiymətləndirə bilən bir mütəxəssis tələb edir. Ənənəvi hazırlıq, ilk növbədə, psixoloji, pedaqoji və fənn-metodiki bilik və bacarıqların toplanması ilə bağlı idi. Ali pedaqoji təhsil müəssisəsinin təhsil məkanına tədqiqat metodlarının fəal şəkildə daxil edilməsinə, tədris fənlərinin metodik tərkib hissəsinin gücləndirilməsinə, tələbələrin elmi işə cəlb edilməsinə, onların ümumilikdə peşə fəaliyyətini həyata keçirməyə hazır olmasına baxmayaraq, son dövrlərdə aparılan psixoloji-pedaqoji tədqiqatlar ehtiyacları ödəmir.

Müasir dövrdə konkret olaraq "kompetensiya" və "peşə kompetensiyaları"na həsr olunmuş elmi-tədqiqat əsərlərinə az rast gəlinsə də, müəllim və ya pedaqoqun pedaqoji ustalığına, peşə bacarıqlarının formalaşmasına həsr edilmiş dəyərli tədqiqatlar, monoqrafiya və çoxsaylı elmi məqalələr mövcuddur.

Müəllimin peşə kompetensiyalarının müəyyən edilməsi problemi pedaqoq və psixoloqlar tərəfindən öyrənilmişdir və müəllimin peşə kompetensiyası bilik, bacarıq və fəaliyyət metodlarına əsaslanır. Müəllimin fəaliyyətinin müasir qiymətləndirilməsində V.A. Adolf funksional və ya peşə kompetensiyası adlandırılan subyektiv, psixoloji-pedaqoji və metodoloji kompetensiyaları fərqləndirir. Eyni zamanda, müəllimin kompetensiyası hüquqi sənədlər, tutduğu vəzifə və ixtisası ilə müəyyən edilir (10, s. 50).

Müəllimin peşə kompetensiyası təkcə ixtisas göstəricilərini – bilik, bacarıq, təcrübəni əhatə etmir, həm də onun metodiki, xüsusi və psixoloji-pedaqoji hazırlığının vəhdəti, müəyyən səlahiyyətlərin formalaşması ilə müəyyən edilir. Çünki onun üçün şəxsi əhəmiyyətli məqsədlərə nail olmağa imkan verir (11, s.18 )

Bacarıqlı mütəxəssis öz mövzusunun, peşəsinin əhatə dairəsindən kənara çıxa bilir, özünü inkişaf etdirmək üçün müəyyən yaradıcı potensiala malikdir. Peşəkar inkişaf edən bir mütəxəssis öz peşəsində yeni bir üsul, texnika yarada bilər.

A.K. Markova qeyd edir ki, müəllimin kompetensiyaya yiyələnməsi pedaqoji məqsəd və vəzifələri (öyrədici, təlimləndirici, tərbiyələndirici) təyin etməkdən, pedaqoji vəziyyətin tələblərindən asılı olaraq onları həll və təhlil etməkdən ibarətdir. Müəllim üçün pedaqoji vəziy-

yəti yalnız qaçılmaz bir reallıq kimi qəbul etmək deyil, həm də onu təşkil edə bilmək vacibdir ki, bu da müəllimin pedaqoji kamilliyinin göstəricisidir.

Eyni zamanda, digər tədqiqatların (O.A. Abdullina, A.K. Markova, V.A. Salastenin, A.İ. Şerbakov) fikrincə, müəllimin öz işini təhlil etmək istəyi, işinin mənfi və müsbət tərəflərini təyin etməsi, eləcə də təhsilalanların və özünün diaqnostikası gələcək pedaqoji fəaliyyətinin layihələndirilməsinə, onun təkmilləşməsinə kömək edir. Bu isə eyni zamanda, onun peşəkar kompetensiyalarının formalaşmasına da kömək edir (9, 110-111; 149-152; 189-190).

Peşə kompetensiyası əməyi səmərəliliyini müəyyən edən bilik və bacarıqların, şəxsi və peşəkar keyfiyyətlərin məcmusudur.

Peşə kompetensiyaları anlayışı ilə yanaşı peşə kompetensiyalarının inkişafı da mühüm məsələlərdəndir. Peşə kompetensiyalarının inkişafı davamlı inkişaf və özünü təkmilləşdirməyi nəzərdə tutan peşəkar təcrübənin toplanmasına səbəb olan müasirləşmənin dinamik bir prosesdir. Peşə kompetensiyalarının formalaşmasının mərhələlərini aşağıdakı kimi ayırmaq olar:

1. ehtiyacın dərk edilməsi;
2. özünüinkişaf üçün planlaşdırma (məqsədlər, vəzifələr, həlli yolu);
3. özünü təzahür, özünü islah, özünü təhlil.

Peşə kompetensiyasının formalaşması tsiklik prosesdir, çünki pedaqoji fəaliyyət prosesində sadalanan mərhələlər hər dəfə təkrarlanır və yaranan yeni şərtlər və tələblərə görə peşəkarlığı daim təkmilləşdirmək zərurəti yaranır.

Peşə kompetensiyası müəllimin nəzəri biliklər sistemi və onların konkret pedaqoji situasiyalarda özünə və fəaliyyətinə, əlaqəli sahələrə münasibət formaları, müəllimin dəyər yönümləri, habelə onun mədəniyyətinin inteqrativ göstəricilərini (nitqi, ünsiyyət tərzi) əhatə edən, çoxfaktorlu bir hadisədir.

Peşə kompetensiyası uğurlu pedaqoji fəaliyyət üçün zəruri olan peşə və şəxsi keyfiyyətlərin məcmusu kimi başa düşülür. Peşəkar kompetensiyalı müəllimi kifayət qədər yüksək səviyyədə pedaqoji fəaliyyəti, pedaqoji ünsiyyəti həyata keçirən, təhsil və inkişafda ardıcıl yüksək nəticələr əldə edən müəllim adlandırmaq olar.

Ümumiyyətlə, peşə kompetensiyası qərarların qəbulu ilə əlaqəli müəyyən bir fəaliyyət növünü həyata keçirmək üçün kifayət qədər bilik, bacarıq və təcrübə səviyyəsini əks etdirən işgüzar və şəxsi keyfiyyətlərin ayrılmaz xüsusiyyəti kimi başa düşülür. Peşə kompetensiyalarının formalaşmasının bünövrəsi ali məktəblərdə qoyulur, peşə fəaliyyətin dövründə mütəmadi təkmilləşmə prosesinin aparılmasını tələb edir. Bu isə kadrlardan daim özünütəhsil işini həyata keçirmək və təhsil sahəsində qəbul edilmiş hüquqi-normativ bazanın öyrənilməsini zəruri şərtə çevirir.

**Problemin aktuallığı.** Ali məktəblərin müxtəlif ixtisasları üçün tərtib olunmuş təhsil Proqramlarında məzunların yiyələnməsi nəzərdə tutulan ümummədəni və peşə kompetensiyaları müəyyən edilmişdir. Məhz bu göstəricini əsas tutaraq kompetensiya və peşə kompetensiyaları anlayışlarına dair pedaqoji ədəbiyyatlarda yer alan Azərbaycan tədqiqatçıları və xarici nümayəndələrin fikirlərinə istinad edərək təhlillər aparmağı aktual hesab etdik.

**Problemin elmi yeniliyi** onunla müəyyən olunur ki, kompetensiya və peşə kompetensiyası anlayışının təhlilinə təşəbbüs edilmiş, kompetensiya əsaslı yanaşmanın tətbiqinin mahiyyəti açıqlanmışdır.

**Problemin praktik əhəmiyyəti.** Problemim məzmunu, orada yer alan fikirlər, əsas elmi ideyalar və tədqiqatın nəticələri pedaqoji ali məktəblərin bakalavriat, magistratura pilləsində təhsil alan tələbələr, doktorantlar və orta məktəb müəllimləri üçün xüsusi əhəmiyyət kəsb edir.

**Ədəbiyyat:**

1. Azərbaycan Respublikasının Təhsil sahəsində islahat Proqramı / https://eqanun.az/ framework/5363
2. Azərbaycan Respublikasında təhsil sisteminin təkmilləşdirilməsi haqqında Fərman / https://e-qanun.az/framework/767
3. Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının Konsepsiya və Strategiyasının təsdiq edilməsi haqqında / https://eqanun.az/ framework/13540
4. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu / https://eqanun.az/ framework/18343
5. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası / https://president.az/az/articles/view/9779
6. Hüseynzadə, R. Pedaqogika. Dərslik. / R. Hüseynzadə, Z. Əzizova, S. Əliyev, Ü. Verdiyeva -Bakı: Mütərcim, -2021. -488 s.

7. Kazımov, N. Pedaqoji ustalığın problemləri. Ali məktəblər üçün vəsait / N. Kazımov. -Bakı: Çaşıoğlu, -2009. -296 s.
8. Mahmudov M.C., Hüseynzadə R.L., İlyasov M.İ., Kərimov V.Y., Məmmədova B.S. və b. Müəllim hazırlığının aktual problemləri və modernləşdirilməsi. -Bakı: Mütərcim, -2015. - s.216.
9. Абдуллина, О.А. Общепедагогическая подготовка учителя в системе высшего педагогического образования: Для пед.спец.высш.учеб. заведений. - М.: Просвещение, -1990. - 141с.
10. Адольф, В.А. Профессиональная компетентность современного учителя: Монография / В.А. Адольф - Красноярск, 1998. - 310 с.
11. Адольф, В.А. Подготовка педагога к инновационной деятельности в процессе профессионального становления / В.А. Адольф, Н.Ф. Ильина //Альма Матер. - М., 2006. - № 10. - с. 18-20.

**E-mail**: lale.allahverdiyeva.81@bk.ru
**Rəyçilər**: *ped.elm.dok., prof.* **İ.İ. Əliyev**,
*ped.ü.fəls.dok., dos.* **V.P. Bəşirov**
**Redaksiyaya daxil olub**: 24.02.2023

*UOT 37.0*

***Nəzakət İbrahim qızı Zamanova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi*
Orcid: 000 0002 4033 8298

# ELM VƏ TƏHSİLDƏ KİBER TƏHLÜKƏSİZLİK

***Назакат Ибрагим гызы Заманова***
*преподаватель Азербайджанского Государственного Педагогического Университета*

# КИБЕРБЕЗОПАСНОСТЬ В НАУКЕ И ОБРАЗОВАНИИ

***Nazakat Ibrahim Zamanova***
*teacher at Azerbaijan State Pedagogical University*

# CYBER SECURİTY İN SCİENCE AND EDUCATİON

**Xülasə.** III minillikdə rəqəmsal dünyada sürətli dəyişikliklər insanların arzusundan asılı olmayaraq informasiya cəmiyyətində innovativ yeniliklərin təzahür xüsusiyyəti kimi baş verildiyindən bəhs edilir. Dövlətin, cəmiyyətin gücünü əks edən elmin və təhsillə bağlı taleyüklü məsələlərin həllinin vacibliyi diqqətə çatdırılır. Kiber təhlükəsizliyin təminatının bütün sahələrdə və xüsusilə elm və təhsil müəssisələrində təminatın vacib olduğu bildirilərək elə onun qorunmasının da modern təhsillə qoruna biləcəyi vurğulanır.
***Açar sözlər:*** *təhsil, informasiya, inteqrasiya, rəqəmsal, kiber təhlükəsizlik*

**Резюме**. Повествуется, что стремительные изменения в цифровом мире в 3-м тысячелетии происходят как проявление новейших инноваций в информационном обществе, независимо от желаний людей. Обращается внимание на то, что решение судьбоносных вопросов держится на науке и образовании, которые отражают мощь общества и государства. Констатируется важность обеспечения кибербезопасности во всех сферах, особенно в науке и образовательных учреждениях, а также подчеркивается, что его защита может быть обеспечена современным образованием.
***Ключевые слова***: *образование, информация, интеграция, цифровая, кибербезопасность*

**Summary.** It is said that rapid changes in the digital world in the 3rd millennium are occurring as a manifestation of innovative innovations in the information society, regardless of people's wishes. It is pointed out that the solution of fate-laden issues rests on science and education, which reflect the power of society and the state. It is stated that it is important to ensure cyber security in all fields, especially in science and educational institutions, and it is emphasized that its protection can be protected with modern education.
***Key words***: *education, information, integration, digital, electronic science, cyber security*

Keçən əsrin sonlarından başlayan milli iqtisadiyyatın dünya iqtisadiyyatına inteqrasiyası, milli təhsilin beynəlxalq təhsil formasına çevrilməsi XXI əsrdə daha da sürətləndi. III minillikdə rəqəmsal dünyada sürətli dəyişikliklər insanların arzusundan asılı olmayaraq informasiya cəmiyyətində innovativ yeniliklərin təzahür xüsusiyyəti kimi baş verirdi. Bu dövrdə dinamik, statik və situativ sahə olan təhsilin informasiya resurslarından müsbət yönümdə yararlanmaq, eyni zamanda onun təhlükəsizliyini təmin etmək, kiber hücumlardan qorunmaq, təhsillə yanaşı bütövlükdə dövlətin, cəmiyyətin qarşısında duran ən mühüm vəzifələrdəndir. Milli təhlükəsizliiyn təminatında milli müdafiənin təşkil edilməsinin bütün atributlar ilə yanaşı, ilk növbədə, informasiyanın təhlükəsizliyidir. İnformasiya təhlükəsizliyi, III minillikdə informasiyalaşmış cəmiyyətdə onun qorunması və idarəeilməsi dövlətin prioritetidir.

Rəqəmsal dünyanın tələbləri baxımından dəyişən tendensiyalara adaptasiyanı elm və təsillə təmin etmək mümkündür. XXI əsrin tələbinə uyğun olaraq informasiya təhlükəsizliyinin komp-

leks təminatı əsasən elm və güclü təhsil müəssisələrinin birgə köməyi sayəsində mümkündür.

Eyni zamanda dünyanın rəqəmsallaşması ölkələr arasında informasiya mübadiləsi, dövlətlərin və xalqların zaman və məkan məhdudiyyətindən asılı olmayaraq yaxınlaşmasına, sanki bir mərkəzdən idarə olunmasına gətirib çıxardı. Belə qarışıq xaotik durumda ölkənin informasiya təhlükəsizliyini kiber hücumlardan qorumaq üçün güclü kadrların yetişdirilməsindən və bir sıra təxirəsalınmaz tədbirlərin görülməsini zəruri edir [4].

➢ Mövcud olan təhsil sistemi və təhsil müəssisələri rəqəmsal dünyada baş verən sürətli dəyişiklikləri vaxtında qarşılaya bilirmi?

➢ Təhsil sistemində, dünyada baş verən tendensiyalara adekvat hansı mütəşəkkil və ardıcıl tədbirlər görülə bilir?

➢ Yetərincə bu sahədə ixtisaslaşmış kadrlar yetişdirə bilirikmi?

➢ Müstəqillikdən bu günə təhsildə yenilik adına islahatlar araparılmış və proqramlar qəbul edilmişdir. Nə qədər uğur, nailiyyət əldə edilib?

İnformasiya cəmiyyətində təhsil müəssisələrinin innovativ idarəedilməsi, təlim-tədris prosesində müasir texnologiyaların tətbiqi, eyni zamanda, müasir tədris texnologiyalarının inkişaf etdirilməsi, təhsil sisteminin müasir standartlara və innovativ proqramlara yönəldilməsi dövrün tələbidir. Təhsilin idarəedilməsinin rəqəmsal dünyada yenilikləri qarşılamaq üçün geniş mənada kompleks işlərin görülməsi bu günün təxirəsalınmaz vəzifələrindəndir. Təhsil müəssisəsinin mövcud vəziyyətində dünya təcrübəsi göz önünə alınaraq təhlilini yekunlaşdırsaq, ilk öncə hər ölkənin iqtisadi, siyasi, gücünün, əsasını güclü təhsil ocaqlarının mövcud olması ilə əlaqədar olduğunu görmək o qədər də çətin deyil.[3] Milli təhlükəsizliyinin təminatını təmin etmək üçün onun alt strukturu olan yüksək səviyyəli orta və ali məktəblərlə əlaqədar olduğunu deyə bilərik. Dövrün dəyişkənliyini vaxtından əvvəl proqnozlaşdıraraq daima islahatların keçirilməsi, təhsil müəssisələrinə verilən müstəqil idarəetmə innovativ infrastrukturla təchizi, ən başlıcası siyasi-ideoloji baxımda azad mühitin yaradılması prinsiplərindən çıxış edərək idarəetmənin modern təşkilindən asılı olduğu qənaətinə gəlmək olar. Təhsil müəssisəsinin inkişafının təmini onun rəqabətli mühitinin olduğunu dünyada mövcud olan reytinq qiymətləndirilməsinə görə təhsil müəssisələrində görmək mümkündür [6].

İnformasiya təhlükəsizliyi təhsil sistemində və ümumilikdə milli təhlükəsizlik sisteminin də qarşısında duran prioritet məsələdir. İnformasiyanın təhlükəsizliyi təminatı üçün çoxistiqamətli, maariflənmə cəmiyyətin hər yaş kateqoriyasında olan hətta məktəbəqədər müəssisədən başlamış ən üst yaşda olan insanlarda fasiləsiz təbliğat aparılmalıdır. İnformasiyanın təhlükəsizliyi onun normal fəaliyyətini pozmağa yönəlmiş məqsədyönlü təsirlər şəraitində ondan mühafizə fəaliyyətinin təmin olunmasıdır. İnformasiya bazasından istifadə zamanı həm daxili, həm də xarici təhdidlər ola bilir. Bunun qarşısını almaq üçün kompleks tədbirlərin görülməsi vacibdir. Elektron-elmin effektiv mühafizəsi üçün dövlət daima kompleks məsələlərin həllini nəzərə almalıdır:[1]

• e-elmin layihələndirilməsinin təhlükəsizlik məsələləri;

• e-elmin təhlükəsizliyinə nəzarət və mühafizəsi məsələləri;

• e-elmin təhlükəsizliyinin idarəolunması məsələləri [2].

Ümumiyyətlə, informasiyanın qorunması, informasiyanın etibarlılığının təmin edilməsinə doğru yönələn kompleks tədbirlər planı nəzərdə tutulur. Kibertəhlükəsizlik informasiya təhlükəsizliyinin bir qolu olub, informasiyanın elektron versiyasının qorunmasının təmin olunmasını öyrənir.

Kiber təhlükəsizlik resursların bütövlüyü, əlçatanlığı və etibarlılığının təmin edilməsidir. İnformasiyanin:

✓ etibarlılığının qorunmasını;

✓ bütövlülüyünün qorunmasını;

✓ əlyetənliliyinin təmin edilməsi və s. təşkil edir.



[7.]

Təhsilalma yollarından olan Distant təhsilin əsas formaları olan Sinxron (onlayn) və Asinxron (oflayn) digər təhsil formalarını qabaqlayır. Cəld, sürətli, paralel(işləyə və oxuya bilmək), zaman, məkandan asılı olmayaraq və ən önəmlisi əlçatan (nisbətən ucuz) və sağlamlıq məhdudiyyətindən asılı olmayaraq, distant təhsilalma arealı genişlənir və tələbə sayı durmadan artır. Bir sözlə, virtual təhsil və texnologiyasız təhsil mümkünsüzdür. Ona görə də virutal kriminallardan qorunmalıdır. Sırf təhsil müəssisələrinə müxtəlif məqsədlərlə hücum ola bilər.

Təhsil müəssisələri həm müəssisə arealında, həm də kənardan kiber hücumlara məruz qala bilər.

❖ Data bazalardan məlumatların vaxtsız götürülməsi.

❖ Elmi jurnallarda nəşr öncəsi məlumatlar oğurlana bilər, şantaj məqsədi ilə istifadə edilə bilər.

❖ Tələbələrin məlumatları qorunmalıdır. İnformasiyaların oğurlanması, şəxsi videolar ələ keçə bilər.

❖ Casusluq, elmi araşdırmaların ələ keçməsi.

❖ İşin istifadəçi linki açmağa cəhd edilə bilər.

❖ Zərərli proqramlarla istifadəçiyə zərər verilə bilər.

❖ Tapşırıqların cavabları ötürülə bilər və s.

Əqli mülkiyyətin qorunması, sosial şəbəkələrdə məlumatların, bank, ad, soyadın ehtiyatla istifadəsi kiber hücumlardan qorunmağın yolu, əvvəlcədən onun haqqında məlumatlı olmaq, ardıcıl maariflənmək zəruridir.

Göründüyü kimi, rəqəmsallığın geniş imkanları ilə yanaşı, təhdidlərin olması da qaçılmazdır.

İnformasiya ilə idarəetmənin təzahür xüsusiyyətlərindən biri də e-vətən-daş, sosial şəbəkələr vasitəsilə ictimai rəy formalaşır ki, bu da ictimai idarəetməyə təkan vermiş olur. İnformasiyanın doğru-dürüst istifadəsi və onun təminatı güclü təhsil sistemindən asılıdır, modern təhsil rəqəmsal dünyanın qarışıq dövründən informasiyanın milli mənafe istiqamətində qorumaq elmdən və təhsildən keçir.

**Problemin aktuallığı**. Rəqəmsallıq geniş imkan, fürsət, çağırışları ilə yanaşı təhdid və məsuliyyət doğurur. İnformasiya təhlükəsizliyi dövlətin, cəmiyyətin qarşısında duran ən mühüm vəzifələrindən biridir. Virutal məkanda və xüsusilə elm və təhsil müəssisələrinin kiber təhlükəsizliyinin təminatı dövlətin prioritetidir.

**Problemin elmi yeniliyi.** İlk dəfə olaraq təhsil müəssisələrində kiber hücumların nəticəsində hansı sahələrin zərər görəcəyi diqqətə çatdırılmışdır.

**Problemin praktik əhəmiyyəti**. İnformasiya cəmiyyətinin tələbatlarını qarşılamaq, informasiyanın təhlükəsizliyinin təşkili və xüsusilə elm və təhsil müəssisələrində kiber hücumlardan qorunmağın yolları diqqətə çatdırılmışdır.

**Ədəbiyyat:**


1. Əliquliyev R.M., Ələkbərov R.Q., Fətəliyev T.X. Elektron elm: cari vəziyyəti, problemləri və perspektivləri // İnformasiya texnologiyaları problemləri, -2015. № 2, -s. 4-15
2. Əliquliyev R.M., Mahmudov R.Ş. İnformasiya cəmiyyətinin formalaşmasının multidisiplinar elmi-nəzəri problemləri // İnformasiya cəmiyyəti problemləri, -2016. № 2, -s. 3-17
3. Zamanova, N.İ. Covid-19 Pandemiya dövründə təhsil // 5.sosial elmlər beynəlmiləl Paris konfransı, -Paris: 05-08 fevral, 2021. -s.752-756
4. Заманова Н.И. Пути развития образования в цифром мире. Причорноморський науко-дослидний институт економики та Іноваций Іновацийна педагоггика, науковуй журнал вируск 34, том1, 2021, с.752-756
5. https://ec2018.ada.edu.az › files › Afet Suleyman
6. https://tehsil.biz/news/az/2830/Sinqapurhttps:
7. //academy.kiberplatforma.az/meqaleler/informasiya-tehlukesizliyi/
8. BMT-nin və onun ixtisaslaşmış qurumlarının informasiya cəmiyyətinə dair sənədləri, http://www.publicadministration.un.org/wsis10


**E-mail**: znazakat@mail.ru

**Rəyçilər:** *ped.ü. fəls.dok.,dos.* **Ə.M. Abbasov**
*ped.ü. fəls.dok.,dos.* **O.K. Alxasov**
**Redaksiyaya daxil olub:** 27.02.2023

*UOT 37.0*

***Lalə Kamal qızı Rəhimova***
*fəlsəfə doktoru proqramı üzrə doktorant,*
*Gəncə Dövlət Universitetinin müəllimi*
*https://orcid.org/0000-0002-7731-9728*

## PEŞƏ SƏRİŞTƏSİ ANLAYIŞININ MAHİYYƏTİNƏ DAİR

***Лала Камал гызы Рагимова***
*докторант по программе доктора философии,*
*преподаватель Гянджинского Государственного Университета*

## О СУТИ ПОНЯТИЯ ПРОФЕССИОНАЛЬНОЙ КОМПЕТЕНЦИИ

***Lala Kamal Rahimova***
*doctoral student in the program of doctor of philosophy,*
*teacher of Ganja State University*

## ON THE ESSENCE OF THE CONCEPT OF PROFESSIONAL COMPETENCE

**Xülasə.** Məqalədə peşə səriştəsi anlayışına müxtəlif yanaşmalar şərh edilir, bu anlayışın mahiyyəti izah edilir. Səriştə əsaslı yanaşma problemi üzrə tədqiqatların təhlili əsasında bu anlayışın formalaşmasının üç mərhələsi qeyd edilir. Məqalədə daha sonra peşə səriştəsi anlayışının əsas komponentləri, strukturu və təsnifatı araşdırılır.
***Açar sözlər:*** *səriştə, peşə səriştəsi, bacarıq, vərdiş, səviyyə, qiymətləndirmə*

**Резюме.** В статье рассматриваются разные подходы к понятию профессиональной компетенции, излагается суть этого понятия. В результате анализа исследований в этой области выделяются 3 этапа формирования этого понятия. Далее в статье анализируется классификация, структура и основные компоненты понятия профессиональной компетенции.
***Ключевые слова****: компетенция, профессиональная компетенция, умения, навыки, уровень, оценивание*

**Summary.** The article discusses different approaches to the concept of professional competence, outlines the essence of this concept. As a result of the analysis of research in this area, 3 stages of the formation of this concept are distinguished. Further, the article analyzes the classification, structure and main components of the concept of professional competence.
***Key words:*** *competence, professional competence, abilities, skills, level, assessment*

Ölkəmizdə üçpilləli ali təhsil sisteminə (bakalavr, magistr, doktorantura) keçid yeni təhsil standartlarının yaradılmasını aktuallaşdırdı. Bu keçid respublika ali təhsil müəssisələrinin Bolonya prosesinə qoşulmasını sürətləndirdi. Universitetlərdə kadr hazırlığına verilən tələblər səriştə əsaslı yanaşmanı zəruri edir. Bu yanaşmanın məqsədi təkcə savadlı məzun yetişdirmək yox, həmçinin universitet məzununu məhsuldar fəaliyyətə qadir, öz fəaliyyətinin nəticələrinə cavabdeh, özünüinkişafa hazır, yüksək səriştəli şəxs kimi formalaşdırmaq, peşə fəaliyyətinə hazırlamaqdır. Təhsil fəaliyyətinin nəticəsi kimi "səriştə" anlayışı yeni məktəb kurikulumunda da mühüm yer tutur. "Səriştə" anlayışı müxtəlif tədqiqatlarda araşdırma obyekti olmuşdur.

Ümumən "Səriştəlilik" anlayışı latın sözü olan "*competentia*" sözündən götürülmüşdür və "mühakimə etməyə səlahiyyətli", "danışmağa hüququ olmaq" mənalarını verir. Elə hal-hazırda da bu ifadə bir çox hallarda səriştə deyil, beynəlxalq terminə çevrilən "*kompetensiya"* kimi işlədilir (1).

Təhsilə səriştə əsaslı yanaşma konsepsiyasını tədqiq edən İ.A. Zimnyaya təhsil sisteminin müxtəlif səviyyələrində əsas sosial səriştələrin formalaşmasını araşdırır (4). O.E. Lebedev "səriştə əsaslı yanaşmanı təhsil məqsədlərinin müəyyən edilməsi, təhsil məzmunun seçilməsi, təhsil prosesinin təşkili və nəticələrinin qiymətləndirilməsi üçün ümumi prinsiplərin məcmusu kimi" müəyyən edir.

Səriştə əsaslı yanaşma problemi üzrə tədqiqatların təhlili əsasında bu anlayışın formalaşmasının üç mərhələsini qeyd etmək olar (N.V. Kuzmina, A.K. Markova, J. Raven, R. Uayt, N. Çomski və başqaları).

Səriştə əsaslı yanaşmanın formalaşmasında *birinci mərhələ* 1960-1970-ci illərə təsadüf edir. Bu dövrdə "səriştə" anlayışı N. Çomski (1965) tərəfindən elmi aparata daxil edilmişdir. Səriştəyə əsaslanan yanaşmanın inkişafının *ikinci mərhələsi* 1970-1990-cı illərə təsadüf edir. Bu mərhələdə "sosial səriştələr/bacarıqlar" anlayışının məzmunu işlənib hazırlanır. J. Raven (John Raven) öz tədqiqatında səriştə və onun növlərinin şərhini verir, sonradan bunları səriştələr kimi təqdim etmişdir. Onun "Müasir cəmiyyətdə səriştə" əsərində səriştə "sosial əhəmiyyətli sahədə həyat uğuru" kimi şərh olunur. Müəllif öz əsərində səriştələrin 39 növünü nəzərdən keçirir, onları "motivasiyalı qabiliyyətlər" kimi müəyyən edir. Bu, bütün dünyada səriştələrin konsepsiya və növlərinin şərhi problemlərinin fəal tədqiqinə stimul yaratdı. J. Raven səriştə səviyyəsi ilə insan fəaliyyətinin nəticəsi arasında əlaqəni araşdırır. Müəllifin fikrincə, səriştə insan fəaliyyətinin müxtəlif komponentlərinin səmərəli həyata keçirilməsi və əhəmiyyətli nəticələr əldə etməsi üçün qabiliyyət kimi çıxış edir.

Səriştələrin əsas komponentləri bunlardır: hadisə və situasiyaları təhlil etmək, əvvəlki təcrübəyə əsaslanmaq, gələcək maneələri görmək, təşəbbüskar olmaq və rəhbərlik bacarığı. Buradan belə nəticə çıxır ki, səriştə müstəqil komponentlər məcmusundan ibarətdir, insanın bir növ subyektiv xüsusiyyətləridir. Bu xüsusiyyət insan fəaliyyətinin müxtəlif istiqamətlərində özünü göstərə bilər. C. Raven insanın müəyyən peşə fəaliyyətində ehtiyac duyduğu bir sıra keyfiyyət və bacarıqları önə çəkir: müstəqil işləmək bacarığı; məsuliyyət daşımaq; təşəbbüs etmək; problemləri görməyə və həll etməyə hazır olmaq; yeni situasiyaları təhlil etmək bacarığı; əməkdaşlıq bacarığı; müstəqil bilik əldə etmək; əsaslandırılmış qərarlar qəbul etmək bacarığı və s.

Səriştəyə əsaslanan yanaşmanın inkişafının *üçüncü mərhələsində* təhsil sahəsində səriştələrin elmi konsepsiyası tədqiq edilir. YUNESKO-nun sənədləri və materialları təhsil nəticəsi kimi səriştələrin siyahısını əhatə edir. 1990-cı ildə A.K. Markova peşə səriştəsini əmək psixologiyası kontekstində tədqiq etməyi təklif edir. L.M. Mitina, öz növbəsində, pedaqoji səriştələri tədqiq etmişdir (5). Onun tədqiqatlarından belə məlum olur ki, səriştə - bilik və bacarıqlar kompleksindən, bunların təlimində tətbiqi yollarından, üsul və vasitələrindən ibarətdir. Müəlliflər hesab edirlər ki, səriştəlilik tələbənin daha məlumatlı olduğu, təhsil almağa hazır olduğu fənn sahəsi ilə müəyyən edilir. Səriştə bakalavrın peşə fəaliyyətini həyata keçirməyə hazır olmasının nəticəsi olub, onun mühüm peşə keyfiyyətlərinin sintezidir. Təhsildə bacarıqlara əsaslanan yanaşmanın tətbiqi 2000-ci ildən etibarən daha geniş yayılmışdır.

"Səriştə" anlayışına tədqiqatçılar aşağıdakıları aid edir: davranış, idrak, əməliyyat, texnologiya, motivasiya, sosial, etik komponentlər, təlim nəticələri və s. Şəriştəyə əsaslanan yanaşmaya həsr olunmuş tədqiqatlarda "səriştə" anlayışının ümumi qəbul edilmiş tərifi yoxdur. Pedaqoji elmlərdə tələbə "səriştələrinin" şərhi ilə bağlı məsələlər hələ də müzakirə olunmaqdadır. Bu, normativ sənədlərdə səriştə əsaslı yanaşmanın dəqiq müəyyən edilmiş təhsil nəticəsinin olmaması ilə bağlıdır. Bəzi sənədlərdə o, əsas səriştələr toplusu kimi təqdim edilir. Digərlərində isə universal bilik, bacarıq, həyat təcrübəsi və məsuliyyətin vahid sistemi kimi müəyyən edilir. Yəni, "səriştə" bilik və təcrübəyə əsaslanır, nəticə əldə etməyə imkan verən bilik və bacarıqların tətbiqinin yaradıcı təzahürüdür. Başqa sözlə, "səriştə" universitetdə formalaşmış, peşəkar fəaliyyəti təmin etməyə imkan verən bilik, bacarıq və fəaliyyət metodlarının məcmusudur. Səriştəyə əsaslanan yanaşmanın əsas elementi təhsilin məzmun və keyfiyyətcə əsas səriştələr əsasında yenilənməsidir.

Ümumtəhsil məktəbi şagirdlərinin müstəqil fəaliyyət təcrübəsi və şəxsi məsuliyyəti, əsas səriştələr, yeni universal bilik, bacarıq və onların sistemini formalaşdırmalıdır. Tədqiqatlarda səriştələrin məzmununa görə əsas, ümumi və

fənn səriştələrinin təsnif edilməsi təklif edilir. Təhsil Standartı çərçivəsində müəyyən edilmiş səriştələr universitet məzununun peşə səriştəsinin faktiki formalaşması hesab olunur. Bu, məzuna peşə ixtisaslarının verilməsi haqqında Dövlət Attestasiya Komissiyasının qərarı ilə təsdiqlənir.

Tələbə fəaliyyətinin əsas sahələrində toplanmış sosial təcrübəni mənimsəməyə, müasir cəmiyyətdə praktiki həyat bacarıqlarına yiyələnməyə imkan verən əsas səriştələr arasında fərq qoyulur.

*Yeddi əsas səriştə fərqləndirilir: "1) dəyər-semantik; 2) ümummədəni; 3) təhsil və idrak; 4) məlumat; 5) ünsiyyət; 6) sosial və əmək; 7) şəxsi təkmilləşdirmə səriştəsi". Fənnüstü xarakter daşıyan, məktəb təhsili mərhələsində formalaşan mühüm səriştələr, universitet məzununun peşə səriştəsinin formalaşmasına xidmət edir, peşəyönlü səriştələrin əsasını təşkil edir.*

Peşə səriştəsi problemi bu və ya digər şəkildə alimlər tərəfindən diqqət mərkəzində saxlanılmış, hal-hazırda da təhsil nəzəriyyəçiləri və praktikləri tərəfindən öyrənilir. Səriştə problemi pedaqogika, psixologiya, sosiologiya, akmeologiya nöqteyi-nəzərindən təsvir edilir, lakin onun metodoloji imkanları məhduddur. Peşə səriştəsi anlayışına və onun əsas komponentlərinə nəzər salaq.

Qeyd edək ki, müxtəlif tədqiqatçıların elmi əsərlərində bu anlayış müxtəlif cür şərh olunur. Şəriştə sözünün müxtəlif izahı var.

1. Səriştə - müəyyən sahələrdə bilik, bacarıq, təcrübə məcmusudur və ya müəyyən bir işi yerinə yetirmək üçün zəruri olan səriştələr toplusuna sahib olmaqdır.

2. Səriştəlilik - əməkdaşın öz funksiyalarını uğurla yerinə yetirmək qabiliyyətidir. Amma müəllim səriştəliliyinin tərkibini müəyyən etmək, araşdırmaq üçün bu, tərif tam deyil.

3. Səriştəlilik - əməkdaşın peşə və fərdi keyfiyyətlərini özündə birləşdirən, ona peşə fəaliyyəti ilə məşğul olmağa imkan verən, öz ixtisası üzrə bilik və bacarıqlardan prosesin həyata keçirilməsi vasitəsi kimi istifadəyə imkan verən hərtərəfli təhsildir. Bu tərif, daha çox "peşəkarlıq" anlayışı ilə bağlıdır, səriştə şəxsi motivasiya və emosional-iradi komponentin mövcudluğu ilə fərqlənir.

Bir sıra tədqiqatçılar peşəkar səriştəni aşağıdakı kimi müəyyənləşdirirlər:

- "Mütəxəssisin daxili psixi vəziyyəti və şəxsi keyfiyyətlərinin onun peşə fəaliyyətini həyata keçirməsinə imkan verən mürəkkəb, vahid sistem";
- "Şəxsin peşə fəaliyyəti uğurunu və onun nəticələrinə görə məsuliyyətini müəyyən edən ayrılmaz məzmun-prosessual xarakteristikası" (A.A. Verbitski);
- "Fənni, tədris metodları və didaktikası, pedaqoji ünsiyyət bacarıq və mədəniyyəti, habelə özünüinkişaf, özünüdərk, özünütəkmilləşdirmə üsulları və vasitələri haqqında biliklərin ahəngdar birləşməsi;" (L.M. Mitina);
- "Mütəxəssis şəxsiyyətinin inteqrativ keyfiyyəti, o cümlədən tipik problemlərin həlli üçün bilik, bacarıq və ümumiləşdirilmiş üsullar sistemi.

Peşə səriştəsinin konseptual aparatına diqqət yetirməklə, müxtəlif formulaları qeyd etmək olar, lakin səriştənin strukturunda müəlliflər (V. Y. Kriçevski, A.K. Markova, E.F. Zeer və b.) yekdilliklə 3 komponenti (səviyyəni) fərqləndirirlər: nəzəri, praktiki və şəxsi.

Peşə səriştəsinin tərifi, strukturu və təsnifatına nəzər salaq. Bəzi alimlər tərəfindən müəyyən edilmiş peşə səriştəsi növləri cədvəl 1-də təqdim olunur.

***Cədvəl 1.*** *Peşə səriştəsinin növləri*

| **Tipologiyanın müəllifi** | **Baxışlar/komponentlər** |
|---|---|
| A.K. Markova | Xüsusi səriştə - peşəkar fəaliyyətdə yüksək səviyyədə bacarıq, peşə özünüinkişafıdır.<br>Sosial səriştə - "birgə peşə fəaliyyəti, əməkdaşlıq", peşəkar ünsiyyət; öz peşə fəaliyyətinin nəticələrinə görə cəmiyyət qarşısında məsuliyyətə hazır olmaq.<br>Şəxsi səriştə - fərdi özünü inkişaf etdirmək və özünü ifadə etmək, peşəkar şəxsiyyət dəyişikliklərinə müqavimət göstərmək bacarığıdır.<br>Fərdi səriştə - özünürealizə, peşəkar fərdiliyi inkişaf etdirmək, özünü qorumaq, peşəkar inkişafa hazır olmaq, iş və istirahətlə bağlı gündəlik iş rejimini təşkil etmək və peşəkar "tükənmişliyin" qarşısını almaq bacarığıdır. |

| | |
|---|---|
| V.Y. Kriçevski | Funksional səriştəlik - peşəkar bilik və onu tətbiqi bacarığıdır.<br>İntellektual səriştə - analitik düşünmək və öz vəzifələrini yerinə yetirmək üçün hərtərəfli yanaşma qabiliyyətidir.<br>Situasiya səriştəsi - vəziyyətə uyğun hərəkət etmək bacarığıdır.<br>Sosial səriştə - ünsiyyət qurmaq və inteqrasiya etmək bacarığıdır. |
| E.F. Zeer | Sosial-hüquqi səriştə - dövlət qurumları ilə qarşılıqlı əlaqə qurmaq, peşəkar ünsiyyət və davranış üsullarını mənimsəmək bacarığıdır.<br>Xüsusi səriştə - müəyyən bir fəaliyyət növünü müstəqil yerinə yetirməyə hazır olmaq; standart peşə vəzifələrini həll etmək və fəaliyyətlərin nəticəsini qiymətləndirmək bacarığı; ixtisas üzrə müstəqil bilik və bacarıqlara yiyələnmək bacarığıdır.<br>Şəxsi səriştə - ixtisasları inkişaf etdirmək və təkmilləşdirmək, habelə peşəkar fəaliyyətdə həyata keçirmək qabiliyyətidir.<br>Fərdi səriştə - bir insanın peşəkar imkanlarının obyektiv qiymətləndirilməsi və peşəkar “məhvin” aradan qaldırılması üçün texnologiyalara sahib olmasıdır. |
| V.N. Vvedenski | Kommunikativ səriştə - müəllimin qarşılıqlı əlaqə qurmaq bacarığı; dinləmək, həvəsləndirmək, ünsiyyət prosesini “anlaşılan” etməkdir.<br>İnformasiya səriştəsi - elmi biliklərin həcmini, tələbələr və onların valideynləri haqqında, həmkarlarının ən yaxşı təcrübələri haqqında məlumatları əhatə edir.<br>Müəllimin tənzimləyici səriştəsi - öz davranışını idarə etmək bacarığıdır. Buraya aşağıdakılar daxildir: məqsədin qoyulması, planlaşdırma, səfərbərlik və davamlı fəaliyyət, fəaliyyətin qiymətləndirilməsi, əks etdirmə.<br>İntellektual və pedaqoji səriştə - analiz, sintez, müqayisə, abstraksiya, ümumiləşdirmə, konkretləşdirmə kimi zehni əməliyyatların məcmusudur. Həm də zəka, fantaziya, çeviklik və tənqidi düşüncə. |

Müəllimin peşə səriştəsinin strukturunu nəzərə alsaq, tədqiqatçıların ümumi rəyi yoxdur. V.A. Slastenin hesab edirdi ki, “peşəkar səriştə anlayışı müəllimin pedaqoji fəaliyyətinin həyata keçirilməsinə nəzəri və praktiki hazırlığının vəhdətini ifadə edir və peşəkarlığını səciyyələndirir”. İ.F. İsayev və E.N. Şiyanov hesab edirlər ki, müəllimin peşə səriştəsi bu hazırlığı müəyyən edən pedaqoji bacarıqlara əsaslanır.

Hazırlığın iki növü var: nəzəri (analitik, proqnozlaşdırma və əks etdirmə bacarıqlarına malik olmağı nəzərdə tutur) və praktiki (təşkilatçılıq bacarıqları və ünsiyyət bacarıqları).

O.B. Episheva hesab edir ki, peşəkar pedaqoji səriştə fərdin bilik və təcrübə əsasında peşə fəaliyyətini həyata keçirmək qabiliyyətidir. Eyni zamanda, hazırkı peşə fəaliyyəti şəraitində pedaqoji səriştə müəllimin ayrılmaz xüsusiyyəti kimi çıxış edir və adekvat, məsuliyyətlə, müstəqil fəaliyyət göstərmək bacarığı ilə ifadə olunur. O hesab edir ki, peşəkar-pedaqoji səriştəlilik müəllimin mühüm xüsusiyyəti olub, tələbələrin gözləntilərinə cavab verən peşə problemlərinin layihələndirilməsi və həlli sahəsində onun qabiliyyəti və hazırlığının inkişaf səviyyəsini əks etdirir.

Tədqiqatçılar hesab edirlər ki, müəllimin peşə səriştəsinin strukturu peşə üzrə bilik, bacarıq və peşə əhəmiyyətli şəxsi keyfiyyətlərdən ibarət olmalıdır. L.I. Gurye pedaqoji səriştəyə bunları aid edir: "Şəxsin fəaliyyətində, ünsiyyətində, inkişafında (özünüinkişafda) həyata keçirmək üçün bilik, bacarıq, habelə üsullar toplusu”. Eyni zamanda, bu konsepsiyanın tərkibinə təlim zamanı əldə edilmiş bilik, bacarıq və onların həyata keçirilmə üsulları daxildir. Müəllimin şəxsi potensialı, peşə əhəmiyyətli şəxsi keyfiyyətlərin məcmusu böyük əhəmiyyət kəsb edir.

**Problemin aktuallığı.** Məqalə aktual məsələyə - peşə səriştəsi anlayışının izahı ilə əlaqədar mövcud ədəbiyyatda olan müxtəlif yanaşmaların təhlilinə həsr edilmiş, məsələyə ümumi baxış verilmiş, fikirlər sistemləşdirilmişdir. Peşə səriştəsi anlayışının ümumiləşdirilmiş şərhi təqdim edilmiş, bu sahədə olan tədqiqatlara toxunulmuşdur.

**Problemin elmi yeniliyi.** Peşə səriştəliliyi anlayışının strukturu sistemləşdirilmiş, fərqli səriştə növləri təqdim edilir.

**Problemin praktik əhəmiyyəti.** Peşə səriştəliliyi sahəsində tədqiqat aparan araşdırmaçılar üçün tədqiqat praktik əhəmiyyət daşıyır.

**Ədəbiyyat:**

1. İlyasov M. Səriştə əsaslı pedaqoji təhsil: bilik və bacarıqların praktik fəaliyyətə səmərəli tətbiqi. // -Bakı: Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, -2022, № 5.
2. İlyasov M. Müəllim peşəkarlığı və pedaqoji səriştəliliyin müasir problemləri. -Bakı: Elm və təhsil, -2018.
3. Mehrabov A.O. Səriştəli müəllim hazırlığının problemləri. -Bakı: Elm və təhsil, -2015.
4. Зимняя, И. А. Ключевые компетенции - новая парадигма результата образования / И. А. Зимняя // Высшее образование сегодня. - 2003. - № 5. - с. 34-42.
5. Митина, Л. М. Психология труда и профессионального развития учителя: учебное пособие для педагогических вузов / Л. М. Митина. - Гриф УМО. - Москва: Academia, 2004. - 319 с.

**E-mail:** rahimova.lala@yandex.ru

**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **İ.B. Əhmədov**
*fiz.riy.ü.fəls.dok*., *dos.* **Ə.Ə. Aslanov**
**Redaksiyaya daxil olub: 12.01.2023.**

# *TƏHSİLDƏ MONİTORİNQ VƏ QİYMƏTLƏNDİRMƏ*
# *МОНИТОРИНГ И ОЦЕНИВАНИЕ В ОБРАЗОВАНИИ*
# *MONITORING AND EVALUATION IN EDUCATION*

*UOT 37.0*

**_Günay Xəzail qızı Şirəliyeva_**
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dillər Universitetinin Təhsil-1 fakültəsi nəzdində*
*Xarici dillərin tədrisi metodikası kafedrasının müdiri*

## TƏLƏBƏLƏRİN RESEPTİV BACARIQLARININ QİYMƏTLƏNDİRİLMƏSİNİN SƏMƏRƏLİ YOLLARI

**_Гюнай Хазаил гызы Ширалиева_**
*доктор философии по педагогике, доцент*
*заведующий кафедрой Методики преподавания иностранных языков при педагогическом факультете-1 Азербайджанского Университета Языков*

## ЭФФЕКТИВНЫЕ СПОСОБЫ ОЦЕНИВАНИЯ РЕЦЕПТИВНЫХ НАВЫКОВ УЧАЩИХСЯ

**_Gunay Khazail Shiraliyeva_**
*doctor of philosophy in pedagogy, associate professor,*
*head of the department of Foreign languages teaching methodology*
*under the faculty of education-1 at Azerbaijan University of Languages*

## EFFECTIVE WAYS OF ASSESSING STUDENTS’ RECEPTIVE SKILLS

**Xülasə.** Məqalədə ali təhsil müəssisələrində xarici dil tədrisi metodikasına daxil olan qiymətləndirmə metodları, formativ və summativ qiymətləndirmənin məqsədi araşdırılır. Tələbələrin reseptiv dil bacarıq və vərdişlərinə yiyələnməsini təmin etməkdə və təhsil səviyyəsinin yüksəldilməsində qiymətləndirmənin əhəmiyyəti vurğulanır.

**_Açar sözlər:_** *reseptiv, formativ, summativ, standart, texnologiya*

**Резюме.** В статье исследуются методы оценивания, входящие в методику преподавания иностранного языка и цели формативного и суммативного оценивания в высших учебных заведениях. Подчеркивается важность оценивания в приобретении студентами рецептивных языковых навыков, а также в повышении уровня образования

**_Ключевые слова:_** *рецептивный, формативный, суммативный, стандарты, технология*

**Summary.** The article explores the evaluation methods included in the methodology of foreign language teaching in higher education institutions, and the purpose of formative and summative assessment. The importance of assessment in ensuring students’ acquisition of receptive language skills and habits and raising the level of education is emphasized.

**_Key words:_** *receptive, formative, summative, standard, technology*

Məlum olduğu kimi, kommunikativ prosesin tipinə görə dil bacarıqları iki qrupa ayrılır: reseptiv (dinləmə və oxu) və produktiv bacarıqlar (danışıq və yazı). Xarici dilin öyrədilməsinin məqsədi bu dil bacarıqlarından ayrı-ayrılıqda deyil, birlikdə istifadə etməkdir [6, s.227].

Dinləyib anlama (listening comprehension) nitq fəaliyyətinin reseptiv növü olub, nitqin şifahi

yolla, eyni zamanda, qəbul edilib anlaşılması kimi başa düşülür.

Dinləmə zamanı aşağıdakı çətinliklər ortaya çıxa bilir:

1. Dinləməyə cəmi bir dəfə şərait yaradılır;

2. Dinləyən tələbə dinlədiyi materialda dəyişiklik edə, ya da onu öz səviyyəsinə uyğunlaşdıra bilmir;

3. Danışıqda sürət, aksent, danışıq dilinə xas elementlərin, müxtəlif idiomların işlənməsi halları olur;

Mətnə ilk dəfə qulaq asarkən çətin başa düşmə olur və o da aşağıdakı səbəblərdən baş verir:

1. Dinləmənin şəraitində problemlər; bu çətinliyə auditoriyada səs-küyün olması, keyfiyyətsiz səsləndirmə və s. aiddir. Tələbələr canlı danışığı audiokassetdəki danışıqdan daha tez və yaxşı anlayırlar, çünki burada jest, mimika, göz kontaktının rolu öz sözünü deyir.

2. Dinlənilən materialla bağlı fərdi çətinliklər; buraya diksiya, tembr, pauza, artikulyasiyanın pozulması, yaş xüsusiyyətləri, müxtəlif aksentlər və dialektlər daxildir. Tələbələrə bütün yaşda olan kişi və qadınların nitqinə, bütün yaş qruplarından olan uşaqların nitqinə qulaq asmaq tövsiyə edilir.

3. Dinlənilən materialın dili ilə bağlı çətinliklər; buraya naməlum sözlərin, idiomların, xüsusi terminlərin qısaltma və ixtisarların audiokasetdə səslənməsi aiddir.

Dinləmənin müvəffəqiyyətli olması obyektiv (mətnin çətinlik dərəcəsi, dil xüsusiyyətləri) və subyektiv (tələbənin psixoloji-mental vəziyyəti, onun hazırlıq səviyyəsi) amillərdən asılıdır.

Mütəxəssislər dinlənilmiş mətn üzərində işi üç mərhələyə ayırır:

1) dinləməyə qədərki mərhələ;

2) dinləmə mərhələsi;

3) dinləmədən sonrakı mərhələ [2, s. 5];

Q.V. Roqova isə dinlənilmiş mətn üzərində işi növbəti mərhələlərə ayırır:

1) dinləmədən öncə verilmiş təlimat;

2) audiomətnin dinlənilməsi prosesi;

3) dinləməni yoxlamaq üçün verilən tapşırıqlar.

Oxu nitq fəaliyyətinin elə reseptiv növüdür ki, onun vasitəsilə yazılı nitqi oxuyaraq anlamaq olur. Oxu prosesində mətndə olan informasiya qəbul edilir və qiymətləndirilir [1, s.12].

Oxuda analiz, sintez, ümumiləşdirmə, təxminetmə, məntiqi düşünmə prosesləri cəmləşir və digər dil bacarıqlarının formalaşdırılmasına da kömək edir.

Oxunun səssiz və səsli növləri fərqləndirilir. Səssiz oxu zamanı tələbə oxuduğu mətndən informasiya əldə edir, səsli oxuda isə informasiya başqasına ötürülür.

Q.V. Roqova oxunun üç əsas növünü fərqləndirir:

1) bilik və ya informasiya əldə etmək məqsədilə oxu;

2) materialla ümumi tanışlıq məqsədilə olan oxu;

3) informasiyanı nəzərdən keçirmək məqsədi daşıyan oxu.

Qərb ədəbiyyatında isə oxunun bu növləri göstərilir:

1) skimming (mətnin əsas ideyasının müəyyənləşdirilməsi);

2) scanning (mətndə konkret ideyanın tapılması);

3) reading for detail (təkcə məzmun deyil, mənanın da anlaşılması üçün oxu).

N.V. Solovova mətn üzərində işin üç mərhələsinin olduğunu bildirir: oxumadan əvvəlki mərhələ, oxu zamanı və oxudan sonrakı mərhələ.

Mətni oxumadan əvvəlki mərhələnin əsas məqsədi bunlardır: ilk oxu üçün nitq çalışmalarını müəyyənləşdirmək; tələbələrdə oxu motivasiyası yaratmaq; oxu zamanı dil və nitq çətinliklərini imkan daxilində aradan qaldırmaq;

Oxudan sonrakı mərhələnin əsas məqsədi mətndəki situasiyadan tələbənin şifahi və yazılı nitqini inkişaf etdirmək üçün istifadə etməkdir.

Bütün qeyd edilən bacarıqlar müəllimlər tərəfindən qiymətləndirilir. Mütəxəssislər qeyd edirlər ki, formasından asılı olmayaraq qiymətləndirmənin əsas məqsədi təhsilin səviyyəsini mümkün qədər artırmaqdır.

Artıq yuxarıda qeyd etdiyimiz kimi, ali məktəbdə ingilis dilinin tədrisində qiymətləndirmənin iki əsas növündən istifadə edilir: formativ qiymətləndirmə və summativ qiymətləndirmə. Hər iki növün məqsədi bütün tələbələrin kursun sonunda reseptiv və produktiv dil bacarıq və vərdişlərinə yiyələnməsini təmin etməkdir.

Formativ qiymətləndirmənin əsas xüsusiyyətləri bunlardır:

- qiymətləndirmə tədris və öyrənmə prosesində qurulur;
- tələbələrlə təlim məqsədlərinin müzakirəsi gözlənilir;
- qiymətləndirmə tələbələrə təlim standartlarını anlamağa kömək edir;
- tələbə özünüqiymətləndirmə və ya həmyaşıdlarını qiymətləndirmə prosesində iştirak edir; əks əlaqə təmin edilir: qiymətləndirmə tələbələrə öyrənmənin növbəti addımlarını müəyyən etməyə kömək edir;
- hər bir şagirdin öyrənmədə irəliləyişlərə nail ola biləcəyinə inam güclənir;
- qiymətləndirmə həm müəllimi, həm də tələbələri qiymətləndirmə məlumatlarının nəzərdən keçirilməsi və əks etdirilməsi prosesinə cəlb edir.

Bu qiymətləndirmə ona görə formativ adlanır ki, o, konkret tələbəyə yönəldilir, tələbənin təhsil məzmununun elementini mənimsəməsindəki boşluqları maksimum səmərəliliklə doldurmaq üçün müəyyən etməyə hesablanır.

Formativ (daxili) qiymətləndirmənin mahiyyətini aşağıdakı metafora ilə izah etmək olar: “Tələbələri bitkilər şəklində təsəvvür etsək, onda bitkilərin xarici (summativ) qiymətləndirilməsi onların sadəcə olaraq böyüməsinin ölçülməsi prosesidir. Ölçmə nəticələri müqayisə və təhlil üçün maraqlı ola bilər, lakin onlar özözünə bitki böyüməsinə təsir göstərmir. Daxili (formativ) qiymətləndirmə isə əksinə, onların böyüməsinə birbaşa təsir edən bir şey olmaqla, bitkiləri qidalandırmaq və suvarmağa bənzəyir”.

Sinifdə aparılan formativ öyrənmə qiymətləndirməsinə daxildir: tələbələri nəzərdə tutulmuş standartlarla tanış etmək; tələbələrin necə inkişaf edəcəyini müəyyənləşdirməyə kömək edən rəy vermək; tələbələr inkişaf etmək üçün lazım olan sahələri müəyyən etmək üçün özünü qiymətləndirmə üsullarını öyrənməsi və s.

Yeni nəsil standartlarında qiymətləndirmənin əsas prinsipləri aşağıdakılardır:

- qiymətləndirmə davamlı prosesdir, təbii olaraq təhsil praktikasına inteqrasiya olunur;
- qiymətləndirmə yalnız meyar ola bilər, qiymətləndirmənin əsas meyarları təlim məqsədlərinə uyğun gələn, gözlənilən nəticələrdir;
- qiymətləndirmə meyarları və qiymət qoymaq alqoritmi həm müəllimlərə, həm də tələbələrə əvvəlcədən məlumdur, onlar birgə işləyə bilərlər;
- qiymətləndirmə sistemi tələbələrin özünüqiymətləndirmə bacarıq və vərdişlərinə yiyələnərək nəzarət və qiymətləndirmə fəaliyyətlərinə cəlb olunduğu şəkildə qurulur.

Yuxarıda göstərilən tələblərin hamısı formativ qiymətləndirmə adlanan üsulla təmin edilir. Bu termin "özünü qiymətləndirən, əks əlaqə rolunu oynaya bilən və tədris və təlim prosesinin modifikasiyasına imkan verən məlumatla təmin edən müəllim və tələbə fəaliyyətinin istənilən formasına aiddir" [4, s. 419 ].

Formativ qiymətləndirməsinin dörd əsas xüsusiyyəti vardır:

1 Effektiv sorğu üsulları.
2. Effektiv rəy.
3. Təlimin ümumi məqsədləri.
4. Özünü qiymətləndirmə.

Formativ qiymətləndirməni auditoriyada necə tətbiq etmək olar? İlk növbədə, müəllim formativ qiymətləndirmə sisteminin yaradılması alqoritminə əməl etməlidir:

- gözlənilən nəticələri müəyyən etmək;
-subyektiv əhəmiyyətli nəticələrin planlaşdırılması və əldə edilməsində tələbənin fəaliyyətini təşkil etmək;
- tələbə nailiyyətlərini mütəşəkkil rəylə müşayiət etmək.

Formativ qiymətləndirmə tələbələrin iştiraklarını yaxşılaşdırmaq üçün hansı addımları atmalı olduqlarını başa düşmələri üçün “geri əlaqə”dir.

Formativ qiymətləndirmənin məqsədi hər bir fərdi tələbənin fəaliyyətini yaxşılaşdırmağa kömək etməkdir. Formativ qiymətləndirmə - öyrənməyə kömək edən qiymətləndirmədir: tələbələrin biliyi necə mənimsəməsinə diqqət yetirən səmərəli planlaşdırmanın elementidir, müəllimin əsas peşəkar bacarığıdır, motivasiyanı təmin edir, məqsədləri və meyarları aydınlaşdırmağa kömək edir, tələbələrə nəticələrini necə yaxşılaşdırmağı anlamağa kömək edir, özünü və həmyaşıdlarını qiymətləndirmək bacarığını, bütün təhsil nailiyyətlərini əks etdirir və dərsin daimi elementidir.

Formativ qiymətləndirmə müəllimə aşağıda qeyd olunanları həyata keçirməyə imkan verir:

- hər bir konkret halda formalaşmalı və qiymətləndirilməli olan təhsil nəticəsini aydın formalaşdırmaq və öz işini buna uyğun təşkil etmək;

- tələbəni təhsil və qiymətləndirmə fəaliyyətinin subyektinə çevirmək;

- səhvlərdən öyrənməyə kömək edə bilər;

- nəyin vacib olduğunu anlamağa kömək edə bilər;

- nə etdiklərini anlamağa kömək edə bilər;

- bilmədiklərini kəşf etməyə kömək edə bilər;

- edə bilmədiklərini aşkar etməyə kömək edə bilər.

Formativ qiymətləndirmə beş prinsipini ortaya qoyur:

1. Müəllim mütəmadi olaraq tələbələrə şərhlər, qeydlər və s. fəaliyyətləri haqqında məlumat verir.

2. Tələbələr öz təlim prosesinin təşkilində fəal iştirak edirlər.

3. Müəllim tələbələrin təlim nəticələrində baş verən dəyişikliklərdən asılı olaraq tədris texnika və texnologiyalarını dəyişir.

4. Müəllim bilir ki, qiymətlərlə qiymətləndirmə tələbələrin motivasiyasını və özünə hörmətini kəskin şəkildə azaldır.

5. Müəllim tələbələrə özünüqiymətləndirmə prinsiplərini və öz fəaliyyətini təkmilləşdirməyin yollarını öyrətməyin zəruriliyini dərk edir.

Formativ qiymətləndirmə texnologiyasının mərhələlərini qeyd olunan bölgü üzrə aparmaq olar:

Addım 1. Mövzular üzrə tələbələrin təhsil nəticələrinin əldə edilməsinin planlaşdırılması.

Addım 2. Dərsin məqsədinin tədris nəticələrinə nail olmaq şərtinə əsaslandıraraq tələbələrin fəaliyyətlərinin formalaşdırılması.

Addım 3. Dərsin məqsədlərinin tələbələrin fəaliyyətində ardıcıl mərhələlər kimi formalaşdırılması.

Addım 4. Dərsdə tələbələrin fəaliyyətinin qiymətləndirilməsi üçün konkret meyarların müəyyən edilməsi.

Addım 5. Tələbələrin fəaliyyətlərinin meyarlara uyğun qiymətləndirilməsi.

Addım 6. Əlaqənin həyata keçirilməsi (müəllimdən tələbəyə, tələbədən tələbəyə)

Addım 7. Tələbələrin nəticələrinin onların nailiyyətlərinin əvvəlki səviyyəsi ilə müqayisəsi.

Addım 8. Məqsədə çatmaq yolunda tələbənin yerinin müəyyən edilməsi.

Addım 9. Tələbənin təhsil yolunun düzgün qurulması.

Təhsil sistemində tələbə nailiyyətlərinin qiymətləndirilməsində ən müasir təhsil texnologiyalarından və yeni qeyri-ənənəvi metodlardan istifadə edilir.

Beləliklə, dərs zamanı tələbələr öz akademik nailiyyətlərini, eləcə də qrup yoldaşlarının nailiyyətlərini qiymətləndirirlər, bunun nəticəsində çoxsəviyyəli tapşırıqlar üçün hər bir tələbə üçün bal toplama prosesi baş verir: şifahi dialoq və monoloq nitq, dinləmə üçün. bacarıqları, yazılı leksik və qrammatik tapşırıqlar qiymətləndirilir. Hər dərs üçün yaxşı, orta səviyyədən aşağıya qədər müxtəlif qabiliyyətlərə malik olan tələbələr üçün müxtəlif səviyyəli metodik və didaktik tapşırıqlardan ibarət texnoloji xəritə tərtib oluna bilər.

2. Summativ qiymətləndirmə tələbənin kurs və ya semestr ərzində hansı bilik və bacarıqlara yiyələndiyini göstərir.

Summativ qiymətləndirmənin əsas xüsusiyyətləri aşağıdakılardır:

1. Sənədlərdən istifadə;

2. Tədris müəssisəsinin heyəti tədris müəssisəsi daxilində və digər müəssisələr arasında standartları bölüşür.

Oxu bacarıq və strategiyaları Qrelet (Grellet 1981), Qreyb (Grabe 1991) və Nadl (Nuttall 1996) kimi alimlər tərəfindən müəyyən dərəcədə tədqiq edilmişdir. Qreyb öz əsərlərində səlis oxu üçün aşağıdakı elementlərin vacib olduğunu qeyd etmişdir:

1. avtomatik anlama vərdişləri;
2. lüğət və ümumi biliklər;
3. formal diskurs haqqında ümumi biliklər;
4. məzmun / ümumi dünyagörüş;
5. sintez / bacarıqların qiymətləndirilməsi;
6. metakoqnitiv bilik və bacarıqların monitorinqi [3, s.13]

Nadl isə bu siyahıya öz əlavələrini etmişdir:

- söz anlama bacarığı;
- mətn anlama bacarığı;
- mətndən səmərəli istifadə bacarığı.

Söz anlama bacarığı dedikdə, naməlum sözlərin mənasının mətn daxilində anlaşılması nəzərdə tutulur.

Mətn anlama bacarığı isə mətndə baş verəcək hadisələri qabaqcadan proqnozlaşdırmaq, koheziv vasitələrin izahı, mətnin təşkili kimi xüsusiyyətləri özündə birləşdirir.

Mətndən səmərəli istifadə adı altında mətnin əsas ideyasının müəyyənləşdirilməsi və mətndə konkret ideyanın tapılması başa düşülür.

Yuxarıda qeyd edilən mütəxəssislərin fikrincə, mətnə veriləcək suallar aşağıdakı məzmunu daşımalıdır:

1. Cavabları mətnin özündə olan mətnin anlaşılmasını müəyyənləşdirən suallar;
2. Cavabın tapılması məqsədilə məlumatların yenidən təşkili və ya yenidən təqdim edilməsi;
3. Mətndə baş verən hadisədən nəticə hasil edən və cavabları mətndə olmayan suallar.
4. Müəllifin işinin qiymətləndirilməsi;
5. Arasında düzgün cavab olmaya və oxucunun mətnin məzmununu nə dərəcədə anlamasını yoxlayan suallar.
6. Müəllifin istifadə etdiyi dil vasitələrinin təhlili [5, s.188-189].

Oxuyub anlamanın qiymətləndirilməsinin ən müasir və mühüm üsullarından biri testlərdir və onlardan formativ qiymətləndirmədə istifadə edilir. Testi nəzərdən keçirməmişdən əvvəl tələbələrin mətni anlayıb-anlamamalarını onlara ünvanlanan sualların vasitəsilə müəyyənləşdirmək mümkündür.

Aldersonun fikrincə, mətnin çətin və ya asan olması bir çox amillərdən asılıdır. Bu faktorlara aşağıdakılar daxildir:

- mətnin linqvistik xüsusiyyətləri;
- mətnin məzmun xüsusiyyətləri;
- mətnin digər xüsusiyyətləri (mətnin janrı və necə təşkil edilməsi) aid edir.

**Problemin aktuallığı.** Qiymətləndirmə təlimin çox vacib elementi hesab edilsə də, onunla bağlı araşdırma tələb edilən bir sıra məsələlər də mövcuddur; məsələn, dərs vaxtı düzgün qiymətləndirmə metodlarının müəyyənləşdirilməsi, təyin edilmiş meyarlara uyğun rubriklərin (hissələrin) təşkil edilməsi və s. İngilis dilinin ali məktəblərdə tədrisi zamanı qiymətləndirmənin aparılması, növlərinin müəyyənləşdirilməsi və funksiyalarının təyin edilməsi vacibliyi məsələnin aktuallığını təmin edir.

**Problemin elmi yeniliyi.** Müasir dövrdə aparıcı dünya dillərindən olan ingilis dilinin öyrənilməsinə tələbat artmaqda davam edir. Bütün fənlərdə olduğu kimi, ingilis dilin tədrisində də müəllim aparıcı rola malikdir və yüksək göstəricilər əldə etmək üçün onun düzgün qiymətləndirmə metodunu seçə bilməsi əhəmiyyətli məsələdir ki, bu da məqalənin elmi yeniliyini təşkil edir.

**Problemin praktik əhəmiyyəti** ondan ibarətdir ki, alınan nəticələrdən istər orta, istərsə də ali məktəbdə xarici dilin tədrisində tələbələrin düzgün qiymətləndirilməsində istifadə etmək olar. Bundan başqa, məqalədən ali məktəblərdə ingilis dilinin tədrisi metodikası fənninin tədrisində də bəhrələnmək mümkündür.

**Ədəbiyyat:**


1. Смирнова Ж.В., Красикова О.Г. Современные средства и технологии оценивания результатов обучения // Вестник Мининского университета. -2018. Т. 6. № . с. 9.
2. Соловова, Е.Н. Методика обучения иностранным языкам. Базовый курс лекций. / Е.Н. Соловова. – М.: Просвещение, - 2002.
3. Alderson., J. C. Assessing Reading. Cambridge: Cambridge University Press. -2000.
4. Cameron, Jeanne et al. Assessment as Critical Praxis: A Community College Experience. Teaching Sociology 30.4 (2002): 414–429.
5. Nuttall C. Teaching Reading Skills in a Foreign Language. Macmillan. -1996. -203 p.
6. Selinker L. Tomlin R.S. An Empirical look at the integration and separation of skills / ELT Journal, -1986, -pp. 227-23


**Rəyçilər:** *filol.ü.fəls.dok.,dos.* **G.S. Həsənova,**
*ped.ü. fəls.dok.* **F.Ş. Şükürova**
**Redaksiyaya daxil olub:** 23.02.2023

***Seriya Alibala Sevdimaliyeva***
*the English language teacher at Sumgayit State College*
*under Sumgayit State University*

***Afet Mamish Hajiyeva***
*the English language teacher at Sumgayit State College*
*under Sumgayit State University*

## ASSESMENT COMPETENCY

***Səriyyə Əlibala qızı Sevdimalıyeva***
*Sumqayıt Dövlət Universitetinin nəzdində Sumqayıt Dövlət Kollecinin*
*ingilis dili müəllimi*

***Afət Məmiş qızı Hacıyeva***
*Sumqayıt Dövlət Universitetinin nəzdində Sumqayıt Dövlət Kollecinin*
*ingilis dili müəllimi*

## KOMPETENSİYANIN QİYMƏTLƏNDİRİLMƏSİ

***Сария Алибала гызы Севдималиева***
*преподаватель английского языка Сумгаитского Государственного Колледжа*
*при Сумгаитском Государственном Университете*

***Афет Мамиш гызы Гаджиева***
*преподаватель английского языка Сумгаитского Государственного Колледжа*
*при Сумгаитском Государственном Университете*

## ОЦЕНИВАНИЕ КОМПЕТЕНЦИЙ

**Summary.** One of the most important and demanding problems for educators working in the field of education is the assessment of the competencies of learners. Although educators can evaluate the theoretical knowledge of students through various evaluation methods, they have great difficulty in evaluating their practical knowledge. For this purpose, the article describes the essence of the evaluation of the competencies of students, why the importance of using competency-based evaluation, and the principles that teachers should take into account in the training process.
***Key words:*** *assessment, learners, competence, learning, teaching, quality*

**Xülasə.** Təhsil sahəsində fəaliyyət göstərən təhsilverənlər üçün ən vacib olan və öz həllini tələb edən problemlərdən biri də təhsilalanların kompetensiyalarının qiymətləndirilməsidir. Təhsilverənlər təhsilalanların nəzəri biliklərini müxtəlif qiymətləndirmə metodları vasitəsilə qiymətləndirə bilsələr də təcrübi biliklərini qiymətləndirməkdə çox çətinlik çəkirlər. Bu məqsədlə məqalədə təhsilalanların kompetensiyalarının qiymətləndirilməsinin mahiyyəti, nə üçün kompetensiya əsaslı qiymətləndirmədən istifadənin əhəmiyyəti, bu zaman əhəmiyyətli hesab olunan əsas yəni, müəllimlərin təlim prosesində nəzərə almalı olduqları prinsipləri əks olunmuşdur.
***Açar sözlər:*** *qiymətləndirmə, təhsilalanlar, kompetensiya, öyrənmə, öyrətmə, keyfiyyət*

**Резюме.** Одной из важнейших и актуальных проблем для педагогов, работающих в сфере образования, является оценка компетенций обучающихся. Хотя преподаватели могут оценивать теоретические знания учащихся с помощью различных методов оценки, им очень трудно оценить их практические знания. С этой целью в статье описывается сущность оценивания компетенций обучающихся,

важность использования компетентностного оценивания, а также принципы, которые преподаватели должны учитывать в процессе обучения.

***Ключевые слова:*** *оценивание, обучаемые, компетенция, обучение, преподавание, качество*

The most important stimulus for learning is evaluation since each act of assessment conveys to pupils what they should be learning and how they should go about it. The message is frequently not clear, difficult to comprehend, and is frequently read differently and given a different focus by teachers and pupils.

Finding the "right" method and employing it wisely in connection with the given topic matter is only one aspect of good evaluation. In appraisal, there are invariably unintended repercussions. Students will learn to use "surface" (memorization-based) techniques to learning in some situations and "deep" (meaning-seeking) approaches in others [2]. They will be encouraged to do this in part by the formats and content of the assessment tasks. They will discover that, in many situations, they should employ rote learning in order to maximize their marks, even when the teacher may think that doing so would cause them to lose focus on the most crucial elements of the course. This response-and other undesirable ones-will be a function not only of the assessment tasks set, but also of all the experiences of assessment students have had in the past. If, for example, they get the idea that memorization works for multiple-choice tests, they will persist in that strategy even when assured that it will not help. Students are not simply responding to the given subject-they carry with them the totality of their experiences of learning and being assessed and this certainly extends far beyond concurrent and immediately preceding subjects.

As a result, how a student approaches the task of learning will depend on [3]:

- the inherent qualities of the form of assessment being used;
- the methods by which the assessor converts the material to be assessed into the specified format and chooses evaluation tasks suitable for the subject and the particular learning objectives; and
- the student's interpretation of the assignment's requirements and the assessment's overall context, which is crucial.

The latter interpretation depends on how these tasks are integrated into the overall context of the subject, the overall experience of the course, and the student's life, in addition to how the evaluation process is structured. For instance, assessment tasks are developed for inexperienced learners who are frequently from a different generation and possibly from a different culture by experienced, frequently well-educated, professional educators with extensive topic expertise. The interpretation of any graded tasks must necessarily be impacted by these significant variances.

Pupils also encounter the interactions between different forms of assessment. They could have to finish ten evaluation activities in one month and just one in the next. Each of these will be approached differently depending on how they tackle the others. When a task is buried in a tangle of assessments, it may get overlooked even if it is innately fascinating and may be tackled meaningfully at any other time. Even though teachers are aware that the whole of the demands in a given time affects how each one is handled, the compounding effects of assessment have received very little attention [4].

Conventional methods of evaluation have presupposed that intellect, like other qualities like height, is distributed normally as seen by the normal curve. This presumption has been the basis for much of how people have thought about assessment and the creation of metrics like percentile ranks.

These presumptions guide tests that look to distinguish between individuals by determining where each one fits within the normal distribution. In this measurement paradigm of assessment, questions or items are chosen based on how well they can distinguish between individuals. That is, how well people perform in comparison to others determines excellence. The test's creators would assume it

was a bad test if everyone scored well on it, not if every student did really well.

The standards-based model makes quite different assumptions. These are that educational standards can be established, that the majority of pupils can meet them, that various performances can reflect the same standards, and that assessors can consistently evaluate these performances. The approach to training and assessment that is currently being used in vocational education in many countries is impacted by the adoption of such a model. Assessment is based on these requirements, and courses are planned and delivered to meet those standards.

Exams based on this paradigm aim to assess students' comprehension of the procedures and ideas that support success in real-world contexts, such as the workplace. They are guided by public standards. These assessments serve as essential teaching tools and can be administered at various points throughout a school or college year (or longer). Evidence may be obtained over time using a variety of approaches and in different circumstances because students do not have to meet requirements all at once.

Instead of using objective grading systems to address reliability difficulties, professionals should use their professional judgment and reference exemplars. Assessors take on the role of "judges", analyzing the evidence and judging how closely performances adhere to the set standards.

Consequently, when developing a competency-based assessment strategy, teachers and assessors must take into account practical concerns in addition to assessment concepts.

The main principles of evaluation are that it should be authentic, reliable, flexible/adaptive and fair (table 1) [5].

***Table 1. The four principles of assessment***

**Validity**

Assessments are valid when they assess what they claim to assess. This is achieved when:

- assessors are fully aware of what is to be assessed (against some appropriate criterion or defined learning outcome)
- evidence is collected from tasks that are clearly related to what is *to* be assessed
- there is enough sampling of different evidence to demonstrate that the performance criterion has been met.

**Reliability**

Assessments are reliable when they are applied and interpreted consistently from student to student, and from one context to another.

**Flexibility**

Assessments are flexible when they are successfully adapted to a range of training modes and the different needs of different learners.

**Fairness**

Assessments are fair when they do not disadvantage particular learners—for example, when all learners understand what is expected of them and what form an assessment will take.

In a competency-based assessment system, assessors make decisions about whether a person satisfies a standard or a set of criteria based on data gathered from numerous sources. Fundamentally, the concept of competency standards is a development of criterion-referenced assessment.

Although competence cannot be immediately seen, it can be deduced from performance. Hence, we must consider the kinds of performances that will allow us to compile significant amounts of high-quality evidence to draw reliable conclusions about a person's ability. Such conclusions cannot be universal.

If assessors abide by these three fundamental guidelines, they will be better able to make competent decisions:

*Use evaluation techniques that can best evaluate competence holistically.* The term "competence" refers to a person's knowledge, comprehension, problem-solving abilities, technical skills, attitudes, and ethics. Several competency components and all of their performance criteria are simultaneously assessed using integrated methodologies. For instance, during a single assessment event, observations of classroom performance could be used to evaluate a school teacher's classroom management abilities, subject-matter expertise, ethical standards, and lesson planning, among other things.

Nonetheless, since professionals operate in a wide range of circumstances, it can be risky to draw too many conclusions from seeing them perform. Hence, there will undoubtedly be situations where knowledge needs to be assessed without regard to performance.

*Choose assessment techniques that are straightforward and pertinent to the topic at hand.*

For learners to be properly led in their learning attempts, the criteria for judgment must be explicit. Moreover, new research in cognitive psychology suggests that problem solving is context-specific because problem solvers adopt specialized rather than general procedures.

Many people have the opinion that using a performance assessment is enough to ensure better assessment. Even if using these kinds of assessments encourages teachers to consider more effective ways to help all students frame and solve problems-that is, to promote true learning-such a change in assessment is insufficient to raise students' overall accomplishment.

*Make the inference of competence based on a wide range of evidence.*

A variety of techniques should be employed to provide evidence that can be used to infer competence since a limited foundation of evidence is less likely to be generalizable to the performance of other activities. For instance, success on paper and pencil assessments will likely be too limited a platform for evaluating vocational competence in any profession.

**The urgency of the problem.** One of the most urgent issues in the education system of our republic, which requires its own solution, is the problem of evaluating the competencies of students. Because teachers can more easily evaluate the theoretical abilities of students, but they have difficulty in evaluating their practical skills. This once again proves the relevance of the problem.

**Scientific novelty of the problem.** The research shows that the way learners approach learning tasks during competency assessment will depend on:

- the internal quality of the assessment form in use;
- the ways in which the assessor transforms the material to be assessed into the given format and selects appropriate assessment tasks and specific learning objectives for the subject
- from how learners explain the task and the content of the assessment.

**Practical significance of the problem.** This article can be used in the evaluation of the competence skills of the students.


**Reference**

1. 12-3: Competency and competency assessment / https: //extranet.who.int/lqsi/sites/default/files/attachedfiles/LQMS%2012-3%20Competency%20assessment.pdf
2. Cheryl Lasse. What is a competency assessment/ https://www.td.org/insights/what-is-a-competency-assessment
3. The basics of competency assessment and its importance / https://possibleworks.com/blog/basics-of-competency-ssessment/
4. What is a competency or skills assessment? https://www.thecompetencygroup.com/competency-services/competency-assessments/



**E-mail:** Qasanova_SVS@mail.ru



**Rəyçilər:** *ped.ü.fəls.dok.* **F.Ə. Rzayeva**
*ped.ü.fəls.dok., dos.* **A.X. Hacıyev,**
**Redaksiyaya daxil olub:** 13.03.2023

***TƏLİM TEXNOLOGİYALARI***
***ОБУЧАЮЩИЕ ТЕХНОЛОГИИ***
***LEARNING TECHNOLOGIES***

*UOT 372.854*

***Səfər Əmin oğlu Raziyev,***
*biologiya üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dövlət İqtisad Universitetinin (UNEC) Zaqatala filialı*

***Gülzar Nizam qızı Quliyeva,***
*kimya üzrə fəlsəfə doktoru, dosent*
*Sumqayıt Dövlət Universiteti*

***Sənubər Vüqar qızı Məmmədova***
*Sumqayıt şəhəri 2 nömrəli tam orta məktəbin ibtidai sinif müəllimi*

## FOTOSİNTEZ PROSESİNİN FƏNLƏRARASI İNTEQRASİYA İLƏ ÖYRƏDİLMƏSİ TƏCRÜBƏSİNDƏN

***Сафар Амин оглы Разиев,***
*доктор философии по биологии, доцент,*
*Закатальский филиал Азербайджанского Государственного Экономического Университета*

***Гюльзар Низам гызы Гулиева,***
*доктор философии по химии, доцент,*
*Сумгаитский Государственный Университет*

***Санубар Вугар гызы Мамедова,***
*учитель начальных классов полной средней школы № 2 города Сумгаит*

## ИЗ ОПЫТА ПРЕПОДАВАНИЯ ПРОЦЕССА ФОТОСИНТЕЗА ПУТЕМ МЕЖПРЕДМЕТНОЙ ИНТЕГРАЦИИ

***Safar Amin Raziyev,***
*doctor of philosophy in biology, associate professor,*
*Zagatala branch of Azerbaijan State Economic University*

***Gulzar Nizam Guliyeva,***
*doctor of philosophy in chemistry, associate professor*
*Sumgayit State University*

***Sanubar Vugar Mammadova***
*primary school teacher of complete secondary school No. 2 of the city of Sumgayit*

## EXPERIENCE OF TEACHING THE PHOTOSYNTHESIS PROCESS THROUGH INTERDISCIPLINARY INTEGRATION

**Xülasə.** Məqalədə fotosintez prosesinin fizika, kimya, biologiya və digər fənlərin inteqrasiyası və innovasiyalar kontekstində öyrədilməsi təcrübəsi araşdırılmışdır. Göstərilmişdir ki, fotosintezin fiziki, kim-

yəvi, bioloji mərhələlərinin olması onun tədris prosesində bu və digər fənlərin inteqrativ şəkildə tətbiqini və öyrənilməsini zəruri edir. Çünki inteqrasiyanın vəzifəsi təkcə fənlərin qarşılıqlı əlaqəsinin olduğunu göstərmək deyil, burada, həmçinin ətraf aləmin bütövlüyü haqqında öyrənənlərdə təsəvvür yaratmaq əsas məsələlərdən biridir.

***Açar sözlər:*** *innovasiya, inteqrasiya, təlim metodları, fotosintez, xloroplast*

**Резюме.** В статье исследован опыт преподавания процесса фотосинтеза в контексте взаимодействия и инноваций физики, химии, биологии и других дисциплин. Показано, что наличие физической, химической и биологической стадий фотосинтеза обуславливает необходимость комплексного применения и изучения этих и других предметов в его учебном процессе. Ведь задача интеграции состоит не только в том, чтобы показать, что предметы взаимосвязаны, но и в том, чтобы создать у учащихся представление о целостности окружающего мира.

***Ключевые слова:*** *инновация, интеграция, методы обучения, фотосинтез, хлоропласт*

**Summary.** In the article, the experience of teaching the process of photosynthesis in the context of interaction and innovation of physics, chemistry, biology and other disciplines was investigated. It has been shown that the presence of physical, chemical, and biological stages of photosynthesis necessitates the integrated application and study of these and other subjects in its teaching process. Because the task of integration is not only to show that subjects are interconnected, it is also one of the main issues to create an idea of the integrity of the surrounding world in learners.

***Key words:*** *innovation, integration, training methods, photosyntesis, chloroplast*

Bu gün məktəbdə fənlərarası əlaqələrin ənənəvi formada həyata keçirildiyi kimi, yalnız informasiya şəklində deyil, həm də fəaliyyət baxımından inteqrativ yönümdə tətbiq etmək lazımdır. Fəaliyyətlərin düzgün şəkildə tətbiq edilməsi üçün isə V.S. Bezrukova, M.N. Berulava, O.S. Qrebenyuk, V.S. Yelagina, I.D. Zvereva, V.G. İvanova, V.V. Kraevski, A.V. Teremova, G.F. Fedoretsinin əsərlərində ümumtəhsil məktəblərində əldə edilən biliklərin inteqrasiyası haqqında bəhs edərkən bu məsələlərə toxunulmuşdur.

Fənlərarası inteqrasiya tədris prosesində elmlərarası əlaqələri aşağıdakı şəkildə ifadə edir:




Adları qeyd olunan üsulların tədris təcrübəsində elmlərarası əlaqələrin həyata keçirilməsində, fənlərarası əlaqələrin qurulması prosesində tətbiq etmək təlimin keyfiyyətinə müsbət təsir göstərir.

Fənlərarası inteqrasiyanın həyata keçirilməsi zamanı didaktikanın diktə etdiyi təlim prinsipləri, məktəbin tərbiyəvi vəzifələri, öyrənmənin həyatla, ətraf aləmlə əlaqəsi, şagirdlərin əməli fəaliyyətə hazırlanması və s. xüsusi əhəmiyyət daşıyır.

Təhsildə fənlərarası əlaqəni həyata keçirməyin, reallaşdırmağın yolları çoxdur:

- müxtəlif fənlərin tədris materiallarından faktiki materialın hissə-hissə nəzərdən keçirilməsi;

– bir tsikl üzrə fənlər üzrə metabiliyi vurğulamaq;

- təhsil problemlərinin və fənlərarası xarakterli problemli vəziyyətlərin qoyulması fənlərarası layihələr xarakterli üsullarla həyata keçirilməsi ilə tətbiq edilməsi;

- bir fəndən digər fənnə, bir mövzudan digər mövzuya bilik ötürülməni təmin edən ümumi təhsil və ümumiləşdirilmiş bacarıqların formalaşdırılması;

- fənlərarası məzmunlu problemlərin həlli;

– inteqrasiya olunmuş və hərtərəfli dərslərin keçirilməsi;

– inteqrasiya olunmuş kursların həyata keçirilməsi (elektiv, seçmə, fakültativ və s.).

Müasir bir məktəbdə fənlərarası inteqrasiyanın rolu şagirdi həyata hazırlamağı hədəfləməkdədir, bunu həyata keçirməyin əsas yolları isə ayrı-ayrı fənlərin öyrənilməsi, bir mövzu ilə digər mövzu arasında əlaqəli anlayışlar vasitəsilə izah olunması, eləcə də fənlərarası problemləri həll edərkən və ya fənlərarası laboratoriya işlərinin yerinə yetirilməsi zamanı praktik bacarıqların qazanılmasıdır.

Fizika və kimyanın digər fənlərlə inteqrasiyasının spesifikliyi kursun məzmununu təhlil etməklə, təlim prosesində istifadə olunan metodistlər tərəfindən tövsiyə olunan formalar, metodlar və tədris vəsaitlərinin inteqrasiyanın həyata keçirilməsi ilə müəyyən edilə bilər,

Fizikanın tədrisi ilə əlaqəsi

kimya (kimya bölməsi – fiziki kimya – əslində, əsasən ehtiva edir fiziki bilik), əsasən konseptual – atom və onun quruluşu, bir çox ümumi kəmiyyətlər – maddənin miqdarı, molyar kütlə və s. əvvəllər kimyada öyrənilir, fizikadan daha çox maddənin elektron quruluşu, elektrik yüklərinin qarşılıqlı təsiri, elektroliz – fizikanın öyrənilməsində.

Fizika və kimya fənləri bir-biri ilə sıx bağlıdır, çünki bu fənlərin məzmununu əhatə edən mövzuların tədrisi zamanı bir problem üzərində öyrənilməyə başlayan bir məsələ başqa bir mövzuda davam edir və sonra digərində yenidən dərinləşir, məsələn, atomun quruluşu, dövri sistem, elektroliz qanunları, fotosintez və s.

Müasir kurikulumlarda inteqrativ xarakter daşıması bacarıq əsaslı təhsilinin inkişafına xüsusilə təkan verən məsələlərdəndir. Kuri-kulumlarda göstərilən təlim nəticələrində müxtəlif fənlərin, xüsusilə, kimya fənninin digər təbiət elmləri olan fizika və biologiya ilə inteqrasiyasının məqsədi bir-birini tamamlayan standartlar nəzərdə tutulmuşdur. Fənlərarası, fəndaxili və metafənn inteqrasiyanın köməyi ilə öyrənənlərdə dünyagörüşünün formalaşması da baş vermiş olur. Onlar ətraf aləmdə baş verən hadisələrin qavranılmasında müxtəlif elmlərin qanunauyğunluqlarının kompleks şəkildə tətbiqinin vacibliyini dərk edirlər. Bu cəhətdən fənlərarası əlaqənin rolunu xüsusi qeyd etmək lazımdır.

Fənlərarası inteqrasiyanın və innovasiyaların tədris prosesində tətbiqinin cəmiyyətimiz üçün hərtərəfli inkişaf etmiş, praktik vərdişlərə malik gənc nəslin formalaşmasında mühüm əhəmiyyəti vardır. Bu məqsədlə qruplarla iş təlim forması və müxtəlif təlim üsullarından istifadə etməklə fotosintezin öyrənilməsindən alınan nəticələr şagirdlərin iştirakı ilə analiz edilir. Biz bu prosesdə ətraf aləmdə baş verən fiziki və kimyəvi hadisələrin öz qanunauyğunluqlarına müvafiq olaraq bir-birlərini tamamladığını müşahidə edirik.

Təbiətin qüsursuz nizama malik olduğunun bariz nümunəsi olan fotosintezdəki bu proseslər elmlərin qarşılıqlı inteqrasiyada olduqlarını və bu prosesləri izah etməkdə bizə yardımçı olduğunu göstərir. Bütün proseslərin nəzəri cəhətdən öyrənilməsi və onun praktik surətdə həyata keçirilməsi öyrənənlərdə tətbiqi bacarıqların inkişafına müsbət təsir göstərir. Bu prosesdə quiziizz və kahoot və s. veb alətlərindən istifadə edilə bilər. Qrupların hər birinə müxtəlif tapşırıqlar onlayn və əyani şəkildə paylana bilər. Qruplar öyrədənin fasilitatorluğu ilə əqli hücum, Venn diaqramı, karusel və başqa metodlardan istifadə edərək tapşırıqların icrasını və bir-birlərinə ötürülməsini təmin edirlər.

Fotosintez prosesinin öyrənilməsində fənlərarası inteqrasiyanın tətbiqinin qaçılmazlığı onun mərhələlərinin ayrı-ayrı elm sahələrini birləşdirməsi ilə əlaqədardır. Belə ki, proses fotofiziki mərhələ ilə start götürür. İlk olaraq biz bu mərhələdə öyrənənlərə işığın yarpaqda olan xlorofilin nativ formaları tərəfindən udularaq bir-birinə və sonda reaksiya mərkəzlərinə ötürülməsi barədə məlumat veririk. Bəzən bu ötürülmə yolları ilə bioloji məhsuldarlıq arasında korelyasiyanın olması qənaətinə gəlməyə çalışılır. Bunun ardınca öyrənənlərin fotosintezin kimyəvi mərhələsinin olması üzrə biliklərini formalaşdırırıq.

Öyrənənlərə fizika kursunda yarımkeçiricilər mövzusunun kimyəvi rabitə ilə əlaqəli qazanılmış bilikləri xatırladılır. Burada, həmçinin prosesin fiziki və kimyəvi mərhələlərinin bir-birini izləməsinin məntiqi sonluqla, yəni stabil kimyəvi maddələrin əmələ gəlməsi ilə yekunlaşdığını qeyd edirik. Bundan sonra öyrənənlərin idrak səviyyəsinin yüksəldilməsi üçün fotosintez prosesinin yekununda nə baş verdiyini və prosesin təbiət fənlərinin inteqrasiyası kontekstində başa düşülməsinə nail olmağımız üçün tədqiqatımızın praktik mərhələsinə keçirik. Belə ki, öyrənənləri qruplarla təlim formasından istifadə edərək bu prosesi öyrənmələri üçün onlara tam sərbəstlik veririk. Sayma üsulundan və yaxud onların təklif etdiyi digər üsullardan birindən istifadə edərək öyrənənləri daha effektiv praktik nəticə qazanmaları üçün dörd qrupa bölürük.

Qruplar üzrə praktik işlərin görülməsi aşağıdakı mərhələlər üzrə həyata keçirilir:

1) Motivasiya, problemin qoyuluşu, problem situasiyanın yaradılması;
2) Tədqiqatın aparılması;
3) İnformasiya mübadiləsi;
4) İnformasiya müzakirəsi;
5) Nəticə və ümumiləşdirmə;
6) Yaradıcı tətbiqetmə;
7) Qiymətləndirmə və refleksiya.

Öyrədən bu prosesdə didaktikanın əyanilik, şüurluluq, ardıcıllıq, müvafiqlik və s. prinsiplərindən istifadə edir. Qiymətləndirmə prosesində meyarlar olaraq fəallıq, əməkdaşlıq, tərtibat, təqdimatdan istifadə edilir nəticəsində baş verən proseslərin bir-birini tamamladığını və bizi əhatə edən aləmdəki hadisələrin bütövlükdə öyrənilməsinin vacibliyini göstərir. Əks halda biz bu proseslərdən öz məqsədlərimiz üçün istifadə edə bilmərik. Elmlər arasında olan bu genetik əlaqə onların vahid nöqtədən başlayaraq inkişaf etdiyini, sonra şaxələndiyini, daha sonra isə yenidən birləşərək yeni elm sahələrini meydana gəldiyini müşahidə edirik. Məsələn, biofizika, biokimya, bioenergetika və s. kimi elm sahələri qarşılıqlı vəhdət təşkil edərək fotosintez prosesinin öyrənilməsini həyata keçirirlər. Bu da fənlərarası inteqrasiyanın köməyi ilə bu və ya digər prosesləri öyrənərək insan cəmiyyəti üçün istifadə edilməsində nə dərəcədə əhəmiyyət kəsb etdiyini göstərir.

Qrupların təqdimatından sonra qiymətləndirmə prosesi başlanır. Qiymətləndirmə həm öyrədən tərəfindən quizizz saytı ilə, həm də qrupların bir-birini də qiymətləndirməsi ilə aparılır. Yekunda müəllimin apardığı frontal sorğulara əsasən həm fərdi, həm də qruplara bütövlükdə qiymət verilir. Bu da gənclərin gələcəkdə kollektiv işə vərdiş etmələri, eyni zamanda, özlərinə inamın formalaşmasında mühüm rol oynayır. Tədqiqatların gələcəkdə müxtəlif elm sahələrində ayrı-ayrı aktual mövzular üzrə davam etdirilməsi planlaşdırılır.

**Problemin aktuallığı.** Prosesin modelləşdirilməsinin müasir təlim forma və üsullarına əsasən tətbiqi imkanlara malik olduğu üçün xüsusi əhəmiyyət kəsb edir.

**Problemin elmi yeniliyi**. Müasir təlim metodları və fənlərarası inteqrasiyanın birgə tətbiqi cəmiyyətimizdə əsas məsələlərdən olan praktik vərdişlərə malik gənc nəslin yetişdirilməsində mühüm rol oynayır.

**Praktik əhəmiyyəti və tətbiqi.** Məqalə kimya, fizika və biologiya müəllimlərinin təlim prosesində inteqrasiyanın qurulmasına düzgün yanaşmasına müsbət təsiri olacaqdır.

**Ədəbiyyat:**

1. Paşayev P.A., Təbiət elmlərinin əlaqəli öyrənilməsi. / P.A. Paşayev -Bakı: Maarif, -1977. -107 s.
2. Разиев С.Э., Первичные процессы фотосинтеза у различных по продуктивности сортов твердой пшеницы. -Москва, 1988. -22 с.
3. Həşimov X.X., Fizika kursunda “Yarımkeçiricilər” mövzusunun kimyəvi rabitə ilə əlaqəli tədrisi: Avtoreferat., -Bakı. -22 s.

4. Quliyeva G.N., Seyidova Ə.N. Kimya fənninin müasir təlim üsulları ilə tədrisi. SDU-nun Elmi xəbərləri. 2020, № 3, --s. 94-97
5. Мирзаева М. М., Гайдаев А. А. Методика осуществления межпредметной интеграции физики с дисциплинами естественнонаучного цикла при обучении физике в школе. Известия ДГПУ. Т. 11, -2017. № 1, -s. 98.

**E-mail:** q.gulzar@mail.ru
**Rəyçilər:** *tex.ü.fəls.dok., dos*. **F.Ə. Mirzəyev,**
*kim.ü.fəls.dok.* **V.N. Əhmədov**
**Redaksiyaya daxil olub:** 28.02.2023

*UOT 37.0*

***Mehriban Ağa qızı Həsənova,***
*Gəncə Dövlət Universitetinin dosenti*

***Leyla Elçin qızı Mehdiyeva***
*Gəncə Dövlət Universitetinin müəllimi*

# MÜASİR PROQRAMLAŞDIRMA DİLLƏRİNİN MÜQAYİSƏLİ ÖYRƏDİLMƏSİ İMKANLARI

***Мехрибан Ага гызы Гасанова,***
*доцент Гянджинского Государственного Университета*

***Лейла Эльчин гызы Мехтиева***
*преподаватель Гянджинского Государственного Университета*

# СРАВНИТЕЛЬНЫЕ ОБУЧАЮЩИЕ ВОЗМОЖНОСТИ СОВРЕМЕННЫХ ЯЗЫКОВ ПРОГРАММИРОВАНИЯ

***Mehriban Agha Hasanova,***
*associate professor at Ganja State University*

***Leyla Elchin Mehdiyeva***
*lecturer at Ganja State University*

# COMPARATIVE LEARNING POSSIBILITIES OF MODERN PROGRAMMING LANGUAGES

**Xülasə:** Kompüterlərin fəaliyyətinin əsasını təşkil edən həm sistem, həm də tətbiqi proqram vasitələri bilavasitə proqramlaşdırma dillərinin köməyi ilə yaradılır. Azərbaycanda yeni, yüksək səviyyəli və savadlı proqramçılar nəslinin yetişməsi ölkəmiz üçün son dərəcə aktual və vacib olan bir məsələdir. Bunun üçün Respublikamızın ali məktəblərində və digər tədris ocaqlarında proqramlaşdırma dilləri və alqoritmlər nəzəriyyəsi fənlərinin tədrisini yüksək səviyyəyə qaldırmaq lazımdır. Məqalədə tədrisin keyfiyyətinin artırılması yolları, bütün tədris müəssisələrində istifadə oluna bilən müasir tələblərə cavab verən iş üsullarının seçilməsi və öyrədilməsi xüsusiyyətləri şərh edilmişdir.

***Açar sözlər:*** *tədrisin keyfiyyəti, iş üsulları, proqramlaşdırma dilləri, müqayisəli öyrətmə*

**Резюме.** Как системное, так и прикладное программное обеспечение, являющееся основой деятельности компьютера, создается непосредственно с помощью языков программирования. Воспитание нового поколения высококлассных и образованных программистов в Азербайджане является чрезвычайно актуальным и важным вопросом для нашей страны. Для этого необходимо поднять на высокий уровень преподавание языков программирования и теории алгоритмов в вузах и других учебных заведениях нашей Республики. В статье описаны пути повышения качества обучения, особенности выбора и обучения методов работы, отвечающих современным требованиям, которые можно использовать во всех учебных заведениях.

***Ключевые слова:*** *качество обучения, методы работы, языки программирования, сравнительное обучение*

**Summary.** Both system and application software, which are the basis of computer activity, are created directly with the help of programming languages. Raising a new generation of high-level and educated programmers in Azerbaijan is an extremely urgent and important issue for our country. For this, it is necessary to raise the teaching of programming languages and theory of algorithms to a high level in higher schools and other educational institutions of our Republic. In the article, the ways of improving the quality of

teaching, the features of selecting and teaching working methods that meet modern requirements that can be used in all educational institutions are described.

***Key words:*** *teaching quality, working methods, programming languages, comparative teaching*

Müasir zamanda cəmiyyətdə kompüter proqramlarına olan ehtiyac durmadan artmaqdadır. Tələb olunan proqram vasitələri getdikcə daha böyük həcmə və mürəkkəblik dərəcəsinə malik olur. Belə yüksək tələbatlara cavab verən proqramların aşağı səviyyədə təhsil almış mütəxəssislər tərəfindən hazırlanması mümkün deyildir. Bu isə, öz növbəsində, bir sıra müəssisələrin və şirkətlərin xaricdən olduqca yüksək qiymətlərə proqram vasitələri almasına gətirib çıxarır. Bütün bunların qarşısını almaq üçün ölkəmizdə günün tələblərinə cavab verən, beynəlxalq səviyyəli proqramçı mütəxəssislər yetişdirilməlidir. Bunun üçün isə tədrisin keyfiyyətinin artırılması yolları ciddi surətdə öyrənilməli və təcrübəli müəllimlərin uğur gətirən, müasir tələblərə cavab verən iş üsulları bütün tədris müəssisələrində istifadə olunmalıdır.

Proqramlaşdırma dillərinin hər biri müxtəlif sahələr üçün lazım olur. Onların müqayisəli şəkildə öyrənilməsi üçün hər bir proqramlaşdırma növünə aid sadə proqramlarla tanış olaq:

```
int main () {
start:
float eded1, eded2;
int emeliyyat;
std::cout<<"1-ci eded:";
std::cin>>eded1;
std::cout<<"2-ci eded:";
std::cin>>eded2;
std::cout<<"Emeliyyat:
(Toplama-1,Cixma-2, Vurma-3, Bolme-4)";
std::cin>>emeliyyat;
switch(emeliyyat) {
case :{
std::cout<<"Netice:";
toplama(eded1,eded2);
break;
}
case 2: {
std::cout<<"Netice:";
cixma(eded1,eded2);
break;
}
case 3: {
std::cout<<"Netice:"; vurma
(eded1,eded2);
break;
}
case 4:{
std::cout<<"Netice:";
bolme(eded1,eded2);
break;
}
default:{
system("CLS");
std::cout<<"Emeliyyat sehvdir. Xahis
olunur duzgun daxil edin\n";
goto start;
}
getch();
}
```

Bu C++ dilində hesab operatorlarının işləmə qaydasıdır.

Python proqramlaşdırma dilindən, əsasən, hesab əməliyyatları aparmaq üçün istifadə olunur. Python dilində ixtiyari iki ədədin toplanması qaydasına baxaq:

```
>>> a = 15
>>> b = 20
>>> c = a + b
>>> print(c)
35
```

Göstərilən hesab əməllərinə pascal üzərində də nəzər yetirək:

```
Proqram toplamaq;
{$APPTYPE CONSOLE}
Uses aacrt;
var x,y,z: integer;
procedure topintege;
begin
z:=x+y;
end;
begin
x:=100; y:=300;
toplam;
writeln(z);
readln;
{ TODO -oUser -cConsole Main : Insert
code here }
End.
```

Proqramlaşdırma dillərinin hər birinin istifadə sahəsi var və buna görə də onların hər birində eyni əməllər müxtəlif cür həyata keçirilir. Proqramların hər birinə məxsus struktur quruluşları vardır. Proqramlaşdırma dilləri proqramçılar yetişdirmək məqsədi daşıyan proqramların kurikulumlarının ən mühüm komponentlərindən birini təşkil edir. Müasir ixtisaslı proqramçı üç və ya hətta dörd proqramlaşdırma dilini bilməlidir. Eyni zamanda, hər dəfə hansı dilləri öyrənmək və hansını buraxmaq barədə seçim etmək lazımdır. Bir tərəfdən, belə kursların çoxlu "müştəriləri" var – bir çox sonrakı kurslar tələbələrin müəyyən proqramlaşdırma dilləri üzrə biliklərinə əsaslanır. Digər tərəfdən, konkret dillərin öyrənilməsi universiteti bitirdikdən sonra gələcəkdə digər dillərin öyrənilməsini asanlaşdırmalıdır. Təəssüf ki, bütün dillər belə məqsədlər üçün uyğun deyil. Onlardan bəziləri özlüyündə bir fayda vermir, hətta başqa dillərin öyrənilməsinə zərər verir. Ona görə də burada proqramlaşdırma dillərinin müqayisəli tədrisinə bir neçə ümumi yanaşma təqdim edəcək və onların güclü və zəif tərəflərini müzakirə edəcəyik. Burada proqramlaşdırma dillərinin tədrisi və istifadəsi ilə bağlı kurikulum komponentlərinin formalaşmasında istifadə oluna biləcək meyarlar da təhlil ediləcəkdir.

*Analiz.* Peşəkar proqramçı adətən bir neçə proqramlaşdırma dilini mükəmməl bilir. Ancaq bir proqramçıya bütün dilləri əvvəlcədən öyrətmək mümkün deyil. Öyrənmə prosesində yeni dillər yarana bilər və ya bəzi dillər qəfildən populyarlaşa bilər. Bu şərtlər altında, ən "tipik" dillər mütləq ən uyğun dillər deyil, yeni proqramlaşdırma dillərinin inkişafını asanlaşdıran tədris edilməlidir. Proqramlaşdırma dili bir vasitədir, düşüncəni ifadə etmək üsulu və hətta düşüncə tərzidir. Bundan əlavə, proqramlaşdırma dili də müəyyən iş tərzidir. Proqramlaşdırma dillərini öyrədərkən proqramların yazı üslubunu, daha çox hansı konstruksiyalardan istifadə edildiyini və onların bir-biri ilə necə əlaqəli olduğunu da öyrətmək lazımdır.

Bir çox proqramlaşdırma dilləri də öyrənmə vasitəsi kimi istifadə oluna bilmələri baxımından qiymətləndirilməyə başlayır. Öyrənmək üçün çox istifadə olunan iki dili nəzərdən keçirin. Məsələn, biz müxtəlif sahələrdə mütəxəssislər hazırlayarkən Python dili proqramlaşdırma dili kimi idealdır. Ancaq proqramçıların hazırlanması üçün ondan istifadə etməməlisiniz. Python, 90-cı illərin əvvəllərinə aid köhnə sintaksisi olan bir dildir. Onun çatışmayan əsas cəhəti kod yazmaq üçün həddindən artıq sərbəst istifadə edilən olmasıdır. Bundan əlavə, Pythondan başqa bir dilə keçmək əksinə getməkdən qat-qat çətin və təhlükəlidir.

C++ dilinin öyrədilməsində də proqramçıların çətinlikləri və problemləri vardır. Bu, daim inkişaf edən və tam öyrənilməsi çətin olan mürəkkəb bir dildir. Onun köməyi ilə "işləyən", lakin səhv proqram yazmaq asandır. Tətbiq olunan problemlərin həllinə tez keçmək və onları aradan qaldırmaq, demək olar ki, mümkün deyildir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin İnformatika müəllimliyi ixtisasında I kurs tələbələri arasında sorğu keçirilmiş, "hansı proqramlaşdırma dillərini bilirsiniz?" sualı qoyulmuş, əksəriyyəti bilmədiklərini, bəziləri də Python və Pascal dilindən bir qədər bildiklərini söyləmişlər. Gəncə Dövlət Universitetinin İnformatika müəllimliyi ixtisasında yeni qəbul olunmuş I kurs tələbələri arasında sorğu keçirilmiş, hansı proqramlaşdırma dillərini bilirsiniz sualı qoyulmuş, demək olar ki, bütün tələbələr bilmədiklərini söyləmişlər. Sankt-Peterburq Dövlət Universitetinin Riyaziyyat və kompüter elmləri fakültəsinə yeni qəbul olunmuş I kurs tələbələri arasında hansı proqramlaşdırma dillərini bildikləri ilə bağlı sorğu keçirilib. Əksəriyyəti C və ya C++ dilini bilir, yarısından çoxu Python dilini bilir. Bu halda hər kəsin xəbərdar olduğu dili öyrətmək mümkündür. Amma bunu tələbələrin neçə faizi bildiyi, nə dərəcədə bildiyi bəlli deyil. Kod yazmaq üçün peşəkar yanaşmalara yenidən öyrətmək mümkündür, lakin bu, olduqca çətindir və bundan əlavə, hər kəs yenidən təlim keçməyə razı olmayacaq. Bəs ümumiyyətlə, proqramlaşdırmağı bilməyənlər və ya başqa dildə təhsil alanlar necə? Bəlkə də bu problemlərin həlli tələbələrə daha az tanış olan proqramlaşdırma dillərini öyrətmək olacaq, məsələn, PascalABC.NET, Julia, Kotlin kimi dillər olacaq. Eyni zamanda, onlara proqram kodu yazmaq üçün möhkəmləndirilmiş biliklər vermək lazımdır. Kod yazmaq üçün davamlılıq, çeviklik, daşınma qabiliyyəti, təkrar istifadə edilə bilmək, oxuyub sınaqdan keçirilə bilmək, başa düşmək qabiliyyətləri lazımdır. Bəzi insanlar Ja-

vanın əsas obyektyönlü proqramlaşdırma dili olduğu üçün öyrədilməli olduğunu düşünür. Bu baxış artıq 20 ildən yuxarıdır ki, köhnəlmişdir. Belə bir fikir də yayılmışdır ki, Javascript və ya PHP-ni öyrətmək lazımdır, çünki onları bilməklə tələbələr tez bir zamanda şirkətlərdə işə başlaya bilərlər, lakin universitetlər bu dillərin öyrədilməsində maraqlı deyillər. Bəziləri isə tələbələrin hər şeyin içəridən necə işlədiyini bilməsi üçün montaj dili olan C ilə aşağı səviyyədən başlamağı təklif edir. Bəzi metodistlər Haskell-də funksional proqramlaşdırma ilə başlamağı da təklif edir. Bəs bu bilik sonradan, o cümlədən digər proqramlaşdırma dillərinə keçərkən tələbə üçün faydalı olacaqmı?

Hər bir təhsil proqramı və ya müəllim tədris olunan proqramlaşdırma dilləri ilə bağlı öz seçimini edir ki, bu da bir çox amillərdən asılıdır. Bu seçimin sonrakı öyrənməyə necə təsir edəcəyi, öyrənilən proqramlaşdırma dilinin sonrakı fənlərdə necə tətbiq ediləcəyi barədə düşünmək lazımdır. Proqramlaşdırma dilləri hamısı fərqlidir və bizi fərqli düşünməyə vadar edir. Proqramlaşdırma bacarıqları sadəcə olaraq bir dildən digərinə daşınmır.

Rusiyanın bəzi universitetlərində (məsələn, Sankt Peterburq Dövlət universitetində) birinci ilin ikinci semestrində Kotlin dilində layihələr, o cümlədən komanda şəklində həyata keçirilir. Tələbələr sənaye problemlərinin həllinə yaxınlaşırlar. C++ da tam sürətdə öyrənilir və eyni zamanda “Alqoritmlər və məlumat strukturları” kursu başlayır. Bu cür yanaşma da səmərəlidir.

İkinci kursda tələbələrin fəaliyyətlərini genişləndirmək vəzifəsi qoyulur, üçüncü semestrdə isə Haskell dilini öyrənirlər. Dördüncü semestrdə riyazi məntiq kursunun bir hissəsi olaraq Proloq məntiqi proqramlaşdırma dili öyrənilir. "Maşın Öyrənmə" fənni üzrə təhsilin üçüncü ili Python-dan istifadə edir. 5-ci semestrdən 8-ci semestrədək tələbələrə seçmə fənlər təklif olunur: Python, Scala, Java, C#, Rust, Javascriptm PHP.

İnformasiya Texnologiyaları ixtisaslarına artan tələbat Python proqramının öyrənilməsinin də inkişafına səbəb olmuşdur. İnformasiya Texnologiyaları sahəsində ilk addımlar atdıqda belə internetdə Pythonun yeni başlayanlar üçün nisbi sadəliyi haqqında mübahisə və dilin geniş əhatə dairəsi haqqında məqalələrə rast gəlinir. Tədqiqat işlərindən tutmuş oyunların təşkilinə qədər məsələlər bu proqramlaşdırmanın köməyi ilə həll edilə bilər. Buna görə də, Python öyréniləcək ilk proqramlaşdırma dili kimi getdikcə daha çox seçilir. Qısa sintaksisə malik olması da ona sadəliyi baxımından üstünlüklər gətirir. Məsələn, kod blokları mötərizədə deyil, abzaslarla ayrılır ki, bu da sətirlərin və simvolların sayını azaldır. Sintaktik konstruksiyalar da var ki, onların tətbiqi əlavə kod əvəzinə bütün rutin yaddaş və mövzu idarəetmə tapşırıqlarını Python tərcüməçisinə verməyə imkan verir. Bunun sayəsində tərtibatçı kodun özünə deyil, tapşırıqlara diqqət yetirə bilər.

Bu siyahıya bir sıra digər aspektləri də əlavə etmək olar.

Psixoloji aspekt dedikdə tələbənin proqramlaşdırmaya olan həvəsinin artırılması, öyrənmə prosesi zamanı meydana çıxan çətinliklərin öhdəsindən gəlmək üçün cəsarətin, dözümlülüyün, çalışqanlığın və s. psixoloji amillərin formalaşdırılması başa düşülür. Burada tələbənin həvəsini artırmaq üçün nümunəvi proqramla nümayiş olunmalı və məşhur proqramçılar barədə maraqlı məlumatlar verilməlidir. Maraq dairəsini artırmaq və gücləndirmək üçün əlavə dərslər, dərnəklər, klublar təşkil olunmalıdır. Yüksək nəticə əldə etməsi üçün tələbə bu fənni sevməli və vaxtının çox hissəsini maraqlı və çətin proqramların hazırlanması işinə həsr etməlidir.

Proqramlaşdırma sahəsində həqiqi biliklər dedikdə müəyyən bir proqramlaşdırma dilinin tam mənimsənilməsi, dilin çətin və abstrakt hissələrinin öyrənilməsi, onun köməyi ilə mürəkkəb alqoritmlər üçün böyük həcmli proqram tərtib etmə bacarığı başa düşülür. Başqa sözlə, təhsil almış tələbə yüksək səviyyəli mütəxəssisə çevrilməlidir. Burada yalnız elementar səviyyəli, primitiv proqramlar tərtib etməklə kifayətlənmək olmaz. Tədrisə rəhbərlik edənlər isə onun keyfiyyəti haqqında düşünməlidirlər. Natamam öyrənmə tələbələrin sonrakı fəaliyyətlərində böyük çətinliklərlə üzləşməsinə səbəb olur.

Proqramlaşdırma dillərini öyrədərkən müqayisəli öyrətmə metodu ən faydalı metodlardan biridir. Tədris olunduğu təhsil pilləsindən asılı olmayaraq, bu metod öyrənmək üçün ən əlverişlisidir. Məlumdur ki, insan beyni hər hansı iki anlayışı müqayisəli şəkildə öyrəndikdə həm

qavrama prosesi daha asan olur, həm də uzun müddət yadda qalır. Müqayisəli metod zamanı tədqiq olunan obyektin müqayisə olunacaq obyektlə arasında oxşarlıq və ya fərqləri tapmaq lazım gəlir. Bu zaman obyektlərin ümumi və xüsusi əlamətləri aşkar edilir, fərqlər və ya dəyişikliklər müəyyən edilir, onların inkişaf meylləri və qanunauyğunluqları öyrənilir. İnformatika müəllimliyi ixtisasında oxuyan tələbələrə proqramlaşdırmanı öyrədərkən oxşar xarakteristik dillərdən biri üzərində müqayisəli şəkildə digəri öyrədilərsə, bu biliklər daha yaddaqalan olacaq və onların peşə hazırlığı yüksələcəkdir.

Ümumiyyətlə, tədris prosesinə kompleks şəklində yanaşmaq lazımdır. Bu o deməkdir ki, yuxarıda göstərilən aspektlərin hər biri öyrənilməli və ayrıca bir istiqamət kimi inkişaf etdirilməlidir.

**Problemin aktuallığı.** Azərbaycanda yeni, yüksək səviyyəli və savadlı proqramçılar nəslinin yetişməsi ölkəmiz üçün son dərəcə aktual və vacib olan bir məsələdir. Bunun üçün Respublikamızın ali məktəblərində və digər tədris ocaqlarında proqramlaşdırma dilləri və alqoritmlər nəzəriyyəsi fənlərinin tədrisini yüksək səviyyəyə qaldırmaq lazımdır. Məqalədə bu istiqamətdə məsələlərə toxunulduğu üçün onun aktuallığı aydın olur.

**Problemin elmi yeniliyi** tədris olunduğu təhsil pilləsindən asılı olmayaraq, proqramlaşdırma dillərini öyrədərkən müqayisəli öyrətmə metodunun ən faydalı və əlverişli metodlardan biri kimi göstərilməsidir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə göstərilən metoda istinad edərək ali və orta məktəb müəllimləri tədrisin keyfiyyətinin artırılmasına nail ola bilərlər. Eləcə də məqalədə baxılan məsələlər daha da genişləndirilərək gənc elmi tədqiqatçılar üçün araşdırma sahəsinə çevrilə bilər.

**Ədəbiyyat:**


1. Oliveira F.S., Santos S.C., (2018), PBL in the teaching of computer networks: The role of LMS PBL-Maestro in the management and authenticity of the learning environment, *Computer Applications in Engineering Education,* 4, -959-979.
2. Pavlovskaya S.V., Sirotkina N.G., (2014), Analysis of project activity experience in teaching management disciplines in higher education institutions (in Russian), *Modern Problems of Science and Education,* 4, https://science-education.ru/ru/article/view?id=13864
3. Petrova V.N., (2017), Potential of problem based learning technology in high school practice, *Siberian Journal of Psychology*, 65, 112–124.
4. Гасанова М.А., **(**2018), Характеристика компетентностных категорий. Материалы IX Международной научно-практической конференции по теме «Модернизация системы непрерывного образования», - Дербент, Республика Дагестан, -с.77-79.
5. Hasanova M. A., Positive factors realizing Pedagogical competences of teachers in Azerbaijan education. Colloquium-journal miedznarowe czasopismo naukowe, № 5(16), -Warszawa, Polska, 2018,- p.31-32
6. Pozdeeva S.I., (2016), Problem and problem-based learning the comparative analysis, *Siberian pedagogical* Journal, 2, -95-99.
7. Андреев А.А. Некоторые проблемы педагогики в современных информационно-образовательных средах // Инновации в образовании. -2004. № 6, -с. 98 – 113.
8. Pustokhina, I., Seraj, A., Hafsan, H.,Mostafavi, S. M., & Alizadeh, S. M. (2021). Developing a RobustModel Based on the Gaussian Process Regression Approach to Predict Biodiesel Properties. International Journal of Chemical Engineering, vol. 2021, Article ID 5650499, 12 pages, -2021. https://doi.org/10.1155/2021/5650499
9. Yakimova T.B., Artcer T.V., Zhavoronok A.V., (2017), *Trends and Prospects of Blended Learning at Technical Universities,* 11th International Technology, Education and Development Conference (INTED2017), IATED Valencia, Spain, -1463-1467.


**E-mail:** n.leyla95@mail.ru
**Rəyçilər:** *ped.elm.dok., prof.* **Ə.Q. Pələngov**
*filol.ü. fəls.dok., dos.* **Ə.Ə. Aslanov**
**Redaksiyaya daxil olub:** 06.03.2023

*UOT 37.0*

***Xalidə Ağadadaş qızı Talıbova***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetin Cəlilabad filialının müəllimi*

# ÖZÜNÜTƏRBİYƏNİN YENİYETMƏLƏRDƏ TƏLİM FƏALİYYƏTİNƏ TƏSİR İMKANLARI

***Халида Агададаш гызы Талыбова***
*доктор философии по педагогике,*
*преподаватель Джалилабадского филиала*
*Азербайджанского Государственного Педагогического Университета*

# ВОЗМОЖНОСТИ ВЛИЯНИЯ САМОВОСПИТАНИЯ НА ОБУЧАЮЩУЮ ДЕЯТЕЛЬНОСТЬ ПОДРОСТКОВ

***Khalida Aghadadash Talibova***
*doctor of philosophy in pedagogy, lecturer at the Jalilabad branch*
*of the Azerbaijan State Pedagogical University*

# POSSIBILITIES OF INFLUENCE OF SELF-EDUCATION ON TEACHING ACTIVITY IN YOUTHS

**Xülasə**. Şəxsiyyətin inkişafının, onun intellektual bacarıqlarının və ictimai özünüdərkin müəyyən mərhələsində yeniyetmə yalnız xarici məqsədlərini deyil, həm də öz tərbiyəvi məqsədlərini başa düşməyə başlayır. O, özünə tərbiyə subyekti kimi yanaşır və özünütərbiyə etməyə çalışır. Şəxsiyyətin formalaşmasında özünəməxsus olan bu yeni faktorun meydana gəlməsi ilə insan özü tərbiyəçi olur.

Məqalədə özünütərbiyənin təlim fəaliyyətində öyrədilməsinin yollarından bəhs olunur.

***Açar sözlər**:`şəxsiyyət, özünütərbiyə, təlim fəaliyyəti, cəmiyyət, yeniyetmə*

**Резюме.** На определенном этапе развития личности, ее интеллектуальных способностей и социального самосознания подросток начинает понимать не только свои внешние цели, но и воспитательные цели. Он относится к себе как к субъекту образования и пытается заниматься самообразованием. С появлением этого нового фактора, уникального в формировании личности, человек становится воспитателем.

В статье говорится о способах воспитания самодисциплины в учебной деятельности.

***Ключевые слова:** личность, самовоспитание, воспитательная деятельность, социум, подросток*

**Summary.** At a certain stage of personality development, his intellectual skills and social self-awareness, the teenager begins to understand not only his external goals, but also his educational goals. He treats himself as a subject of education and tries to educate himself. With the emergence of this new factor, which is unique in the formation of personality, a person becomes an educator.

The article talks about the ways of teaching self-discipline in training activities.

***Key words:** personality, self-education, educational activity, society, teenager*

Həyat yolunun bütün mərhələlərində insanın öz qarşısında qoyduğu məqsədlərə nail olması üçün o, həmişə çətinliklərlə mübarizə aparmalı olur. Bəzən insan çətinliklər qarşısında geriyə çəkilməli, öz iddia səviyyəsini endirməli olur və bunu bir uğursuzluq sayaraq iztirab çəkir. Çətinliklərin aradan qaldırılmasında, məqsədə çatmaq üçün iradi səy göstərilməsində möhkəm əqidənin, həyat məsələləri haqqında yetkin, kamil görüşlərin və əsil insan ləyaqətinin böyük əhəmiyyəti vardır.

Şəxsiyyətin inkişafının, onun intellektual bacarıqlarının və ictimai özünüdərkin müəyyən mərhələsində yeniyetmə yalnız xarici məqsədlərini deyil, həm də öz tərbiyəvi məqsədlərini başa düşməyə başlayır. O, özünə tərbiyə subyekti kimi yanaşır və özünütərbiyə etməyə çalışır. Şəxsiyyətin formalaşmasında özünəməxsus olan bu yeni faktorun meydana gəlməsi ilə insan özü tərbiyəçi olur.

Şagirdlərin tərbiyə prosesini idarə etmək üçün tərbiyənin təsiri altında onların şəxsiyyətində baş verən dəyişiklikləri nəzərə almaq imkanının olması lazım gəlir. Başqa sözlə, şagirdlərin tərbiyəlilik səviyyəsini aşkara çıxarmaq imkanımız olmasa, tərbiyə problemini idarə etməyimiz də mümkün olmaz. Özünütərbiyə insanın şüurlu olaraq qarşısına qoyduğu məqsədə, ideal və inamlarına müvafiq şəkildə öz şəxsiyyətində dəyişikliklər etməyə yönəlmiş fəaliyyətindən ibarətdir.

Prof. M.C. Məhərrəmov yazır: "Özünütərbiyənin müvəffəqiyyəti üçün əsas şərtlərdən biri adamın özünü dərk etməsi, müsbət və mənfi cəhətlərini görə bilməsi, özünə tənqidi yanaşmanı bacarmasıdır. Bu da başlıca olaraq, yeniyetmə yaşlarından başlayaraq təzahür edir. Bunun üçün adamın özünün özünə obyektiv yanaşa bilməsi tələb olunur. Bu həm çətin, həm də çox mühüm bir məsələdir. Bu, adamdan yüksək əqli və əxlaqi inkişaf tələb edir" [1, s.75].

Özünütərbiyənin həyata keçməsi üçün şəxsiyyətin və onun özünü dərk etməsinin müəyyən inkişaf səviyyəsinin, özünün hərəkətlərini başqalarının hərəkətləri ilə müqayisə zamanı təhlildən istifadə edə bilmək qabiliyyətinin, eləcə də daim özünütəkmilləşdirmək tələb edilir. Şəxsiyyətin özünütəkmilləşdirilməsi onun cəmiyyətdəki həyati tələbatları və fəaliyyəti, inkişafı ilə şərtlənir. İctimai həyatı, eləcə də onu əhatə edən mühitin tələblərini, öz qüvvə və imkanlarını aydın dərk etmək əsasında yeniyetmənin öz həyatını daha münasib əsaslar üzrə qurmaq üçün arzu etdiyi keyfiyyətləri özündə inkişaf etdirməsi və ya malik olduğu şəxsi keyfiyyətləri dəyişdirməkdən ötrü özünə şüurlu, planlı, məqsədəuyğun və müntəzəm surətdə təsvir etməsi, rəftar və davranışını təkmilləşdirmək qayğısına qalması özünütərbiyə adlanır.

Üç əsas komponentdən ibarət olan təlim-tərbiyə prosesini seçdik: 1) yeniyetmə yaşlı şagirdi tədris fəaliyyətində özünütərbiyə etmək mümkündür; 2) müəllimin müəyyən pedaqoji şəraitin yaradılması yolu ilə özünütərbiyə prosesini idarə edilməsi imkanlarına çıxarda bilər; 3) dərs müəllim və şagirdin fəaliyyətinin təşkilinin əsas forması kimi şagird şəxsiyyətinin tədrisi, tərbiyəsi və inkişafı məsələlərinin həlli üçün sistematik şəkildə tətbiq olunur. Dərsin bütövlükdə tədris forması kimi çıxış etdiyini nəzərə alaraq, biz daha çox onu yalnız müəyyən bilik, bacarıq və vərdişlərin mənimsənilməsinə deyil, həm də şagirdlərin maraq, qabiliyyət və motivlərinin inkişafına yönəlmiş təlimin təşkili forması kimi qiymətləndiririk.

Tədris-tərbiyə prosesinin təşkilinin əsas forması olan dərsdə onun bütün komponentləri təqdim olunur: tədris fəaliyyətinin məqsədi, məzmunu, metodları, vasitələri, təşkili formaları, idarəetmə fəaliyyəti və nəticəsi.

Əgər dərs məqsədlərinin tədris-tərbiyə prosesinin tərkib hissəsi kimi yönümlülüyünü təhlil etsək, müəllimin fəaliyyət məqsədlərinin şagirdin formalaşmasına təsiri danılmazdır. Deməli, bütün hallarda müəllimin planlaşdırdığı dərsin məqsədi, şagirdin biliyinin, bacarığının, dəyərlərinin konkret mütərəqqi dəyişməsi planlaşdırılır – bütün bunlar daxilən şagirdin özünüidarəetmə qabiliyyətinin inkişafını müəyyən edir və onu tədris prosesində subyekt mövqeyinə çıxarır. Beləliklə, şagirdin özünütərbiyəsi dərsin hədəfi olur.

Müəllim bilavasitə tədris fənninin məzmunu ilə işləyir, materialın öyrənilməsi ardıcıllığını, onun bölmələrə bölünməsini müəyyən edir. Müəllim biliklərin mənimsənilməsi prosesini təşkil edərək və onların praktiki tətbiqi bacarıqlarını formalaşdıraraq, bu prosesdə şagirdlərin iradəsinin formalaşmasına da təsir edə bilər. Əgər öyrənilmiş material şagirdlə özü ilə mübarizənin nəticəsi, onun düşüncəsinin, iradəsinin və müxtəlif hisslərinin hərəkəti olarsa, tədris fənninin məzmununun mənimsənilməsi pedaqoji-psixoloji xarakter daşıya bilər.

Müəllimin yeniyetmələrin özünütərbiyə işinin məzmunu və formaları üzrə işi müxtəlif ola bilər. Bu prosesdə müəllimin özünütərbiyə və onun metodları məsələlərində nə dərəcədə səriştəli olmasından, bu problemlə bağlı elmi və populyar ədəbiyyatla nə qədər yaxşı tanış olmasından çox asılıdır. Həmçinin müəllimlərin pe-

daqoji vəzifələrinin icrasına nə dərəcədə məsuliyyətlə yanaşmasından da çox şey asılıdır.

"Şagirdlərin özünütərbiyəsini təşkil edərkən, birinci növbədə, kollektiv qarşısında bu cür məqsədin qoyulmasından başlamaq lazımdır. İnsanların ümumi işdə təması və vəhdəti nə qədər güclü olarsa, onların qarşılıqlı təsiri bir o qədər səmərəli xarakter daşıyar. Buradan isə aydın olur ki, əgər kollektivdəki bir neçə adam, xüsusilə kollektiv üzvlərinin hamısının hüsnü rəğbətini qazanan adamlar öz üzərlərində işləməyə, özünütərbiyə ilə məşğul olmağa başlayarlarsa, bu hal kollektivin başqa üzvlərinə də mütləq sirayət edəcəkdir" [2, s.510].

Ümumtəhsil məktəb müəllimləri sinif kollektivi ilə özünütərbiyə işini təşkil edərkən təkcə onların qarşısına özünütərbiyə məqsədi qoymaqla məhdudlaşmamalı, bu işin səmərəli yollarını tapmaqda da onlara köməklik göstər-məlidir. "...şagirdi uzun və ya qısa müddət ərzində öz üzərində aparacağı işlə əlaqədar vəzifələri dəqiq müəyyənləşdirməyə, ikinci növbədə, özünütərbiyənin həyata keçirəcəyi vəzifələri qeyd etməyə və həmin işi dönmədən yerinə yetirməyi öyrətmək lazımdır. Əgər şagirddə özünənəzarət zəifdirsə, bu keyfiyyəti onda aşılamaq zəruridir. Çünki o, özünə nəzarət edə bilməzsə, özünütərbiyə də istənilən səviyyədə həyata keçə bilməz. Bu işə kollektivin dostcasına nəzarəti də köməklik göstərməlidir" [2, s. 511].

Yeniyetmələrin özünütərbiyə keyfiyyətlərinin formalaşmasında kollektivin rolu böyükdür. Əgər kollektivə mənsub olmaq uşaq üçün əzizdirsə və o, həmin kollektivin fikri, rəyi ilə hesablaşırsa, özünütərbiyəsində belə kollektivin rolu daha böyük olur. Uşaq kollektivlə öz dərin bağlılığını hiss edirsə, o, həmin kollektivdə özü üçün davranış nümunələri görür. Hər bir yekdil kollektiv öz üzvlərindən müəyyən davranış qaydalarına riayət etməyi tələb edir. Bu tələblər götürülmüş vəzifələrin vaxtında yerinə yetirilməsindən, yoldaşlara fəal münasibət bəsləmək və qayğı göstərməkdən, kollektivi ləkələməməyə çalışmaqdan və s. ibarətdir. Bu tələblər kollektivin üzvü üçün elə bir şərait yaradır ki, o, yoldaşlar onun haqqında pis düşünməsin deyə özünü işdə göstərməyə, təmkinli, soyuqqanlı olmağa məcbur edir. Kollektivin verdiyi müsbət qiymət göstərilən səy və bəzən keçirilən xoşagəlməz emosiyalar müqabilində onun üçün mükafat olur.

Kollektivin keyfiyyətcə daha çətin tapşırıqlarını yerinə yetirdikcə, yüksək səviyyədə müstəqillik və təşəbbüskarlıq tələb edən hərəkətlər icra etdikcə yeniyetmənin özünütərbiyəsi inkişaf edir. Müntəzəm surətdə icra edilən uğurlu özünütərbiyə hərəkətlər sayəsində yeniyetmələrdə öz qüvvələrinə inam əmələ gəlir və o, insanlarla birgə fəaliyyətdən razılıq hissi duyur.

Müəllimlər və sinif rəhbərləri yeniyetmələrin inkişafında və formalaşmasında mühüm rollarını nəzərə alaraq, özünütərbiyə prosesinin təşkili ilə fəal məşğul olmalıdırlar. Özünütərbiyənin təşkili prosesində bu prosesə taktiki rəhbərlik etmək lazımdır. Özünütərbiyənin təşkili prosesinə üç əsas istiqamətlər daxil olmalıdır:

1. Şagirdlərin özünətərbiyənin zəruriliyi və böyük əhəmiyyəti barədə ictimai rəyin formalaşdırılması;

2. Özünətərbiyənin mahiyyətini, onun metodlarını və həyata keçirilməsi yollarını dərk etməkdə şagirdlərə yardım göstərilməsi;

3. Özünütərbiyənin məqsədi və proqramlarının inkişafı, eləcə də şagirdlərə praktiki yardım göstərilməsi;

Birinci istiqamətin mahiyyəti şagirdlərə özünütərbiyənin nə qədər vacib olduğunu anlamaqdan ibarətdir. Bir çox yeniyetmələr bunu etməkdən utanırlar və bunu yoldaşlarından, valideynlərindən, müəllimlərindən gizli edirlər.

İkinci istiqamət bu prosesin həyata keçirilməsi ilə bağlıdır. Bu istiqamətdə işə başlayarkən yeniyetmələrə öz ideallarını tapmağa, hədəfləri seçməyə, öz xarakterinin zəif tərəflərini, kifayət qədər inkişaf etmiş keyfiyyətləri üzə çıxarmağa kömək etmək lazımdır.

Özünütərbiyə üzrə işin təşkilinin üçüncü istiqaməti praktiki xarakter daşıyır. Bu mərhələdə yeniyetmə öz qarşısına düzgün məqsədlər qoymağı, onun nailiyyətlərinin proqramını işləyib hazırlamağı və yerinə yetirməyi, bunun üçün özünütərbiyə etməyin ən məşhur və ən səmərəli üsullarından istifadə etməyi öyrənirlər.

Bu istiqamətdə çalışaraq, özünütərbiyəyə rəhbərlik prosesində aşağıdakı mərhələləri qeyd etmək olar:

1. Şagirdlərin daha yaxşı olmaq, şəxsiyyətin müsbət keyfiyyətlərini inkişaf etdirmək, mənfi keyfiyyətlərdən xilas olmaq istəyini formalaşdırmaq.

2. Şagirdlərə özlərini qiymətləndirməkdə, həyatlarını təhlil etməkdə, müsbət keyfiyyətlərini və qüsurlarını öyrənməkdə kömək etmək.

3. Özünütərbiyə proqramının işlənib hazırlanmasına yardım etmək.

4. Şagirdlərin özünütərbiyə metodları və nümunələri ilə silahlandırmaq.

5. Özünənəzarətin təşkili.

Maarifləndirmə mərhələsində müəllim:

- şagirdlərin müsbət və mənfi keyfiyyətlərini dərk etmələrinə, onların çatışmazlıqlarının dözümsüzlüyünü anlamasına kömək edir;

- məktəblinin uğur qazanmaq istədiyi fəaliyyət sahəsində müstəqil iş vərdişlərinə yiyələnməyi öyrədir;

- özünütərbiyə proqramlarını tərtib etməyə kömək edir.

Müəllimlər qarşılarında aşağıdakı vəzifələri qoymalıdırlar:

1. Şagirdlərin öz daxili dünyasına marağını, arzusunu stimullaşdırmaq.

2. Bir şəxsiyyət kimi özünütəkmilləşdirmək.

3. Məktəblilərin özünütərbiyə məsələləri üzrə biliklər sistemi ilə silahlandırmaq.

4. Şagirdləri özünütərbiyə üsulu ilə silahlandırmaq.

Q.D. Babuşkin və V.N. Smolentsova hesab edirlər ki, yeniyetmələrdə özünütərbiyə prosesində müəllimlər aşağıdakı qaydalara riayət etməlidirlər:

1) əhəmiyyətsiz çətinliklərlə başlamaqla onların intensivliyini tədricən artırmaq. İlk mərhələdə asan tapşırıqlar yeniyetmələrdə özünütərbiyənin formalaşmasına kömək edir;

2) təyin edilmiş vəzifəni yerinə yetirməyə sövq etmək;

3) çətin tapşırığın yerinə yetirilməsinə əminlik yaratmaq;

4) məktəblilərdə sürətli və güclü hərəkətlərin icrasına səbəb olmaq;

5) tapşırıqların həyata keçirilməsinə diqqət göstərərək yerinə yetirməsini tələb etmək və s. [3, s. 88].

Bundan əlavə, müəlliflər özünütərbiyənin formalaşması üçün vacib və zəruri şərait kimi özünənəzarətin olduğunu göstərirlər.

**Problemin aktuallığı.** Bəzən müəllimlər belə uşaqlarla işdən çəkinir və bir sözlə, onlardan yaxa qurtarmağa çalışırlar. Belə olan hallarda müəllimlər onlarla heç bir tərbiyəvi tədbirlər aparmırlar. Təcrübəsiz müəllimlərin isə bu uşaqlarla apardıqları işlər plansız və məqsədsiz olduğu üçün onların işləri heç bir müsbət təsirini vermir və əksinə, uşaqların tərbiyəsini daha da pozur.

**Problemin elmi yeniliyi.** Özünütərbiyənin həyata keçməsi üçün şəxsiyyətin və onun özünü dərk etməsinin müəyyən inkişaf səviyyəsinin, özünün hərəkətlərini başqalarının hərəkətləri ilə müqayisə zamanı təhlildən istifadə edə bilmək qabiliyyəti, eləcə də daim özünütəkmilləşdirmək tələb edilir.

**Problemin praktik əhəmiyyəti**. Tərbiyə və özünütərbiyə proseslərinin sıx əlaqəsini nəzərə alaraq yeniyetmənin özünütərbiyəsinin formalaşmasında pedaqoji vasitələrin, təlim və tərbiyə üsullarının imkanlarının açıq-aydınlığını etiraf etmək olar.

**Ədəbiyyat:**

1. Məhərrəmov, M.C. Psixologiya. / M.C. Məhərrəmov - Bakı, - 1963.
2. Seyidov, S.İ. Psixologiya: Ali pedaqoji məktəblərin bakalavr tələbələri üçün dərslik. / S.İ. Seyidov, M.Ə. Həmzəyev - Bakı, -2007, - 650 s.
3. Бабушкин, Г.Д. Психология физической культуры и спорта. / Г.Д. Бабушкин, В. Н. Смоленцева. - Омск: СибГУФК, -2007. -270 с.
4. Əhmədova, F.Ə. Yeniyetmələrdə şəxsiyyətin formalaşmasına təsir göstərən sosial-psixoloji amillər. // "Psixologiyanin aktual problemləri: yeni perspektivlər, yeni mülahizələr və yeni düşüncələr" mövzusunda beynəlxalq konfransin materialları. -Bakı: -2021, 19-20 iyun, -s.104
5. Əliyev, R.S. Yeniyetmələrin yenidəntərbiyəsi üzrə işin sistemi: / Ped. elm. nam... diss. /-Bakı, 2003. – 160 s
6. Журавлёва И.В. Здоровье подростков: социологический анализ. -М.: Издательство института социологии РАН, -2002.- с. 240

**E-mail**: xalidetalibova@mail.ru
**Rəyçilər**: *ped.ü.fəls.dok*. **İ.B. Əmirəliyeva,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 03.06.2022.

*UOT 37.0*

***Humay Arif qızı Alıkişiyeva***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı mütəxəssisi*

# YAZI BACARIQLARI – KOMMMUNİKATİV VASİTƏ KİMİ

***Хумай Ариф гызы Алыкишиева***
*докторант по программе доктора философии*
*ведущий специалист Института Образования Азербайджанской Республики*

# НАВЫКИ ПИСЬМА КАК КОММУНИКАТИВНОЕ СРЕДСТВО

***Humay Arif Alikishiyeva***
*doctorial student in the proqram of doctor of philosophy, leading specialist of the Institute of Education of the Republic of Azerbaijan*

# WRITING SKILLS AS A MEANS OF COMMUNICATION

**Xülasə.** Yazı bacarıqları müasir insanların ən vacib həyati kompetensiyalarını özündə birləşdirən mürəkkəb prosesdir. Məhz yazı vasitəsilə insanlar bir-birinə fikirlərini ötürür, məzmundakı əsas ideya və mahiyyəti açıqlayır, yeri gəldikcə öz fikirlərini sübut edir, digər fikirləri mühakimə edərək öz mövqeyini ortaya qoyur. Yazı danışma və oxu təlimləri ilə sıx bağlıdır. Bu üç anlayış şagirdlərə kompleks şəkildə aşılanaraq inkişaf etdirilməlidir.
***Açar sözlər:*** *yazı, plan, ardıcıllıq, əsas ideya*

**Резюме.** Навыки письма – сложный процесс, объединяющий в себе важнейшие жизненно важные компетенции современного человека. Именно посредством письма люди передают друг другу свои идеи, раскрывают основную мысль и суть содержания, доказывают свои идеи, когда это уместно, судят о других мнениях и раскрывают свою позицию. Письмо тесно связано с преподаванием говорения и чтения. Эти три понятия следует внедрять учащимся комплексно и развивать всесторонне.
***Ключевые слова:*** *письмо, план, последовательность, основная идея*

**Summary.** Writing skills are a complex process that includes the most important vital competencies of a modern person. It is through writing that people communicate their ideas to each other, reveal the main idea and essence of the content, prove their ideas when appropriate, judge other ideas and reveal their position. Don't write directly. Refers to reading exercises. These three concepts should be introduced and developed comprehensively.
***Key words:*** *writing, plan, sequence, main idea*

Bir insanın həm şəxsi, həm də iş həyatında uğurlarının əsas səbəblərindən biri də onun ünsiyyət bacarıqlarıdır. Onlar bizə müxtəlif insanlarla daha asan ümumi dil tapmağa, daha effektiv işləməyə imkan verir. Bəs “ünsiyyət bacarıqları” termini tam olaraq nə deməkdir? Niyə onlar uğur üçün bu qədər vacibdir? Və nəhayət, onları yaxşılaşdırmaq üçün nə etmək olar? Ünsiyyət bacarıqları nədir və niyə bu qədər vacibdir?

Ünsiyyət – insanların məlumat ötürmək və qəbul etmək bacarığıdır. Ancaq burada mahiyyət təkcə məlumat mübadiləsində deyil, həm də fikirlərini mümkün qədər dəqiq ifadə etmək, həmsöhbətin söylədiklərinin mənasını anlamaq və digər insanların ötürdüyü fikirlərə adekvat cavab vermək bacarığıdır. Bütün bunlar effektiv ünsiyyəti formalaşdırır.

Yüksək ünsiyyət bacarıqlarına malik mütəxəssislər bütün sahələrdə tələb olunur. Səmərəli ünsiyyət qurmaq bacarığı anlaşılmazlıqların və münaqişələrin qarşısını almağa, mürəkkəb məsələlərin həllini daha tez tapmağa və daha məhsuldar işləməyə kömək edir. Ona görə də fəaliyyət sahəsindən, vəzifəsindən və təcrübəsindən asılı olmayaraq, ünsiyyət bacarığı hər kəs üçün lazımdır. Effektiv ünsiyyət qurmağı öyrənmək üçün bir sıra bacarıqlara yiyələnmək lazımdır. Onlardan ən vaciblərinə daha yaxından nəzər salaq.

• *Dinləmə bacarıqları*

İnsanlar təkcə dinləməyi deyil, həm də eşitməyi bacarmalıdır. Bəzən biz həmsöhbətimizin söylədiklərinin mənasına diqqət yetirmək əvəzinə, cavabımızı əvvəlcədən düşünməyə başlayırıq. Effektiv ünsiyyət dinləmək bacarığından başlayır: söhbət boyu diqqətli olmaq və lazım gəldikdə aydınlaşdırıcı suallar vermək bu bacarığın əsasını təşkil edir.

• *Fikirlərini aydın və yığcam ifadə etmək bacarığı*

Bir insanla istər verbal, istər online, istərsə də telefonla danışırsınızsa, bu zaman nitqinizin aydın və qısa olması vacibdir. Dinləyicini çaşdırmamaq və anlaşılmazlıqlara yol verməmək üçün hər zaman düşünmək və deyəcəyinizi formalaşdırmaq üçün öncədən hazırlaşmaq lazımdır. Danışıq zamanı səs tonu da ünsiyyətin keyfiyyətinə təsir edən amillərdəndir. Əgər siz zəif və sakit səslə danışsanız, bu, insanlara sizi eşitməyə çətinlik yaradacaq və onların tez yorulmasına səbəb olacaqdır. Səs tonunun yüksək olması isə qarşı tərəfə hücum, hörmətsizlik əlaməti hesab oluna bilər. Buna görə də effektiv ünsiyyət qurmaq üçün səs tonu və intonasiya daim diqqətdə saxlanılmalıdır.

• *Qeyri-verbal ünsiyyət bacarığı*

Qeyri-verbal ünsiyyət zamanı bədən dili, jest, mimika, intonasiya son dərəcə vacibdir.

• *Empatiya*

Əgər qarşı tərəflə səmərəli kommunikativlik yaratmaq istəyirsinizsə, onu qınamaqdan çəkinməli, əksinə, onunla empatiya qurmağa çalışmalısınız. Başqa bir insanı həqiqətən başa düşmək üçün özünüzü onun yerinə qoymağı, emosional vəziyyətini anlamağı, hisslərini başa düşməyi bacarmalısınız.

• *Müxtəlif situasiyalarda özünü idarəetmək bacarığı*

Səmərəli ünsiyyət qurmaq üçün ilk olaraq öz hisslərinizi idarə etməyi öyrənməlisiniz. Gərginlik zamanı özünü idarə etmək bacarığı hətta ən qızğın müzakirələr zamanı da sizə öz mülahizələrinizin aydınlığını qorumağa imkan verir. Sonradan peşman olmamaq üçün kommunikativ mədəniyyətə sahib insanlar mütləq öz hisslərini idarə etməyi bacarmalıdır.

Kommunikativ mədəniyyətli insan de-dikdə, bu gün savadlı və bacarıqlı insanın şifahi, qeyri-verbal bacarıqları ilə yanaşı, onun yazılı nitqi də diqqətdə saxlanılır. “Savadlı insanı yazısından tanımaq olar” fikri əbəs yerə formalaşmamışdır. Yazılı dil – müasir dünyada ən çox ehtiyac duyulan həyati bacarıqlardan biridir. Əgər bu günün şagirdləri gələcəyin mütəxəssisləri kimi əmək bazarına inteqrasiya etmək istəyirlərsə, mütləq yazılı ünsiyyətin həm rəsmi, həm də qeyri-rəsmi növləri ilə işləməyi öyrənməlidirlər.

Şifahi nitq ilə müqayisədə yazılı dil daha mütəşəkkildir və tənzimlənəndir. Yazılı dil daha konkret lüğət tərkibinə malik olmaqla yanaşı əvvəlcədən planlaşdırılır və onu dəyişmək olmur. Bundan əlavə, yazılı nitqdə təkrarlara yol verilmir. Yazılı nitq şifahi nitqdən daha dərin və təsirlidir.

Yazı təlimi həm öyrənəndən, həm də öyrədəndən vaxt və səbir tələb edən mürəkkəb prosesdir.

Yazı təlimi zamanı 5 əsas komponent nəzərə alınmalıdır:

1) yazan (kim), 2) məzmun (nə), 3) məqsəd (niyə), 4) auditoriya

(kimin üçün), 5) vasitə (işarə və işarələr).

Yazını reallaşdıran şəxs, ilk növbədə, nə yazdığını, niyə yazdığını dəqiq bilməli, hədəf auditoriyasını düzgün seçməli, yönələcəyi auditoriyaya uyğun olaraq dil vahidlərini, nitqinin ardıcıllığını təmin etməlidir.

Şagirdlərə yazı bacarıqlarının ilkin əsasları məktəb dövründə aşılanır. Eyni müəllimin şagirdləri heç də eyni yazı mədəniyyətinə sahib olmurlar. Şagirdin yazı bacarıqlarını inkişaf etdirmək üçün nə etmək lazımdır? Yazılı nitq şifahi nitq əsasında formalaşır. Yəni yazı bacarıqlarının inkişafı üçün müəyyən dil bazası lazımdır. Yazı təlimi şagirdlərlə mərhələli şəkildə -

əvvəlcə hərflər, daha sonra müxtəlif yazı formalarının mənimsənilməsi, müxtəlif yazılı mətnlərin yazılması və s. ilə davam etdirilir. Bir şəxsin yazı bacarıqlarının uğurla inkişafı üçün kifayət qədər lüğət, qrammatik baza və fikirlər arasında əlaqə qura bilmək bacarıqları formalaşdırılmalıdır. Effektiv yazı bacarıqlarının formalaşması üçün aşağıdakı ardıcıllığı təklif edirik:

1. İmla. Mətnin bu cür yazı konstruksiyası materialın bərkidilməsinə xidmət edir.

2. Dinlədiyi və ya oxuduğu mətnin planının tutulması. Plan tərtib etmək təfəkkür mədəniyyətinin yüksəldilməsində, məntiqin inkişafında böyük rol oynayır. Plan zamanı materialı hissə-hissə, ardıcıl şəkildə qavrama təmin olunur. Eyni zamanda, plan daha bir yazılı ünsiyyət növü olan tezis yazı növünün ilkin bacarıqlarının əsasını qoyur.

3. Təqdimat – qavranılan məlumatın başa düşülməsini və yadda saxlanılmasını, fakt və hadisələrin ardıcıllığının məntiqini müəyyənləşdirmək və s. bacarıqları inkişaf etdirərək qavranılan məlumatları fərqləndirmə səriştəsi yaradır.

4. Konspekt – mətndən əsas semantik məzmun daşıyan açar söz və ya cümlələrin, aparılan qeyd daxilində ixtisarların seçilməsindən ibarət olan yazı növlərindən biridir. Eyni zamanda, konspekt istənilən materialın oxusu zamanı məlumatı mənimsəmək üçün qeyd etmək üsuludur.

5. Xülasə - mənbə mətninin əsas ideyalarının yığcam şəkildə təqdim edilməsi, o cümlədən onların sistemləşdirilmə, ümumiləşdirilmə və qiymətləndirilməsini özündə əks etdirən yazı növüdür.

6. Annotasiya – oxucunun əsərin dəyəri və məqsədi haqqında məlumatlandırmaq üçün mənbə mətninin əsas məzmununun qısa, maksimum yığcam, ardıcıl təqdimatıdır. Adətən annotasiyada mənbənin biblioqrafik təsviri, çıxış məlumatları, müəllif haqqında əlavə məlumatlar olur.

7. Esse fakt, hadisə, əşyalar və onların xüsusiyyətləri haqqında müəllifin təəssüratlarının yazılı şəkildə ötürülməsini nəzərdə tutan yazılı nitqin daha mürəkkəb məhsuldar növüdür.

8. Məktub yazılı ünsiyyət mədəniyyətinin ən geniş yayılmış növüdür. İstər kağız şəklində yazılan, istərsə də müasir dövrdə elektron vasitələrin köməkliyi ilə yazılan məktub - smslər insanlar arasında qarşılıqlı əlaqə yaradır. Məktub vasitəsilə insanlar fikirlərini ilkin giriş, əsas fikrin ötürülməsi və yekun hissə adı altında cəmləyərək qarşı tərəfə çatdırırlar.

Yazı bacarıqlarını necə inkişaf etdirmək olar? Hər bir insanın ünsiyyət bacarıqları onun həyatı boyu formalaşır. Ancaq onları tez bir zamanda yaxşılaşdırmağın bir çox yolu var. Bəzilərini aşağıdakı kimi ümumiləşdirmək olar:

- Səmərəli ünsiyyətə mane olan amillərdən stress, diqqətsizlik, mənfi qeyri-verbal mimikalardan çəkinmək lazımdır. Duyğularınızı nəzarətdə saxlamağa, həmsöhbətinizi diqqətlə dinləməyə, onunla göz təması saxlamağa və nəzakətlə gülümsəməyə çalışın və ünsiyyət qurmağın nə qədər asan olduğunu dərhal görəcəksiniz.
- Səmərəli ünsiyyət bacarığı olan insanların necə davrandığına baxın. Müxtəlif situasiyalarda danışıq və yazı üslublarına, səs tonundan tutmuş jest və mimikalarına qədər diqqət yetirin.
- Kənardan bir nəfərin sizi müşahidə edərək qiymətləndirmə aparması üçün şərait yaradın. Eyni zamanda, yazılı nitqinizin "yoldaş qiymətləndirməsi" təftişinə imkan yaradın.
- Öz təcrübənizi və başqalarının təcrübəsini paylaşın. Zəif və güclü tərəflərinizi müəyyən edərək o hissəsi mükəmməlləşdirməyə çalışın.

Səmərəli ünsiyyət bacarıqları insanların şəxsi keyfiyyətləri sırasında ən çox axtarılan yumşaq bacarıqlardan biridir. Bu bacarıqlar insanın bütün həyatı boyu onun həyatını yaxşılaşdırmağa, insanlara daha rahat anlaşmasına və s. imkan yaradır.

**Problemin aktuallığı.** Şagirdlərin müasir ünsiyyət bacarıqlarına verilən əsas tələblərdən biridir.

**Problemin elmi yeniliyi.** Müasir dövrdə yazı bacarıqları insanların ən vacib həyati kompetensiyalarına liderlik edir. Yazı bacarıqlarının formalaşdırılması insanlarda fikirlərini sistemli şəkildə ifadə etmək, daha təsirli və lakonik nitq qurmaq bacarığının inkişafına təkan verir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə şagirdlərin yazı bacarıqlarının inkişaf etdirilməsinə səmərəli təsir göstərəcək.

**Ədəbiyyat:**

1. https://bstudy.net/894780/literatura/pismo_rechevoy_deyatelnosti_osobennosti_pismennoy_rechi_kommunikativnye_vozmozhnosti
2. http://www.tipii.edu.az/az/article/377-1-avqust
3. https://az.wikipedia.org/wiki/Yaz%C4%B1
4. https://ast.ru/news/vse_knigi_yulii_gippenreyter

**E-mail:** h85.a@mail.ru
**Rəyçilər:** *ped.ü.fəls.dok., dos*. **B.O. İbadova**
*ped.ü.fəls.dok., dos.* **Ə.M. Abbasov**
**Redaksiyaya daxil olub:** 06.03.2023

*UOT 37.0*

***Turə Əli qızı Əliyeva***
*Gəncə Dövlət Universitetinin müəllimi*

# NƏZARƏT VƏ ÖZÜNƏNƏZARƏTİN FORMALAŞMASINA XİDMƏT EDƏN TAPŞIRIQLAR ÜZƏRİNDƏ KOLLEKTİV İŞİN TƏŞKİLİ

***Тура Али гызы Алиева***
*преподаватель*
*Гянджинского Государственного Университета*

# ОРГАНИЗАЦИЯ КОЛЛЕКТИВНОЙ РАБОТЫ НАД ЗАДАНИЯМИ, СПОСОБСТВУЮЩИЕ ФОРМИРОВАНИЮ КОНТРОЛЯ И САМОКОНТРОЛЯ

***Tura Ali Aliyeva***
*lecturer at Ganja State University*

# ORGANIZATION OF COLLECTIVE WORK ON TASKS, PROMOTING THE FORMATION OF CONTROL AND SELF-CONTROL

**Xülasə.** Nəzarət və özünənəzarətin inkişafı üçün xüsusi olaraq təşkil edilən tapşırıqlar şagirdlərdə onların inkişafına kömək edən xüsusiyyətlərin: müşahidə, diqqəti cəmləşdirmə, iradə, fərasət və s. intensifikasiya yolu ilə göstərilən bacarıqların formalaşdırılması məqsədini daşıyır. Bu tip tapşırıqların istifadəsi daha çox bacarıqların formalaşmasının ilkin mərhələsində - hazırlıq və birinci siniflərdə baş verir. Xüsusi təşkil edilmiş tapşırıqların digər bir hissəsi artıq əldə edilmiş bilik və bacarıqların təkmilləşdirilməsi zamanı nəzarət və özünənəzarətin inkişafını, yəni şagirdlərin təlim fəaliyyətində buraxdıqları səhvlərin düzəldilməsini və gələcəkdə gözlənilən səhvlərin qarşısının alınmasını nəzərdə tutur.
***Açar sözlər:*** *nəzarət, özünənəzarət, riyazi tapşırıq, diqqət, dördbucaqlı, eksperimental iş*

**Резюме.** Задания, специально организованные для развития контроля и самоконтроля, способствуют развитию у учащихся таких качеств как наблюдательность, сосредоточенность, сила воли, проницательность и др. Эти задания направлены на формирование навыков, проявляемых посредством интенсификации.Данный тип заданий чаще всего используют на начальном этапе формирования навыков – в подготовительных и первых классах. Другая часть специально организованных заданий предполагает развитие контроля и самоконтроля при совершенствовании уже полученных знаний и умений, то есть исправление ошибок, допущенных учащимися в учебной деятельности, и предупреждение ошибок в будущем.
***Ключевые слова:*** *контроль, самоконтроль, математическое задание, внимание, четырехугольник, экспериментальная работа*

**Summary.** Tasks specially organized for the development of control and self-control contribute to the development of such qualities in students as observation, concentration, willpower, insight, etc. These tasks are aimed at developing skills that are manifested through intensification. This type of tasks is most often used at the initial stage of skills formation - in preparatory and first grades. Another part of specially organized tasks involves the development of control and self-control while improving the knowledge and skills already acquired that is, correcting mistakes made by students in educational activities and preventing mistakes in the future.
***Key words:*** *control, self-control, mathematical task, attention, quadrilateral, experimental work*

Nəzarət və özünənəzarətin inkişafı üçün xüsusi olaraq təşkil edilən tapşırıqların bir hissəsi şagirdlərdə onların inkişafına kömək edən xüsusiyyətləri: müşahidə, diqqəti cəmləşdirmə,

iradə, fərasət və s. intensifikasiya yolu ilə göstərilən bacarıqları formalaşdırmaq məqsədi daşıyır. Bu tip tapşırıqların istifadəsi daha çox bacarıqların formalaşmasının ilkin mərhələsində - hazırlıq və birinci sinifdə baş verir. Xüsusi təşkil edilmiş tapşırıqların digər bir hissəsi artıq əldə edilmiş bilik və bacarıqların təkmilləşdirilməsi zamanı nəzarət və özünənəzarətin inkişafını, yəni şagirdlərin təlim fəaliyyətində buraxdıqları səhvlərin düzəldilməsini və gələcəkdə gözlənilən səhvlərin qarşısının alınmasını nəzərdə tutur.

Qeyd edildiyi kimi, birinci qrup tapşırıqlara nəzarət və özünənəzarətin formalaşmasına birbaşa yönəlmiş tapşırıqlar daxildir və əsasən bu bacarıqların formalaşmasının ilkin mərhələsi olan hazırlıq və birinci siniflərdə istifadə olunur. Bu tapşırıqlar üzərində işləmək şagirdin iradəsinin, diqqətinin, müşahidəsinin, zəkasının inkişafını tələb edir ki, bütün bunlar da bu yaşda olan uşaqlarda hələ lazımi şəkildə inkişaf etməmiş olur. Buna görə də, belə tapşırıqlarla təşkil olunan iş həmin inkişafına kömək edir.

Eksperimental sinif şagirdlərində nəzarət və özünənəzarət bacarıqlarının inkişafına və formalaşdırılmasına aid olan və tərəfimizdən tərtib olunaraq birinci siniflərdə eksperimental iş praktikasında istifadə olunan tapşırıqların bəzilərinə nəzər salaq.

Tapşırıq 1. Şagirdlərə lövhədə rəsm verilir (bax. şəkil I).



**Şəkil 1**

Şagirdlərdən bu şəkli diqqətlə nəzərdən keçirmək tələb olunur. Sonra ondan soruşulur: “Burada neçə dairə çəkilib?” Şagirddən böyük dairəni nəzərə almayaraq “Dörd” cavabını verməsi gözlənilir. Bu zaman şagirdə düzgün cavabı tapmaqda köməklik edilir.

Tapşırıq 2. Lövhədə şəkil verilib (şəkil 2-ə bax).




**Şəkil 2**

Şagirdlərə əvvəlcədən xəbərdarlıq edilir ki, onların müşahidə və nəzarət qabiliyyətləri sınaqdan keçirilir. Onlara deyilir ki: “Rəsmə diqqətlə baxın… İndi mən dairənin içərisində nəyisə siləcəyəm, siz də diqqət yetirin ki, nəyi silmişəm… Başınızı əyin!” (Uşaqlar başlarını partaya doğru əyirlər. Müəllim silmir, dairəyə bir və ya iki hərf və ya rəqəm əlavə edir). “Nəyi sildim?” – deyə müəllim soruşur. O, partaların ətrafında gəzir və uşaqlar cavabı onun qulağına pıçıldayırlar. Müəllim əksəriyyətin cavablarını öyrəndikdən sonra bir şagirddən cavabı ucadan təkrarlamağı xahiş edir. Müəllim soruşur: “Başqa kim belə düşünür?”

Tapşırıq 3. **A** və **B** çoxluqları lövhədə göstərilmişdir (şəkil 3).



**Şəkil 3**

Şagirdlərdən bu çoxluqlar arasında bərabər işarəsinin qoymaq mümkün olub-olmadığı soruşulur. Onlar cavab verməlidirlər ki, **A** və **B** arasında bərabər işarə qoymaq mümkün deyil, çünki **A-**da cəmi üç düz xətt, **B-**də üç düz xətt, bir xətt seqmenti və 8 şüa var.

Tapşırıq 4. Lövhədə fiqurlar çəkilib (şəkil 4; 4-a).



**şəkil 4**



**şəkil 4-a**

Müəllim 4-cü şəkli diqqətlə nəzərdən keçirməyi tələb edir və sonra onlardan soruşur: – Şəkildə 5 üçbucağı kim tapa bilər? Uşaqlar yalnız 4 üçbucağın olduğunu görməlidirlər. Bundan sonra iki əks künc nöqtələrini düz xətt ilə birləşdirir (şəkil 4-a). “İndi neçə üçbucaq var?” – deyə uşaqlardan soruşur. Onlar 10 üçbucaq tapmalıdırlar.

Tapşırıq 5. Lövhədə fiqur çəkilir (şəkil 5).



**şəkil 5**

Şagirdlər şəklə diqqətlə baxıb neçə üçbucağın olduğunu deməlidirlər. Şagirdlərdən bəziləri şəkildə iki üçbucaq, bəziləri üç, beş, bəziləri isə altı üçbucağın hamısını görür. Birinci çağırılan şagird düzgün cavab verirsə, digərləri üçün tapşırıq mənasını itirir və onlar daha müşahidə etməyəcəklər. Tapşırığın məqsədi isə ondadır ki, hanı düşünsün, axtarsın və düzgün cavabı tapsın.

Bu vəziyyətdə “qulağa pıçıldamaq” texnikasına müraciət etmək lazımdır. Müəllim əlini qaldıran şagirdə yaxınlaşır və şagird cavabı onun qulağına pıçıldayır. Sonra müəllim başqa şagirdə keçir və s., nəhayət, bütün şagirdlərin fikrini öyrəndikdən sonra onlardan birinin ucadan cavab verməsini və lövhədə üçbucaqların hər birini göstərməsini xahiş edir.

Bu “qulağa pıçıldamaq” üsulu eksperimental ibtidai siniflərdə müəllimlərin işində yaranmışdır. Şagirdlər bu sorğunu bəyənirlər və onlar işə qoşulmağa həvəslə hazırdırlar. Bu şəkildə sual vermək müəllimdən tempi, canlılıq (aktivlik) tələb edir və sonra bir-iki dəqiqə kifayət edir ki, bütün şagirdlərin cavablarını öyrənsin.

Aşağıda hazırlıq və birinci sinif şagirdlər üçün nəzərdə tutulmuş və birbaşa nəzarət və özünənəzarətin formalaşmasına yönəlmiş, bizim tərəfimizdən tərtib edilmiş tapşırıqlardır.

Tapşırıq 6. Lövhədə müxtəlif ölçülü üçbucaqlardan ibarət yolka ağacı çəkilib (şəkil 6).



**şəkil 6**

Şagirdlərdən lövhədə çəkilmiş yolkanın neçə üçbucaqdan ibarət olduğunu saymaq xahiş olunur. Burada şagirdlərin əksəriyyəti beş üçbucağı görür, lakin bəziləri səkkizinin hamısını görə bilir. Sonra şagirdlərə deyilir: “Yolka ağacına daha bir üçbucaq əlavə edəcəyik (rəsmdə bu üçbucaq qırıq xətlərlə qeyd olunub). Yolka ağacına neçə üçbucaq əlavə olunacaq? Şagird qeyd etməlidir ki, yolka ağacına bir üçbucaq əlavə etməklə iki üçbucaq əlavə edilmiş olur.

Tapşırıq 7. Lövhədə bir fiqur verilmişdir (şəkil 7).



şəkil 7



şəkil 7-a

Şagirdlər fiquru diqqətlə nəzərdən keçirməlidirlər (şəkil 7) və fiqurun neçə üçbucaq və seqmentdən ibarət olduğuna cavab verməlidirlər. Şəkildə 3 üçbucaq və 7 xətt seqmenti olduğuna diqqət yetirməlidirlər. Şəkil 7-a-da göstərildiyi kimi, rəsmə bir seqment əlavə edilir. Uşaqlardan soruşurlar: “Şəklə neçə üçbucaq və neçə seqment əlavə edildi?” Uşaqların əksəriyyəti cavab verir ki, bir seqment və üç üçbucaq əlavə olunub. Əslində rəsmə 7 seqment və 6 üçbucaq əlavə edilmişdir.

Tapşırıq 8. Lövhədə düzbucaqlı çəkilib (şək. 8).

| | | |
|---|---|---|
| 1 | 2 | 3 |
| 4 | 5 | 6 |

**şəkil 8**

Şagirdlərdən bu rəsmə diqqətlə baxmaq və onun neçə dördbucaqlıdan ibarət olduğuna cavab vermələri xahiş olunur. Əksər şagirdlər bunun 6 dördbucaqlıdan ibarət olduğunu cavablandırır. Bəziləri daha bir neçə dördbucaqlı görə bilər. Onlara şəkildə 18 dördbucaqlı olduğu bildirilir və şəkildə göstərilən nömrələmədən istifadə edərək onların adını çəkib lövhəyə yazmaları xahiş olunur.

Məsələn, dördbucaqlılar: 1+2; 2+3; 1+2+4+5; 5+6 və s. Şagirdlər 18 dördbucağın hamısını adlandırıb lövhədə yazmalıdırlar.

Tapşırıq 4. Lövhədə sadə sözləri təşkil edən bir hərf qrupları yazın. Şagirdlər bu hərflərdən sözlər düzəltməlidirlər. Məsələn: N A A, O T S L, T L S U, Ə E Ş M, O T P, V H Ə L Ö, L A A M.

Hərfləri dəyişdirərək şagirdlər aşağıdakı sözləri almalıdırlar: ANA, STOL, STUL, MEŞƏ, TOP, LÖVHƏ, ALMA. Bu tapşırıq şagirdlərdən müşahidəçi olmağı, diqqət yetirməyi, əzmkarlığı tələb edir.

Tapşırıq 5. Lövhədə istənilən hərflər yazılır: A, N, T, Q, R, D, Ş, Ə, Y, I, B, L.

Şagirdlər bu hərflərdən söz yaratmalıdırlar. Məsələn: NƏNƏ, QARDAŞ, ATA, QAYIQ, ANA, AYAQ, BABA, BALA, BALIQ və s. Şagirdlər sözləri yerindən deyirlər. Tapşırığın məqsədi – mümkün qədər çox söz yaratmaqdır, lakin müəllim şagirdlərə xəbərdarlıq edir ki, yoldaşlarının dediyi sözü təkrarlamasınlar. Bu tapşırıq üzərində işləyərkən şagirdlər söz tapmaq üçün təkcə zehni hərəkətlər etmir, həm də yoldaşlarının dediyi sözləri unutmamaq və yaxşı yadda saxlamaq üçün diqqət və yaddaşlarını mümkün qədər gərginləşdirirlər.

Beləliklə, yuxarıda təqdim olunan tapşırıqlar məktəbə hazırlıq qruplarının və birinci sinif şagirdlərində nəzarət və özünənəzarət bacarıqlarının formalaşdırılmasının başlanğıc mərhələsinə xidmət edir. Belə tapşırıqlar və onların icra edildiyi məşğələlər şagirddən proqram materialı üzrə müəyyən bilik ehtiyatına və ya biliyə malik olmağı tələb etmir. Onlar şagirdlərin artıq malik olduqları imkanlardan istifadə etmək üçün nəzərdə tutulub.

**Problemin aktuallığı.** Nəzarət və özünənəzarət elə bacarıqlardır ki, onun ictimai fəaliyyətə daxil edilməsi insanı mümkün səhvlərdən və uğursuzluqlardan sığortalayır. Kiçikyaşlı məktəblilərdə nəzarət və özünənəzarətin inkişafı müasir məktəblərimizin ən vacib təlim və tərbiyə vəzifəsidir. Bu bacarıqlar yalnız şagirdlərin təlim və idraki fəaliyyətinin güclənməsinə deyil, həm də onların tərbiyəsi ilə bağlı vəzifələrin uğurlu icrasına töhfə verir. Buna baxmayaraq, təhsil təcrübəsində hələ də bu bacarıqların formalaşmasına və inkişafına lazımi diqqət yetirilməmişdir.

**Problemin elmi yeniliyi.** Uşaqlarla kollektiv və fərdi iş prosesində nəzarət və özünənəzarətin formalaşdırılmasının yolları və vasitələri müəyyənləşdirildi. Bu bacarıqların formalaşması üçün xüsusi tapşırıqlar sistemi, bu tapşırıqların təsnifatı və onlardan istifadə metodikası hazırlanmışdır.

**Problemin praktik əhəmiyyəti** Tədqiqatın elmi nəticələrindən orta ümumtəhsil məktəblərinin ibtidai sinif müəllimləri uşaqlarda nəzarət və özünənəzarət bacarıqlarının formalaşdırılması məqsədi ilə, habelə uşaqlar isə ev tapşırıqlarını yerinə yetirərkən istifadə edə bilərlər.

**Ədəbiyyat:**


1. Abbasov, A.N. Pedaqogika: Müntəxəbat. Ali təhsil müəssisələri üçün dərs vəsaiti. / A.N. Abbasov, R.R. Məmmədzadə, L.A. Məmmədli – Bakı: Mütərcim, – 2021. – 608 s.
2. Ümumtəhsil məktəblərinin I-IV sinifləri üçün fənn kurikulumları / tərt. ed. A. Əhmədov, Ə. Abbasov – Bakı: Təhsil, 2008. – 480 s.
3. Qocayeva, L.İ. Məsələ həlli vasitəsilə riyaziyyat təliminin həyatla əlaqələndirilməsi (III-IV siniflər): / pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyası) / – Bakı, 2003. – 108 s.
4. Pirverdiyeva, G.İ. Fənlərin inteqrasiyasına dair yeni mülahizə. // – Bakı: Bakı Slavyan Universiteti, Humanitar elmlərin öyrənilməsinin aktual problemləri. Ali məktəblərarası elmi məqalələr məcmuəsi, – 2015. №4, – s. 301-304.


**E-mail**: tureeliyeva@mail.ru

**Rəyçilər:** *ped.ü.fəls.dok.* **, dos. N.R. Abbasov,**
*ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva**
**Redaksiyaya daxil olub:** 08.02.2023

*UOT 37.0*

***Nurəddin Emil oğlu Daşdəmirov***
*Bakı şəhəri Sabunçu rayonu 293 nömrəli tam orta məktəbin fiziki tərbiyə müəllimi*

# DƏRSDƏNKƏNAR FİZİKİ TƏRBİYƏ MƏŞĞƏLƏLƏRİNDƏ ŞAGİRDLƏRDƏ ÖZÜNÜMÜDAFİƏ BACARIQLARININ FORMALAŞDIRILMASININ METOD VƏ VASİTƏLƏRİ

***Нураддин Эмиль оглы Дашдамиров***
*учитель физкультуры полной средней школы № 293 Сабунчинского района города Баку*

# МЕТОДЫ И СРЕДСТВА ФОРМИРОВАНИЯ СПОСОБНОСТЕЙ САМОЗАЩИТЫ УЧАЩИХСЯ НА ВНЕУРОЧНЫХ ЗАНЯТИЯХ ПО ФИЗИЧЕСКОЙ КУЛЬТУРЕ

***Nuraddin Emil Dashdamirov***
*phyical upbringing teacher of secondary school № 293 of Sabunchu region of Baku city*

# THE METHODS AND MEANS OF FORMİNG SELF-DEFENSE SKİLLS OF PUPİLS DURİNG EXTRACURRİCULAR TRAİNİNGS

**Xülasə.** Məqalədə məktəblilərin özünümüdafiəsi kimi aktual bir məsələ diqqətə çatdırılır. Bu bacarıqların formalaşdırılmasının bəzi üsulları və vasitələri tövsiyə edilir.

Məqalədə qeyd edilir ki, şagirdlərdə istənilən fiziki bacarıqları formalaşdırmaq üçün, ilk öncə, onların ümumi fiziki hazırlığını təmin etmək, yəni güc, diqqət, sürət, dözümlülük, çəldlik kimi keyfiyyətlərini inkişaf etdirmək zəruridir. Daha sonra bu keyfiyyətləri hansı üsullarla və hansı vasitələrlə inkişaf etdirməyin yolları göstərilir. Müəllif bədənin müxtəlif əzələlərinin hər birini necə inkişaf etdirməyin üsullarını təqdim edir. Bundan əlavə, özünümüdafiə üzrə nümunəvi priyomlar təqdim edərək hücum zamanı özünüsığorta, balanslaşdırma, ayaqla zərbələr endirərkən hansı səhvlərə yol verməməyi, nələrə xüsusi diqqət yetirməyi nəzərə çarpdırır.

***Açar sözlər:*** *özünümüdafiə, əlbəyaxa döyüş növləri, fiziki hazırlıq, güc, sürət, çeviklik, dözümlülük, metod və priyomlar*

**Резюме.** В статье рассматривается такая актуальная тема, как самозащита школьников. Автор статьи дает некоторые рекомендации по формированию этих способностей.

Отмечается что, для формирования у учащихся любых физических способностей необходимо в первую очередь, обеспечить их физическую подготовку, т.е. развивать в них такие качества, как сила, скорость, выносливость, ловкость, внимание и др. Далее указывается какими методами и средствами можно развивать эти качества. Автор представляет способы развития различных мускулов тела в отдельности. Помимо этого, предлагая образцовые приемы, доводит до сведения, что во время нападения при выполнении таких приемов, как самостраховка, балансировка, удары ногой каких ошибок нельзя допускать, и на что необходимо обращать особое внимание.

***Ключевые слова:*** *самозащита, виды рукопашного боя, физическая подготовка, сила, скорость, ловкость, выносливость, методы и приёмы*

**Summary.** In the article, an important issue as self-defense of schoolchildren is brought to the attention. Methods and means of forming these skills are recommended.

It is mentioned in the article that in order to develop any physical skills in students, it is necessary to ensure their general physical fitness, that is, to develop such qualities as strength, attention, speed, endurance, quickness. Them, the methods and means of developing these qualities are depicted. The author introduces methods of developing each of the different muscles of the body. In addition, it presents

exemplary tactics of self-defense, self-defense during the attack, balancing, which mistakes to avoid and what to pay special attention to when kicking.

***Key words:*** *self defense, hand-to-hand combat, physical preparation, power, speed, agility, strentgh, methods və ways*

Respublikamızın orta ümumtəhsil məktəblərində tədris edilən fiziki tərbiyə fənninin proqramına özünümüdafiə dərsləri daxil edilməmişdir. Yalnız 10-11-ci siniflərin proqramına bir neçə saatlıq özünümüdafiə priyomlarının öyrədilməsi daxil edilmişdir. Əlbəttə ki, bu şagirdlərdə özünümüdafiə bacarıqlarının formalaşdırılması üçün yetərli deyildir. Bu bacarıqların formalaşdırılmasına, şübhəsiz ki, aşağı siniflərdən başlanılmalıdır. Onu da qeyd etməliyik ki, fiziki tərbiyə müəllimlərinin heç də hamısı əlbəyaxa döyüş idmanının metodikasını, fənd və priyomlarını bilmir. Ona görə də, bu problemin həllinə bədən tərbiyəsi ixtisası üzrə mütəxəssislər – müəllimlər hazırlayan ali məktəblərimizdən başlamaq lazımdır. Baxmayaraq ki, mütəxəssislər qeyd edirlər ki, əlbəyaxa döyüşdə heç bir ehkam (doqma) yoxdur. Hər bir hərəkət, hər bir fənd öz-özünə (spontan) əmələ gəlir, [1] bir çox xarici ölkələrdə olduğu kimi bizim ali məktəblərimizdə də gələcək fiziki tərbiyə müəllimləri Şərq əlbəyaxa döyüş idmanı növlərinin üsul və priyomlarına yiyələnməlidirlər ki, öz şagirdlərinə özünümüdafiə priyomlarını öyrədə bilsinlər.

Dərsdənkənar fiziki tərbiyə məşğələləri dedikdə, əsasən, orta ümumtəhsil məktəblərində fiziki tərbiyədən fakültativ məşğələlərini nəzərdə tutmuşuq. Məlumdur ki, orta məktəblərdə həm 5-8, həm də X-XI siniflərdə fiziki tərbiyədən fakültativ məşğələlər keçirilir. Bu məşğələlərin şagirdlərdə özünümüdafiə bacarıqlarının formalaşdırılmasına həsr edilməsini məqsədəmüvafiq hesab edirik.

Qeyd etməliyik ki, şagirdlərdə istənilən fiziki bacarıqları formalaşdırmaq üçün ilk öncə onların ümumi fiziki hazırlığını təmin etmək lazımdır, yəni güc, sürət, dözümlülük, çəldlik kimi keyfiyyətləri inkişaf etdirmək zəruridir. Lakin, eyni zamanda, onlara izah etmək zəruridir ki, "öyrəndikləri fəndləri qeyri-qanuni və qeyri-humanist istiqamətlərə deyil, yalnız və yalnız ali məqsədlərə yönəltmək prinsiplərinə ciddi riayət etmək vacibdir." [2]

Şagirdlərin ümumi fiziki hazırlığını gücləndirmək üçün müxtəlif fiziki təmrinlərdən istifadə edilə bilər. Məsələn, dözümlülüyü dərə-təpəlik yerlərdə əllərdə, ayaqlarda, çiyinlərdə yüklə qaçmaqla; yüksəkliyə qaçmaqla, pillələri qaçaraq qalxmaqla; yerinə yetirilən hərəkətlərin maksimum sayda təkrarlanması ilə; rezinlə müdafiə və zərbələr, espamderlə, hantellə möhkəmləndirmək olar.

Oyun idman növləri: futbol, basketbol, üzgüçülük də dözümlülüyü inkişaf etdirmək üçün çox faydalıdır.

Ağrıya dözümlülüyü bir-birinin ənsəsinə ovucun yanı ilə yüngül zərbələr vurmaqla; dartılma üzrə tapşırıqların yerinə yetirilməsi ilə inkişaf etdirmək olar. Rahatlama və iradə ilə ağrıları aradan qaldırmağı şagirdlərə öyrətmək mümkündür. Kontaktlı blokların və zərbələrin işlənilməsi də dözümlülüyün inkişaf etdirilməsinə yardım edir. Bədənə, əllərə və ayaqlara zərbələrin vurulması da dözümlülüyü möhkəmləndirməyə yardım edir. Təhlükəli zonalara birbaşa zərbələr vurmaqdan çəkinmək lazımdır. Zərbələr arasındakı aralıqlarda maksimum rahatlaşmaq olar.

Diqqət! Xüsusən bədənin təhlükəli zonalarına güclü zərbələr vurmaq olmaz. Zərbələrin gücü məşğul olanın hazırlığının dərəcəsinə mütənasib olaraq artmalıdır.

Reaksiyanın itiliyini, yəni cəldliyi inkişaf etdirmək üçün aşağıdakı hərəkətlər məsləhət görülür:

*Topla məşqlər*. Qarşı-qarşıya duraraq əlində tennis topu tutaraq bir-birinə atıb-tutmaq. Topu döşəməyə və ya divara vuraraq qayıdarkən tutmaq kimi hərəkətlərlə reaksiyanı sürətləndirmək mümkündür.

*Diqqətin inkişafı.* Komanda ilə qaçışa başlamaq, əl çalmaqla, fitlə və ya sayla hərəkəti dəyişmək kimi təmrinlər də reaksiyanın sürətinin artmasına yardım edir. Məsələn, müəllim ardıcıl olaraq sağa, sola, yuxarı, aşağı siqnalı verir və şagird başını həmin istiqamətlərə döndərərkən hər hansı bir nöqtədə diqqətini cəmləyir, zamanla hərəkətlər tezləşdirilir. Müəllim bilərək şagirdi düzgün istiqamətləndirmir və çaşdırmağa cəhd edir. Bununla da şagirdin siqnala reaksiyasının sürətini aşkar edir.

*Sürətin inkişaf etdirilməsi.* Sürətli zərbəni yalnız sistemli məşqlər yolu ilə qazanmaq olar. Bunu etmək üçün, əlləri və ayaqları yığıb-açan əzələlər hazırlanmalıdır. Bunun üçün rezin, espanderlə, hantellərlə işləmək lazımdır.

*Diqqət!* Hər ağırlaşdırıcı tətbiq edilən hərəkətdən sonra hərəkəti yüksüz təkrarlamaq lazımdır. İradənin gücü ilə əllərin və ayaqların hərəkət sürətini artırmaq lazımdır. Çalışmalar: əlin bir zərbəsi ilə yanan şamı birbaşa söndürmək, yanan şamın üzərində əli 2-2,5-sm məsafədə tutmaq, şaquli yerləşdirilmiş kibrit qutusunu yıxmaq, yuxarıya atılmış qəzeti fəzada ikən vuraraq deşmək kimi hərəkətləri sakit və sinxron yerinə yetirin. Unutmaq lazım deyil ki, sürət nə qədər yüksəkdirsə, zərbə də bir o qədər güclü olacaq. Zəruri keyfiyyətləri artırmaq üçün boks armudlarına zərbələr endirməklə məşq etmək lazımdır.

Hər hansı bir döyüşçü fiziki cəhətdən güclü olmalıdır. Hətta yaxşı texnikaya malik olan döyüşçünün də fiziki gücü olmadan rəqibə qalib gəlmək ehtimalı azdır. Buna görə də fiziki məşqlərə həmişə davam etmək, əzələ gücünü inkişaf etdirmək vacibdir.

Əzələlərin elastikliyini təmin etmək üçün əzələlərin uzanması üsulundan istifadə etmək lazımdır. Duruş vəziyyətindən ayaq üstə yavaş-yavaş şpaqata enməyə başlamaq, uzununa və ya eninə. 1-ci Faza – ağrı hiss edənə qədər uzanmaq lazımdır. 2-ci mərhələ statik istirahətdə dayanaraq, bu vəziyyətdə rahatlaşmağa başlamalı, yəni dartılmış bağlara qanın axınını hiss etməyə çalışmaq lazımdır, çünki bunu yalnız rahatlamış vəziyyətdə hiss etmək mümkündür. 3-cü mərhələ - konsentrasiya. Bu, o zaman baş verir ki, idmançı iradənin və konsentrasiya gücünün köməyi ilə rahatlama və istilik hissini şüurlu şəkildə çağırır. Beləliklə, o, güclü ağrı hissi olmadan addım-addım qarşısına qoyduğu vəzifəni yerinə yetirə bilir. Unutmaq olmaz ki, statik hərəkətsiz duruş bir neçə saniyədən bir neçə dəqiqəyə qədər davam edir. Proses boyunca idmançı – şagird rahatlıq hiss etməlidir. Narahatlıq hissi yalnız zərərli nəticələrə gətirib çıxarır.

İdmanla məşğul olan şagirdlərin asanlıqla və gözəl qamətlə yerimələri, tamamilə rahatlaşa və dərhal konsentrə ola bilmələri, bir sözlə, ahəngdar inkişaf etmələri üçün müxtəlif fiziki təmrinlərdən istifadə etmələri vacibdir. Məşq prosesinə rezin jqutla, espanderlə, çəkisi böyük olmayan hantelərlə təmrinlərdən istifadə daxil edilməlidir.

Özünümüdafiə üzrə nümunəvi priyomlar nəzərinizə çatdırırıq.

1) *Hücum zamanı özünüsığorta:* bu zaman hansı səhvlərə yol vermək olmaz?

1. İrəli yıxılarkən, qarın presini gərginləşdirmək və dirsəklərə söykənmək olmaz.
2. Geriyə yıxılarkən dirsəklərə söykənmək təhlükəlidir.
3. Yana yıxılarkən dirsəklərə söykənmək olmaz.
4. Yana yıxılarkən, ayaqları çarpazlaşdırmaq olmaz.
5. İrəli mayallaq aşarkən barmaqları irəli qoyaraq düz əllərə söykənmək olmaz.
6. İrəli yıxılarkən, ovucları irəli vəziyyətdə düz əllərin üstünə düşmək olmaz.
7. Yıxılarkən dabana söykənmək olmaz.

2) *Balanslaşdırma.*

Bədənin balansını tam hazır saxlamaq tələb olunur. Bədənə sahib olmağı bacarmamaq mübarizənin istənilən növünün öyrənilməsində ciddi maneə olacaq. Burada Çin təkbətək döyüş məktəblərindən balans dərsləri təklif olunur.

*Qaldırılmış diz ilə balanslaşdırma.*

Sol ayaq dizdən bükülərək qaldırılır, pəncə aşağı dartılır, sağ dayaq ayağı düzdür. Sağ düz əl yuxarı qaldırılmışdır, ovucun mərkəzi yuxarı yönəldilmişdir. Sol əl bir qarmaq təşkil edir, düzəldilir və bədənin arxasında yerləşdirilir, qarmağın mərkəzi yuxarıya doğru yönəldilir, sola baxır. Xüsusiyyətlər: diz kəmərə qədər yuxarıya qaldırılır. Sağ ayağın barmaqları yerdən yapışaraq davamlı dayanılır.

*"Ayın müşahidəsi", "Dəniz kəşfiyyatı"* adlanan balanslaşdırma priyomları da vardır.

*3) Ayaqla zərbələr*

Ayaq zərbələri mübarizədə ən güclüdür. Onlara lazımi dərəcədə sahib olan, əllərlə endirilən zərbələrdən daha güclü effekt əldə edə bilər. Lakin bu texnikanın mənimsənilməsi daha çox vaxt və səy tələb edir.

Zərbə endirdikdə, bədənin yaxşı tarazlığı böyük əhəmiyyət kəsb edir, çünki bədənin ağırlığını yalnız bir ayaq daşıyır. Bu vəziyyət ayağın hədəflə təması zamanı güclü təsirlə də mürəkkəbləşir. Buna qarşı durmaq üçün dayaq ayağının pəncəsini yerə möhkəm qoymaq lazımdır,

ayaq topuqdan tamamilə gərgindir, barmaqların ucu ilə yeri bərk tutmaq lazımdır. Dayaq ayağın biləyi, diz və budla təsiri azaltmağa çalışmaq lazımdır. Bədənin yuxarı hissəsini yaxşı balanslı və döşəməyə perpendikulyar vəziyyətdə saxlamaq vacibdir. Maksimum effektə nail olmaq üçün bir ayaqla deyil, bütün bədənlə vurmaq lazımdır.

Hədəflə kontaktdan sonra, ayağı dərhal geri çəkmək vacibdir, bu, dəstək ayağını tutmağa və vurmağa rəqibə imkan verməyəcəkdir. Ayaq başlanğıc vəziyyətinə dönən kimi, yenidən zərbəyə hazır olmalıdır.

*Ayaq ilə təkan zərbəsi*

O, irəli və ya kənara yönəldilə bilər. Hədəf diz, kəmər və daha yüksək hündürlükdə ola bilər. Dayaq ayağının hədəfə doğru ən düz yolla hərəkət etməsinə nail olmaq lazımdır. Zərbənin başlanğıcında hərəkət yüngül və sürətli olmalıdır, amma hədəflə təmas zamanı pəncədə maksimal güc cəmləşdirilməlidir. Bu zərbə olduqca mürəkkəbdir, çünki rəqibdən sizi ayıran məsafə düzgün müəyyən edilməlidir, əks halda zərbə alınmayacaq. Beləliklə, müvəffəqiyyətli ayaq zərbəsi məsafənin düzgün seçimindən və zərbənin vurulması üçün anın ani hesablamasından asılıdır. Dayaq ayağının tam düzəldildiyi və maksimum səy göstərdiyi an digər ayağın pəncəsi hədəfə vurmalıdır. Əgər ayaq çox gec və ya tez hədəfə vuracaqsa, onda yaranan əks təsir pəncəni geri itələyəcək.

Aşağıdakılara xüsusi diqqət yetirmək lazımdır:

1. dəstək ayağın topuğunu və dizini gərginləşdirmək;

2. gövdənin yuxarı hissəsini hədəf istiqamətində mümkün qədər çox əymək. Əyilmə əks istiqamətdə olduqda, müvazinəti saxlamaq mümkün deyil, bu halda hədəf geri atacaq;

3. dizi elə büküb qaldırmaq lazımdır ki, daban demək olar ki, baldıra toxunsun;

4. sağrıların proyeksiyası dabanın arxasında olmalıdır. Ağırlıq mərkəzi barmaq və daban arasında ortada yerləşdirilməlidir;

5. ayağın altı döşəməyə sıx bərk tutulmalıdır;

6. dizi və topuq oynaqlarını bir az əymək;

7. dizin ön hissəsinin proyeksiyası barmaq uclarında olmalıdır.

Yana zərbə endirərkən vuran ayağın dizini tamamilə istisna etmək lazımdır ki, bud və dizin düz bir xətt təşkil etsin. Bu, təkan zərbəsində maksimum gücə zəmanət verir.

*Yan ayaq zərbəsi*

Bu barmaq yastıqlarının köməyi ilə və ya pəncənin qaldırması ilə irəlidə duran rəqibə zərbə vurmaq üçün tətbiq edilir. Bu üsulun köməyi ilə üzə, boynuna, sinəyə, qarına güclü zərbələr vurmaq olar.

Öyrənməyə başlamazdan əvvəl bunları bilmək lazımdır:

1. Yalnız bir ayağı zərbə endirilməməlidir. Pəncəni hədəfə budların sürətli və güclü fırlanmasının köməyi ilə çatdırmaq lazımdır. Əgər zərbə sağ ayaqla vurulursa, sol pəncə, bud, sinə, baş - hamısı saat əqrəbinin əks istiqamətində döndərilməlidir.

2. Budların döndüyü anda, dəstək ayağı bədənin fırlanma istiqamətində çevirmək məcburiyyəti yaranır. Burada dayaq ayağının torpağa möhkəm basılmasına diqqət etmək lazım gəlir. O, yerindən tərpənməməlidir.

3. Ayağın hədəflə 90 dərəcə bucaq altında qarşılaşdığı təqdirdə zərbə ən səmərəli olur.

*Ayağın aypara zərbəsi*

Bu zərbə həm hücum, həm də müdafiə üçün istifadə edilə bilər. Hücum edərkən döyüş səthi barmaqların yastığı olacaq. Zərbələr aralıq sahəyə, qarına da endirilə bilər. Müdafiə edilərkən daban yastığından istifadə etmək olar. Misal: rəqib əlinin zərbəsi ilə gövdəyə vurmağa çalışırkən, ayağın aypara zərbəsini tətbiq edərək, onun bazu önünə vurmaq lazımdır.

*Geriyə ayaq zərbəsi*

Bu zərbə arxada yerləşdirilmiş hədəfə, istənilən ayağın dabanıyla vurulur. Zərbəni qolaylanaraq, yaxud itələmə zərbəsilə vurmaq olar. Əgər gövdə fırladılarsa, qarşıda duran hədəfə də vurmaq olar. Bu halda, demək olar ki, idarə olunmayan, lakin böyük gücə malik zərbə alınır.

Arxadan hücum edən düşməndən qorunmaq üçün onun günəş kələfinə, qarnına, aralıq sahəsinə, buduna, baldırına zərbələr endirmək effektivdir. Bu tez-tez digər zərbələrlə birləşdirilir.

*4. Müdafiə*

Müdafiə çox mürəkkəb döyüş hərəkətləridir və bütün mübarizə kimi məlum cəsarət tələb edir. Müdafiəyə başlamazdan əvvəl rəqibin hücum növünü və istiqamətini müəyyən etmək la-

zımdır. Unutmaq olmaz ki, müdafiə olunarkən, təşəbbüsü ələ keçirmək və rəqibin hücumunu öz xeyrinə istifadə etmək vacibdir.

Aydındır ki, müdafiə fəndlərini nə çox erkən, nə də çox gec işlətmək olmaz. Rəqibin niyyətlərini qiymətləndirmək və müdafiə üçün başlanğıc mövqe tutmaq lazımdır, lakin mütləq zərbəni qaytarmaq və ya dəf etmək üçün özünü kifayət qədər vaxtla təmin etmək lazımdır.

Müdafiənin effektiv olması üçün vaxtın nəzərə alınması zəruridir. Müdafiə üçün nadir hallarda ideal şərait olur. Çox vaxt kritik olaraq lazımi müdafiə mövqeyini tutmaq üçün kifayət qədər vaxt olmur. Hücuma ən çox gözlənilmədən məruz qalınır, buna görə də bu vəziyyətdə dərhal müdafiənin son hissəsinə keçmək lazımdır. Müdafiənin seçilməsində tərəddüdlər olduqca kədərli bir finala səbəb ola bilər.

Heç vaxt unutmaq olmaz ki, müdafiəni seçərkən rəqibin fiziki üstünlüyü də nəzərə alınmalıdır. Məsələn, onun uzun əlləri və ayaqları, sizdən uca boyu və ya əksinə ola bilər. Artıq bu, hansısa müdafiəni və ya daha səmərəlisinin tətbiqini qeyri-mümkün edir. Bloklayan əlin zəruri yolu tam qət etməsi üçün heç də hər zaman yetərli məkan olmur. Buna görə də, döyüşdə xüsusi mühüm rolu vaxt hesablanması oynayır. Rəqibin zərbəsinin sürətini və onun sizdən hansı məsafədə işlədiyini nəzərə alaraq lazımi hərəkətləri yerinə yetirmək lazımdır. Hücum hərəkətlərində olduğu kimi, qoruyucu hərəkətlərdə də budların fırlanması xüsusi rol oynayır.

*Diqqət!* Budların fırlanmasından istifadə etmədən hərəkət həyata keçirmək mümkün deyil. Budlar bir istiqamətə tamamilə döndükdə və qarın sahəsindəki gərginlik limitinə çatdıqda, onlar əks istiqamətdə dönməyə başlayır. Bu əks fırlanmadan güc qolun yuxarı hissəsinə və bazu önünə çiyinlər istiqamətində gedir, güclənir və yumruqda qüvvətli zərbə partlayışı şəklində hədəfdə tamamlanır. Kilidləmə (bloklama) zamanı bütün gücü bazu önünə cəmləşdirmək lazımdır. Güc miqdarı dirsəyin gövdəyə nəzərən mövqeyindən asılıdır. Dirsəyi gövdədən uzaq tutmaq olmaz, əks halda bədənin yan əzələlərini gərginləşdirmək çətin olacaq, müdafiə zəifləyəcək. Dirsək çox yaxın olduqda, hərəkətin amplitudu azalır və bundan da kilidin (bloklama) qüvvəsi azalır. Dirsəyi orta vəziyyətdə saxlamaq lazımdır. Gövdəyə endiriləcək zərbədən qorunmaq, bazu önünü sağda və solda deyil, bədənin mərkəzində tutmaq lazımdır. Zərbə zamanı əlin və gövdənin əzələləri gərginləşdirilməlidir.

**Problemin aktuallığı.** Göstərilən üsul, priyom və vasitələrdən təlimata uyğun olaraq istifadə etməklə məktəblilərin həm fiziki keyfiyyətlərini, həm də özünümüdafiə bacarıqlarını formalaşdırmaq olar.

**Problemin elmi yeniliyi ondan ibarətdir** ki, burada fiziki tərbiyə məşğələlərində şagirdlərdə özünümüdafiə bacarıqlarının formalaşdırılmasında əlbəyaxa döyüş növlərinin metod və priyomlarından istifadənin üsul və vasitələr sistemli şəkildə izah edilmişdir.

**Problemin praktik əhəmiyyəti və tətbiqi**. Məqalədə göstərilən metod və vasitələrdən orta ümumtəhsil məktəblərinin fiziki tərbiyə müəllimləri, məşqçilər, idmançılar və bu sahədə çalışan mütəxəssislər faydalana bilərlər.

**Ədəbiyyat:**


1. Məmmədli S.B., Məmmədli O.B. Əlbəyaxa döyüş. - Bakı: Hərbi nəşriyyat, -2020. - 262 s. səh.7.
2. Əliyev A.Ə. Əlbəyaxa döyüş növləri və əlbəyaxa döyüş. -Bakı, 2012. -s.12
3. Боевые искусства: Китай, Япония / Сост. В.В. Малявин – М, 2012. – 400 с.
4. R.A. Əkbərov. Əlbəyaxa döyüş- Bakı: Mütərcim, -2022. - 197 s.


**E-mail:** nuru93@mail.ru

**Rəyçilər:** *ped. ü. fəls. dok., dos.* **E.R. Hüseynova,**
*ped. ü. fəls. dok.* **M.Z. Heydərova**
**Redaksiyaya daxil olub:** 27.02.2023

*UOT 37.02;371*

***Nuranə Natiq qızı Əliyeva***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Bakı Dövlət Universiteti*

## TƏLİM PROSESİNDƏ HUMANİST YANAŞMANIN ROLU

***Нурана Натиг гызы Алиева***
*докторант по программе доктора философии*
*Бакинский Государственный Университет*

## РОЛЬ ГУМАНИСТИЧЕСКОГО ПОДХОДА В ОБРАЗОВАТЕЛЬНОМ ПРОЦЕССЕ

***Nurana Natig Aliyeva***
*doctorial student in the program of doctor of philosophy*
*Baku State University*

## THE ROLE OF THE HUMANISTIC APPROACH IN THE TEACHİNG PROCESS

**Xülasə.** Məqalədə humanist yanaşmaya əsaslanan təlim mühiti üçün nəzərdə tutulan əsas tələblər açıqlanır. Həmçinin öyrənən mərkəzli təlim modelinin xüsusiyyətləri və bu təlim prosesində sərgilənən müəllim davranışlarına diqqət yetirilir.
***Açar sözlər:*** *təhsil, təlim, humanizm, yanaşma, tələb, öyrənən, öyrədən, davranış*

**Резюме.** В статье описаны основные требования к созданию среды обучения на основе гуманистического подхода. Также в статье акцентируется внимание на характеристиках личностно-ориентированной модели обучения и поведения учителя в этом учебном процессе.
***Ключевые слова:*** *образование, обучение, гуманизм, подход, требование, обучаемый, обучающий, поведение*

**Summary.** The article describes the basic requirements to create a learning environment based on a humanistic approach. Also, the article focuses on the characteristics of the learner-centered learning model and teacher behaviors in this learning process.
***Key words:*** *education, teaching, humanism, approach, requirement, learner, teacher, behavior*

Məlumdur ki, hər bir fərdin bilik, bacarıq və vərdişlərə yiyələnməsi, ümumiyyətlə bütöv bir şəxsiyyət kimi formalaşması təhsilin bir parçası olan təlim prosesində həyata keçirilir. Elə təhsil özü təlim prosesinin nəticəsidir. Təlim prosesində öyrənənləri, ilk öncə, bir dəyər olaraq qəbul etmək, onların gələcək həyatları üçün vacib olan biliklər vermək, duyğu və ehtiyaclarını anlamaq, təbii imkanlarını, potensiallarını kəşf etmək və o yöndə istiqamətləndirmək zəruri hesab edilmişdir. Bütün bunların reallaşması təlim-təhsil prosesində humanist yanaşmanın nəticəsi olaraq tədqiq edilmişdir.

Humanizmin əsasını insan konsepsiyası təşkil edir. O, insanın varlığını, maraq və ehtiyaclarını əsas məqsəd hesab edən bir yanaşmadır. Humanizmə görə, insanlar digər canlılar kimi mexanik davranışlar, yəni hər zaman iradi davranışlar sərgiləməyə bilərlər. Pestalotsinin təbirincə desək, hər bir insan səhv edə bilər. Qüsurlu insan təbiəti buna meyllidir. Bu səbəblə öyrədənin əsas vəzifələrindən biri heç bir cəza üsuluna əl atmadan hər bir şagirdin sərgilədiyi yanlış davranışların səbəblərini araşdırmaq, onların həll yolunu tapmaq və düzgün istiqamətləndirməkdən ibarətdir.

Sinifdə humanist təlim mühitinin formalaşdırılması üçün aşağıdakı *tələblər* əsas hesab edilmişdir:

✓ təlim prosesinin mərkəzində şagird və onun potensial və qabiliyyətləri durmalıdır;

✓ öyrənənlərin hiss və duyğuları onların əldə etdikləri biliklər qədər önəmli hesab edilməlidir;

✓ şagirdlərdə öyrənməyə qarşı istək və maraq inkişaf etdirilməli və onlara hazır biliklər vermək əvəzinə necə öyrənmənin texnika və üsulları öyrədilməlidir;

✓ öyrənənlərə nəyi öyrənmək istədiklərini seçə bilmək üçün sərbəstlik və müstəqillik verilməlidir;

✓ sinifdə bir güvən mühiti inşa edilməlidir;

✓ öyrənən müstəqil şəkildə qərar verə bilməlidir;

✓ düşüncədə fərqlilik önəm daşımalıdır;

✓ təlim prosesində rəqabət birgə əməkdaşlıq, qarşılıqlı hörmət və yardım ilə əvəz olunmalıdır;

✓ öyrənənlərdə özdəyərləndirmə, özgüvən və özünə hörmət bacarıqları inkişaf etdirilməlidir;

✓ sinifdə şagirdlərə təhlükəsiz, təhdidsiz, təhqirsiz və fiziki cəzalara yol verilməyən mühit yaradılmalıdır.

Araşdırılmışdır ki, bu tələblərin həyata keçdiyi təlim mühitində şagirdlər həyat boyu öyrənən şəxs kimi yetişəcəklər. [6, s 201]

*Təlim prosesində humanist yanaşmanın əsas xüsusiyyətləri*

✓ Hər bir insanın daxilində təbii öyrənmə istəyi vardır. Humanist yanaşmanın nəzərə alındığı sinif mühitində hər bir şagirdin maraqları təmin edilir və onlara özləri üçün nəyin önəmli və əhəmiyyətli olduğunu kəşfetmə sərbəstliyi verilir.

✓ Təlim prosesində əldə edilən biliklər və öyrənilən mövzular şagirdlərin ehtiyac və məqsədlərinə uyğun olduqda, daha keyfiyyətli öyrənmə mühiti ortaya çıxacaqdır. Buna görə də, öyrənmə məqsədə yönəlik olmalı və şagirdin bilmə ehtiyacını qarşılamalıdır.

✓ Keyfiyyətli təlim öyrənənin səhvetmə qorxusunun və təhdidin olmadığı müstəqil və demokratik bir mühitdə həyata keçir.

✓ Təlim prosesinin mərkəzində öyrənən dayanır. Humanist yanaşmaya əsaslanan təlim prosesi şagirdin həm idrak qabiliyyətlərinin, həm hiss və duyğularının və həm də əl bacarıqlarının inkişaf etdirilməsini əsas məqsəd hesab edir.

Con Dyui (John Dewey) vurğulamışdır ki, hər şey günəş ətrafında hərəkət etdiyi kimi, bütün pedaqoji proses də öyrənənin ətrafında cərəyan etməlidir. Buradan da aydın olur ki, öyrənən mərkəzli təlim humanist təhsilin əsasını təşkil edir. Öyrənən mərkəzli təlim modelinin əsas elementi şagirddir. Təlim prosesi onun istək, imkan və potensialına uyğun qurulmalıdır. Deməli, şagirdlərdə öyrənməyə maraq oyanacaq, tədqiqat, təhliletmə, mühakiməetmə kimi bacarıqları inkişaf edəcək və təlim prosesində əldə etdikləri biliyi gələcək həyatlarında da düzgün şəkildə istifadə etməyi bacaracaqlar. Öyrənən mərkəzli təlim Con Dyuinin demokratik təhsil ideyasının da əsasını təşkil edir. O, öz praqmatik fəlsəfəsi baxımından ənənəvi təlim sistemini (öyrədən mərkəzli təlim) kifayət qədər qeyri-adekvat və yanlış hesab edir [5, s 62]. Bu kontekstdə Con Dyui monoton və əzbərçiliyə əsaslanan ənənəvi təlim sisteminin öyrənən mərkəzli təlim sistemi ilə əvəz olunması ideyasını irəli sürür.

***Öyrənən mərkəzli təlim ilə öyrədən mərkəzli təlimin müqayisəsi [5, s 63]***

| **Tətbiq** | **Öyrənən mərkəzli təlim** | **Öyrədən mərkəzli təlim** |
|---|---|---|
| **Sinifdə fəaliyyət** | İnteraktiv | Öyrədici |
| **Müəllimin rolu** | Fasilitator, mentor, həvəsləndirən, maraq oyadan, motivasiya edən | Hazır bilik verən |
| **Şagirdin rolu** | İştirakçı, aktiv, məsuliyyət daşıyan | Dinləyici |
| **Dərs yükü** | Əlaqələr, birgə əməkdaşlıq | Məlumatlar |
| **Bilik mənimsəmə** | Kəşfetmə, analizetmə, tədqiqetmə | Xatırlama və yadda saxlama |
| **Uğur göstəricisi** | Prosesə görə, performans, keyfiyyət | Zamana görə, kəmiyyət |
| **Ölçmə-dəyərləndirmə** | Fərdi, meyarlara və inkişafa uyğun olaraq | Ümumi, normalara uyğun olaraq |

Funksionalist nəzəriyyəni təhsilə tətbiq edən Con Dyui hesab edirdi ki, hər bir fərd ağıl, dil və iradə kimi qabiliyyətlərini toplum içində istifadə etməyi bacarmalıdır. [5, s 63] Bu səbəbdən o, təkid edirdi ki, məktəb kiçik bir cəmiyyət modeli olaraq bu qabiliyyətləri inkişaf etdirən və onların düzgün şəkildə istifadəsini təmin edən bir qurum olmalıdır. Məktəb hər bir öyrənəni psixoloji, fizioloji, sosial və əxlaqi aspektləri baxımından inkişaf etdirməli, onları cəmiyyətin bir üzvü kimi müstəqil düşünməyə sövq etməlidir. [5, s. 63] Buna görə də, Con Dyui məktəbi cəmiyyətin mərkəzinə, öyrənəni də təlim prosesinin mərkəzinə qoyur. [5, s. 63]

Humanist yanaşmanın əsasını təşkil edən öyrənən mərkəzli təlim prosesində hər bir öyrədənin rolu və davranışları köklü şəkildə dəyişir.

Humanist yanaşmaya əsaslanan təlim prosesində ən təsirli öyrədən modeli:

- ✓ Öyrənənlərə həqiqi hədəflər qoymağı öyrətməyə kömək edir;
- ✓ Təlim prosesində hər fürsətdə yerinə yetirəcəkləri fəaliyyətləri seçmək imkanı verir;
- ✓ Sosial və affektiv bacarıqları inkişaf etdirmək üçün təhsilalanları qrup işi ilə işləməyə və əməkdaşlığı öyrənməyə həvəsləndirir;
- ✓ Öyrənənlərin duyğularına həssaslıqla yanaşır;
- ✓ Təlim prosesində şagirdlərin fikirlərini qəbul edir və hörmətlə yanaşır;
- ✓ Təhdidetmə, təhqiretmə, fiziki cəzalara yol vermir. Əksinə ədalətli şəkildə tərifləməyi, xoş sözlər söyləməyi, xoş təbəssüm göstərməyi bacarır.

Güvənli bir sinif mühiti yaratmaq üçün öyrədən və öyrənən arasında qarşılıqlı hörmət, empatiya, doğruluq və dürüstlük də vacib hesab edilməlidir. Humanist psixologiyanın banisi Karl Rocers öyrənən mərkəzli təlim prosesində bir sıra öyrədən davranışları irəli sürmüşdür. Onları nəzərdən keçirək.

1. Doğruluq və dürüstlük (Authenticity);
2. Dəyər vermə, qəbul etmə, güvənmə (Appreciation, acceptance, confidence);
3. Empatiya (Empathy).

*Doğruluq və dürüstlük (Authenticity)*

Doğruluq hər bir öyrədənin sahib olması lazım olan ən vacib xüsusiyyətdir. Öyrənən mərkəzli təlim prosesində bu davranış müəllimin öyrənənə qarşı düzgün, dürüst, təmənnasız, səmimi və onunla olan münasibətində səthiliyə yol verməməsi mənasını ifadə edir.

*Dəyər vermə, qəbul etmə, güvənmə (Appreciation, acceptance, confidence)*

Öyrənənlərin bir bütün olaraq dəyərləndirilməsi, onların təqdir edilməsi səmərəli öyrənən mərkəzli təlim mühitinin arxasında duran amillərdəndir. Burada hər bir öyrənənin dəyərləndirilməsi dedikdə onların duyğularının, düşüncələrinin, meyl və maraqlarının, istəklərinin və ümumiyyətlə, onların şəxsiyyətinin təqdir edilməsi nəzərdə tutulur. Eyni zamanda, K. Rocers öyrədən-öyrənən arasında öyrədənin öyrənəni qeyd-şərtsiz qəbul etməsi kimi bir əlaqənin olmasının da vacib olduğunu müdafiə etmişdir. Öyrənəni qeyd-şərtsiz qəbul etmək dedikdə, yəni müəllimin öz şagirdini olduğu kimi qəbul etməsi və onun özü olmağına imkan yaratmasıdır. Başqa bir sözlə ifadə etsək, öyrədənin öyrənənə: "Əgər bu və ya o şəkildə davranarsan, səni təqdir edərəm" deyil, "Mən sənə Sən olduğun üçün dəyər verirəm" şəklində mesaj verdiyi bir əlaqədir. [6, s. 401]

Müəllimin öyrənənlərinə dəyər verməsi və onları olduğu kimi qəbul etməsi onlara qarşı olan inam və güvənin həqiqi ifadəsidir. [6, s. 263] Öyrənən-öyrədən arasında güvən və inama dayanan bir əlaqənin qurulması hər bir fərdin daha çox məsuliyyətli və sərbəst şəkildə qərar qəbuletmə kimi xüsusiyyətlərin inkişafına səbəb olacaqdır. Xüsusilə də, öyrənən mərkəzli təlim prosesində hər bir öyrənənin öz fikir və düşüncələrini sərbəst ifadə edə biləcəyi və öz potensiallarını kəşf edə biləcəyi güvənli bir emosional mühit yaratmaq vacibdir. Rocersə görə, öyrənən və öyrədən arasında güclü güvən və inam duyğusuna ehtiyac vardır.

Öyrənənin öz şəxsi potensialına inanan bir müəllim təlim prosesində bununla əlaqədar bütün imkanları ortaya qoyur və hər bir öyrənənin öz doğru yolunu tapmasına şərait yaradır. Başqa sözlə ifadə etsək, şagirdinə inanan bir müəllim onun həyatda məsuliyyətli olmasına, bənzərsizliyini dərk etməsinə, öz istək və meyllərinin fərqinə varmasına və özünü bir bütün kimi qəbul etməsinə kömək edir. Hər növ səhvinə baxmayaraq, ona inanıldığını hiss edən öyrənənin özgüvəni və şəxsi inkişaf motivasiyası artar. [6, s 160]

*Empatiya (Empathy)*

Keyfiyyətli və səmərəli təlim prosesini həyata keçirmək üçün müəllimin sərgilədiyi davranış və rəftarlardan biri də empatiyadır. K. Rocers bu anlayışı "başqasının dünyasına girmək və orada öz evindəymiş kimi hiss etmək" şəklində ifadə etmişdir. Empatiya özünü öyrənənin yerinə qoymaq, dünyanı onun gözləri ilə görməkdir. Buraya öyrənənin daxili aləminə nüfuz etmək, psixi halını duymaq və sevinc və kədərlərini bölüşmək kimi bacarıqlar aiddir. Bu bacarığa sahib olan bir müəllim hər bir öyrənənin öz daxili dünyasını qavraya bilirsə, idarə etdiyi təlim-tərbiyə prosesinin şagird müstəvisində necə göründüyünü anlaya və onun hiss etdiyi duyğuları ayırd edə bilirsə, o zaman o, səmərəli bir öyrənmə mühitini qurmuş olacaqdır. Çünki bu vəziyyətdə müəllim öyrənənin gizli dünyasına yol tapmış, öyrənən isə artıq öz "Mən"ini kəşf etmişdir. [6, s 260]

Araşdırılmışdır ki, doğruluq və dürüstlük, qəbul etmə, dəyər vermə, güvənmə və empatiya kimi müəllim davranışlarının sərgiləndiyi təlim-tərbiyə prosesində hər bir öyrənən aşağıdakı keyfiyyətlərə yiyələnir:

- ✓ Hər bir fərd fərqli düşüncəyə sahib olur;
- ✓ Öz "Mən"ini kəşf edər;
- ✓ Özgüvən, problem həll etmə, məntiqi düşünmə, fərqli görüşlərə sahib olma, seçicilik və özdəyərləndirmə kimi bacarıqlara yiyələnər;
- ✓ Yaradıcı və yenilikçi olar;
- ✓ Daha çevik qavrayış və təfəkkürə sahib olar;
- ✓ Dürüst və etik davranış sərgiləyər;
- ✓ Özü özünü idarə etmə qabiliyyəti inkişaf edər.

Bugünkü təhsilin əsas məqsədi yaradıcı və yenilikçi, fərqli düşünə bilən, problem həll etməyi bacaran, çevik qavrayış və təfəkkürə sahib olan, özdəyərləndirmə, özgüvən və seçicilik kimi bacarıqlara yiyələnən, dürüst və etik davranış sərgiləyən insan yetişdirməkdir. Bunlar hətta XXI əsrin əsas tələblərindən hesab olunur. Hər bir öyrənənin bu bacarıqlara yiyələnməsinin yalnız humanist təlim mühitində həyata keçməsi aşkar edilmişdir. Demək ki, humanizm ideyasının tarixi əvvəlki dövrlərə təsadüf etsə də, bu gün də öz təsirini itirməmişdir.

**Problemin aktuallığı.** Tarix boyu təlim prosesində müxtəlif yanaşmalar mövcud olmuşdur. Onların içərisində humanizm 100 il bundan əvvələ təsadüf etməsinə baxmayaraq, bu gün də öz təsirini itirməmişdir. Ona görə ki, bugünkü təhsilin irəli sürdüyü tələblərin humanist təlim mühitində həyata keçməsi ən önəmli, prioritet məsələlərdən biridir.

**Problemin elmi yeniliyi.** Humanist yanaşmaya əsaslanan təlim prosesində hər bir öyrənən öz potensial və qabiliyyətlərini kəşf edir, fərqli düşüncəyə sahib olur və hər zaman öyrənməyə maraqlı olur.

**Problemin praktik əhəmiyyəti.** Məqalə tədris müəssisələrində çalışan müəllimlərin dərsi daha səmərəli təşkil edəcəklərinə şərait yaradacaq. Eyni zamanda, məqalə gənc tədqiqatçılar üçün faydalı olacaq.

**Ədəbiyyat:**


1. Ağayev, Ə. Təlim prosesi: Ənənə və müasirlik. / Ə. Ağayev, S. Hüseynli. -Bakı, 2006. -102 s.
2. Hüseynzade, R.L. Öğretmen-öğrenci ilişkileri. / R.L. Hüseynzade. Türkiye, -Adana, 1997. -157 s.
3. Rüstəmov F. Humanist pedaqogika, yoxsa pedaqogikada humanizm?// Azərbaycan məktəbi, 2017, № 5
4. Maslow, A. H. İnsan olmanın psikolojisi. / A. H. Maslow. -İstanbul: Kuraldışı Yay, -2019, 244 s.
5. Bakır, K. Demokratik eğitim (John Dewey'in eğitim felsefesi üzerine). / K. Bakır. -Ankara: Pegem Akademi., -2015, -92 s.
6. Rogers, C.R. Yarının insanı./ C.R. Rogers. -İstanbul: Okuyanus Yay., -2019, -342s
7. Rogers, C.R. Kişi olmaya dair. / C.R. Rogers. -İstanbul: Okuyanus Yay., -2019. -578 s.
8. Rogers, C. R. Client- centered therapy. / C.R. Rogers. -Boston, MA: Houghton Mifflin Company. -1965.
9. Rogers, C.R. Freedom to learn. / C.R. Rogers. -Columbus, Ohio: Charles E. Merril Publishing. -1969.
10. www.edu.gov.az


**E-mail:** aliyevanurana0@gmail.com

**Rəyçilər***: ped.elm.dok., prof.* **L.N. Qasımova**
*ped.elm.dok., prof.* **R.L. Hüseynzadə**
**Redaksiyaya daxil olub:** 14.02.2023.

*UOT 37.0*

***Əli Xudaverdi oğlu Ağacanlı***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Azərbaycan Respublikasının Təhsil İnstitutu*

# TƏBİƏT FƏNLƏRININ TƏLIMINDƏ MÜASIR ÇAĞIRIŞLAR: ELMİ SAVADLILIQ NƏDİR VƏ NƏ ÜÇÜN VACİBDİR?

***Али Худаверди оглы Агаджанлы***
*докторант по программе доктора философии*
*Институт Образования Азербайджанской Республики*

# СОВРЕМЕННЫЕ ВЫЗОВЫ В ПРЕПОДАВАНИИ ЕСТЕСТВЕННЫХ НАУК: ЧТО ТАКОЕ НАУЧНАЯ ГРАМОТНОСТЬ И ПОЧЕМУ ОНА ВАЖНА?

***Ali Khudaverdi Aghajanli***
*doctorial student in the program of doctor of philosophy*
*Institue Education of the Republic of Azerbaijan*

# MODERN CHALLENGES IN SCIENCE TEACHING: WHAT IS SCIENTIFIC LITERACY AND WHY IS IT IMPORTANT?

**Xülasə.** Məqalədə elmi savadlılıq səriştəsinin hansı mənanı ifadə etdiyi və şagirdlərdə bu səriştənin formalaşdırılmasının zəruriliyi araşdırılır. Burada, həmçinin şagirdlərimizin PİSA və TİMSS beynəlxalq tədqiqatlarında elmi savadlılıq səriştəsi üzrə nümayiş etdirdikləri nəticələr məzmun baxımından təhlil edilmişdir. PİSA və TİMSS kimi beynəlxalq tədqiqatlarda uğurlu nəticələri olan ölkələrin ibtidai və orta təhsil sistemlərində şagirdlərin elmi savadlılıq səriştəsinin formalaşdırılmasına böyük diqqət yetirilir. Bu səriştə, əsasən, inteqrativ “Science” fənni vasitəsilə yerinə yetirilir.

***Açar sözlər**: təbiət fənni, elmi savadlılıq, PİSA 2018, TİMSS 2019, XXI əsr bacarıqları, müasir çağırışlar*

**Резюме.** В статье исследуется значение компетенции научной грамотности и необходимость формирования этой компетенции у учащихся. Здесь также были проанализированы с точки зрения содержания результаты научной грамотности наших учеников в международных исследованиях PISA и TIMSS. Большое внимание в статье уделено формированию научной грамотности учащихся в системах начального и среднего образования стран, получивших успешные результаты международных исследований PISA и TIMSS. Данная компетенция в основном реализуется посредством интегративного предмета «Science».

***Ключевые слова**: естественные науки, научная грамотность, PISA 2018, TIMSS 2019, умения XXI века, современные вызовы*

**Summary.** The article examines the meaning of scientific literacy competence and the necessity of forming this competence in students. Here, the results of our students' scientific literacy competence in PISA and TIMSS international studies were analyzed in terms of content. In the primary and secondary education systems of countries with successful results in PISA and TIMSS international studies, great attention is paid to the formation of scientific literacy competence in students. This competence is mainly fulfilled through the integrative subject "Science".

***Key words**: science, scientific literacy, PISA 2018, TIMSS 2019, 21st century skills, modern challenges*

Son illərdə təbiət fənlərinin təlimində elmi savadlılıq anlayışından tez-tez istifadə edildiyi müşahidə olunur. Azərbaycan Respublikası Elm və Təhsil Nazirliyi şagirdlərimizdə sistemli olaraq elmi savadlılıq səriştəsinin formalaşdırılması məqsədilə onların müxtəlif beynəlxalq tədqiqatlarda iştirakını təmin etməklə yanaşı, təbiət fənlərinin təliminin təkmilləşdirilməsi və yeni məzmunlu dərsliklərin hazırlanmasına start verdi.

*Elmi savadlılıq nədir və o hansı xüsusiyyətlərə malikdir?*

Elmi savadlılıq anlayışı ilk dəfə XX əsrin 50-ci illərində Paul De Hbart (Hurd, 1958) tərəfindən işlənmişdir: “Təhsillə bağlı çox ciddi problemlərdən biri elmi nailiyyətlərin zənginliyi ilə elmi savadlılıq arasındakı boşluqları doldurmaqdır” [1]. Anlayış yarandığı ildən bu günə qədər beynəlxalq təhsil ictimaiyyətinin araşdırdığı ən aktual problemlərdən biri olmuşdur. Elmi savadlılıq şagirdlərdən elmi araşdırmanın məqsədi, təbiət haqqında etibarlı biliklər yaratmaq haqqında müəyyən qədər anlayışa malik olmağı tələb edir [2].

Şagirdlərdə elmi savadlılıq səriştəsinin formalaşdırılması, inkişaf etdirilməsi və qiymətləndirilməsi ilə bağlı böyük miqdarda beynəlxalq tədqiqatlar mövcuddur. Elmi savadlılıq anlayışı geniş şəkildə tanınan təhsil anlayışıdır və əsas təhsil məqsədinə çevrilmişdir [3; 4]. Eyni zamanda, elmi savadlılıq səriştəsinin formalaşdırılması istiqamətində tədqiqatların davamlılığı bu anlayış haqqında birmənalı tərifin olmadığına gətirib çıxarır. Elmi savadlılığa uzun illərdir diqqət yetirilir, lakin onun tərifi ilə bağlı, demək olar, ümumi razılıq yoxdur [5]. Qeyd edək ki, müasir informasiya axını dövründə müxtəlif platformalarda fərqli məqsədlərlə elmi əsası olmayan faktlar və hadisələr haqqında bir çox məlumatlar paylaşılır. Buna nümunə kimi son illərdə Covid-19 pandemiyasının meydana çıxması, zəlzələlər, vulkan püskürmələri, daşqınlar, tornadolar və s. kimi təbii fəlakətlərin baş verməsi haqqında yayılan həqiqəti əks etdirməyən məlumatları misal göstərmək olar. Yayılan bu tipli informasiyaların gerçək, yoxsa təxribat xarakterli olduğunu müəyyən edə bilmək üçün problemə tənqidi yanaşaraq onun elmi faktlara və təcrübələrə nə dərəcədə əsaslandığı araşdırılmalıdır. Gənclərin elmi savadlılıq adlanan bu səriştəyə sahib olması məqsədilə ümumtəhsil müəssisələrində tədqiqat əsaslı öyrənmə mühiti formalaşdırılmalı, onlarda təbiət fənlərinə maraq mühiti yüksəldilməlidir. Dərslikdən əhəmiyyətli dərəcədə asılı olan təhsil sistemimizdə belə mühit aktiv təlim metodlarının tətbiqinə əsaslanan inteqrativ məzmunlu dərslik komplektləri vasitəsilə mümkündür. "Elmi savadlılıq o deməkdir ki, insan qazandığı biliklər əsasında gündəlik təcrübələr haqqında maraqdan irəli gələn suallara cavab verə bilər. Bu, insanın təbiət hadisələrini təsvir etmək, izah etmək, proqnozlaşdırmaq, dəyərləndirmək qabiliyyətinə malik olması deməkdir" [6].

PİSA-nın təbiət elmləri üçün çərçivə sənədində qeyd edilir ki, elmi savadlılıq – təbiət elmlərinin əsaslarına dair əldə olunan bilik və bacarıqların qiymətləndirilməsi üçün mərkəzi struktur kimi əsas rol oynayır. Bu sənəddə PISA -ın elmi savadlılığı ölçmək üçün istifadə etdiyi alətlərin strukturunda əksini tapan məzmun, bilik sahəsi və səriştənin növü qeyd olunur. [7] PİSA tədqiqatlarında şagirdlərin oxu, riyazi və elmi savadlılıq bacarıqları yoxlanılır. Üç ildən bir keçirilən bu tədqiqatlarda elmi savadlılıq üç elmi səriştə ilə müəyyən edilir və qiymətləndirilir. Bunlar aşağıdakılardır:

- hadisələri elmi şəkildə izah etmək;
- elmi araşdırmaları qiymətləndirmək və layihələndirilmək;
- məlumat və sübutları elmi şəkildə şərh etmək.

PİSA sənədlərində, həmçinin qazanılan elmi bilikləri real həyati situasiyalara tətbiq edə bilməyin vacib olduğu vurğulanır [7].

*Elmi savadlılıq nə üçün vacibdir?*

Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası təhsilalanların XXI əsrin tələblərinə uyğun hazırlanmasını və bunun üçün səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılması nəzərdə tutur. “Amerika Birləşmiş Ştatlarında və bütün dünyada təhsil islahatına çağırışlar XXI əsrin əmək bazarının tələblərinə uyğun elmi savadlılıq səriştəsinə yiyələnmiş işçi qüvvəsinə ehtiyac olduğu vurğulanır”.[8] “Elmi savadlılıq müxtəlif ölkələrdə “science” təhsilinin qloballaşmasını sürətləndirməyə kömək edən milli kurikulumun əsas tərkib hissəsidir”.[9]

Dünya iqtisadi Forumu tərəfindən elan olunan sənəddə XXI əsr bacarıqları təməl savad-

lılıqlar, səriştələr və şəxsi keyfiyyətlər olaraq üç kateqoriyaya bölünmüşdür. Təməl savadlılıq kateqoriyası üzrə 6 növ (Oxuma-yazma, hesablama, elmi savadlılıq, İKT savadlılığı, maliyyə savadlılığı, mədəni və mülki savadlılıq) savadlılıq qeyd olunmuşdur ki, onlardan biri də elmi savadlılıqdır. Bu kateqoriyada təməl savadlılıq şagirdlərin zəruri bacarıqlarını gündəlik həyati məsələlərə necə tətbiq edəcəyini əks etdirir [10].

Dövrümüzdə sürətli inkişafın əsasında mövcud bilik və yaradıcı düşüncənin məhsulu olan ideyaların yüksək texnologiyaların dəstəyi ilə tətbiq edilməsidir. “Elm əzbərlə öyrənilən faktlar və prinsiplər toplusu deyil. O, dünyaya baxmaq və suallar vermək üsuludur. Elmi savadlılıq təkcə alim və ya mühəndis olmaq istəyənlər üçün deyil, həm də yaxşı vətəndaş olmaq üçün lazımdır" [11]. Vətəndaşla elmi savadlılığı birləşdirən anlayış isə “Vətəndaş elmi savadlılığı” kimi təqdim edilir. "Vətəndaş elmi savadlılığı (Civil Scientific Literacy), vətəndaşın elm və ya texnologiya ilə bağlı siyasət seçimlərinin ictimai müzakirəsində iştirak etmək üçün elm və texnologiya haqqında məlumatı toplamaq, dəyərləndirmək və istifadə etmək bacarığına aiddir" [12].

Təhsildə olan çatışmazlıqları və gələcək hədəfləri bütün çıxışlarında qeyd edən Elm və Təhsil naziri elmi savadlılığın vacibliyini belə vurğulamışdır: “Elmlə bağlı savadlılıq səviyyəsini mümkün qədər artırmalıyıq. Bizim şagirdlərimiz elmi savadlılığa malik olmalıdır və təhsilimizdə bu səpkidə dəyişikliklər baş verməlidir” [13]. Cənab nazirin qaldırdığı problemin aktuallığı PİSA və TİMSS kimi beynəlxalq tədqiqatlarda şagirdlərimizin elmi savadlılığının hansı səviyyədə olduğunu əks etdirən statistik məlumatlarla öz təsdiqini tapır.

Azərbaycan 2011 və 2019-cu illərdə 4-cü siniflər üzrə təşkil olunan TİMSS qiymətləndirmə tədqiqatlarında, 2018-ci ildə isə 8-ci siniflər üzrə PİSA tədqiqatlarında iştirak etmişdir. Təəssüflər olsun ki, hər iki tədqiqatda şagirdlərimizin elmi savadlılıq üzrə nəticələri çox aşağı olmuşdur. Cədvəl 1-də şagirdlərimizin TİMSS, cədvəl 2-də isə PİSA tədqiqatlarındakı elmi savadlılıq səriştəsi üzrə göstəriciləri əksini tapmışdır. Cədvəllərdən göründüyü kimi, şagirdlərimizin nəticələri beynəlxalq orta nailiyyət qiymətindən, uyğun olaraq TİMSS üzrə 64, PİSA üzrə isə 78 ölkə arasında aşağı olmaqla yanaşı, əvvəlki illərin tədqiqat nəticələrindən də aşağı olmuşdur. TİMSS və PİSA proqramlarında elmi savadlılıq üzrə beynəlxalq orta göstəricilər 500 və 487 olduğu halda, şagirdlərimizin orta göstəricisi uyğun olaraq TİMSS-də 427, PİSA-da isə 389-dur.

***Cədvəl 1.*** *Elmi savadlılıq üzrə orta nailiyyət (TIMSS 2019) [14]*

| Sıra № | Ölkələr | Orta qiymət göstəricisi |
|---|---|---|
| 1 | Sinqapur | 595 |
| 2 | Koreya, | 588 |
| 3 | Rusiya | 567 |
| 4 | Yaponiya | 562 |
| 5 | Çin,Taypeyi | 558 |
| 6 | Finlandiya | 555 |
| 7 | Latviya | 542 |
| 8 | Norveç | 539 |
| 9 | ABŞ | 539 |
| 10 | Litva | 538 |
| | Beynəlxalq orta göstərici | 500 |
| … 50 | Azərbaycan | 427 |

*Cədvəl 2. Elmi savadlılıq üzrə orta nailiyyət (PİSA 2018) [15]*

| Sıra№ | Ölkələr | Orta qiymət göstəricisi |
|---|---|---|
| 1 | China (Beijing, Shanghai, Jiangsu, Zhejiang) | 590 |
| 2 | Singapore | 551 |
| 3 | Macao | 544 |
| 4 | Estonia | 530 |
| 5 | Japan | 529 |
| 6 | Finland | 522 |
| 7 | South Korea | 519 |
| 8 | Canada | 518 |
| 9 | Hong Kong, China | 517 |
| 10 | Taiwan | 516 |
| | Beynəlxalq orta göstərici | 487 |
| …62 | Azərbaycan | 398 |

**Cədvəl 3**-də 2019-cu il TİMSS tədqiqatının təbiət fənləri üzrə elmi savadlılıq nəticələri təsvir edilmişdir. Birinci sütundakı siyahıda tədqiqatda ilk onluğu tutan ölkələr verilimişdir. Digər sütunlarda isə imtahan olunan mövzuların neçə faiz əhatə olunduğu göstərilmişdir. Cədvəldən göründüyü kimi, TİMSS tədqiqatlarında 4-cü sinif təbiət elmləri üzrə tədqiqat suallarında 26 mövzu əhatə olunmuşdur. Azərbaycan təhsil sistemində uyğun təhsil pilləsi üzrə bu mövzuların 58 faizi və ya 15 mövzu tədris olunur. Mövzuların əhatə olunması üzrə ölkələrin orta göstəricisinin 60% olduğunu və ilk 10-luqdakı ölkələrin əksəriyyətinin göstəricisinin isə 60%-dan aşağı olduğunu nəzərə alsaq, imtahan mövzularının 58%-i əhatə olunduğu halda, şagirdləri-mizin nəticəsi çox aşağıdır. Bu göstəricilər onu deməyə imkan verir ki, şagirdlərimizin nəticələrinin aşağı olması, təkcə akademik biliklərin yetərsizliyindən irəli gəlmir. Şagirdlərimiz qazandıqları bilikləri praktiki məsələlərin, xüsusi ilə situasiya məzmunlu tapşırıqların həllinə tətbiq edə bilmirlər. Bu isə şagirdlərimizdə elmi savadlılıq səriştəsinin lazımı səviyyədə formalaşmadığını göstərir.

**Cədvəl 3**. TİMSS təbiət elmləri üzrə imtahan mövzuların hər ölkə üzrə təhsil sistemində əhatə olunma göstəricisi [17]

| **Sıra №** | **Ölkə** | **Bütün Mövzular (26 mövzu)** | **Həyat elmi (7 mövzu)** | **Fiziki elmlər (12 mövzu)** | **Yer elmi (7 mövzu)** |
|---|---|---|---|---|---|
| 1 | Sinqapur | 39 | 51 | 54 | 2 |
| 2 | Koreya, | 48 | 55 | 46 | 46 |
| 3 | Rusiya | 66 | 89 | 40 | 87 |
| 4 | Yaponiya | 39 | 41 | 45 | 26 |
| 5 | Çin ,Taypeyi | 50 | 64 | 51 | 35 |
| 6 | Finlandiya | 54 | 70 | 46 | 54 |
| 7 | Latviya | 74 | 75 | 74 | 74 |
| 8 | Norveç | 48 | 57 | 34 | 61 |
| 9 | ABŞ | 70 | 74 | 66 | 74 |
| 10 | Litva | 76 | 90 | 69 | 72 |
| …50 | Azərbaycan | 58 | 65 | 42 | 77 |
| | Beynəlxalq Orta | 60 | 73 | 58 | 60 |

**Problemin aktuallığı.** Şagird nailiyyətlərinin qiymətləndirilməsi üzrə nüfuzlu beynəlxalq təşkilatların tədqiqatlarında şagirdlərimizin elmi savadlılıq göstəricilərinin zəif olması, bu səriştənin formalaşdırılması probleminin həllinin aktuallığını müəyyən edir.

**Problemin elmi yeniliyini.** Problemin elmi yeniliyini aşağıdakı müddəalar təşkil edir:

-ümumi icbari təhsilin hər iki səviyyəsində təbiət fənlərinin təlimində şagirdlərdə elmi savadlılıq səriştəsinin formalaşdırılması, onlarda qazanılan biliklərin həyati və texnoloji proseslərə tətbiq edə bilmək bacarıqlarının inkişaf etdirilməsinin əsaslandırılması;

-ümumi icbari təhsilin hər iki səviyyəsində şagirdlərdə elmi savadlılıq səriştəsinin formalaşdırılması məqsədilə təbiət fənlərinin tədrisi metodikasına vahid yanaşma nümunəsinin işlənməsi.

**Problemin nəzəri və praktik əhəmiyyəti.** Ümumi icbari təhsilin hər iki səviyyəsində şagirdlərdə elmi savadlılıq səriştəsinin formalaşdırılmasının yeni metod və texnologiyalarını işləməklə təbiət fənlərinin tədrisi metodikasının təkmilləşdirilməsinə zəmin yaratmaqdır.

**Ədəbiyyat:**


1. Hurd, P.D. (1958). Science literacy: Its meaning for American schools. Educational Leadership 16 (1), 1316.
2. Ziman, J. (1978), Reliable Knowledge: An Exploration of the Grounds for Belief in Science, Cambridge University Press
3. De Boer, G. E. (2011). The globalization of science education. Journal of Research in Science Teaching, 48(6), pp.. 567-591.
4. Hodson, D. Looking to the future: Building a curriculum for social activism. International Journal of Environmental & Science Education Vol. 6, No. 3, July 2011, pp.315-320
5. Salamon,E. Scientific Literacy in Higher Education. Paper Commisssioned by Tamaratt Teaching Professorship, 2007.
6. OECD (2019), “PISA 2018 Science Framework”, in PISA 2018 Assessment and Analytical Framework, OECD Publishing, Paris. (pp. 97-99)
7. National Academies of Sciences, Engineering, and Medicine. 1996. National Science Education Standards. Washington, DC: The National Academies Press. https://doi.org/10.17226/4962.
8. Scientific Literacy and Purposes for Teaching Science: A Case Study of Lebanese Private School Teachers, International Journal of Environmental & Science Education Vol. 4, No. 3, July 2009, pp. 289-299
9. Roberts & Bybee, R. W. Scientific literacy, science literacy, and science education. In N. G. Lederman & S. K. Abell (Eds.), Handbook of research on science education. - 2014.
10. World Economic Forum, New Vision for Education. 2015.
11. Thier, M., & Daviss, B. The new scienceliteracy: Using language skills to help students learn science. Portsmouth, NH: Heinemann. 2002.
12. Miller, Jon D. 2012. The Sources and Impact of Civic Scientific Literacy. In, Bauer, M. W., Shukla, R. & Allum, N. (Eds.), The Culture of Science: How the Public Relates to Science Across the Globe. New York: Routledge. Pp. 217-240.
13. https://apa.az/az/sosial/nazir-elmi-savadliliq-seviyyesi-artirilmali-yerli-kurikulumlarla-bagli-islahatlar-aparilmalidir-730202
14. IEA's Trends in International Science and Science Study - TIMSS 2019 http://timss2019.org/download
15. OECD, PISA 2018 Database, Tables I.B1.10, I.B1.11, I.B1.12, I.B1.26 and I.B1.27.


**E-mail:** a.agacanli@arti.edu.az

**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **R. Abdurazaqov**,
*ped.ü.fəls.dok.* **X.A. Talıbova**
**Redaksiyaya daxil olub:** 20. 02.2023

# *DİSTANT TƏHSİLİN AKTUAL PROBLEMLƏRİ*
# *АКТУАЛЬНЫЕ ПРОБЛЕМЫ ДИСТАНЦИОННОГО ОБРАЗОВАНИЯ*
# *ACTUAL PROBLEMS OF DISTANCE EDUCATION*

*UOT 159.9*

***Məhərrəm Sabir oğlu Əliyev***
*psixologiya üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*

***Vüqar İlqar oğlu Əsgərov***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

## DİSTANT (ONLAYN) TƏHSİL ANLAYIŞI VƏ ONUN İMKANLARI

***Магеррам Сабир оглы Алиев***
*доктор философии по психологии, доцент*
*Азербайджанский Государственный Педагогический Университет*

***Вугар Ильгар оглы Аскеров***
*Азербайджанский Государственный Педагогический Университет*

## ПОНЯТИЕ ДИСТАНЦИОННОГО (ОНЛАЙН) ОБРАЗОВАНИЯ И ЕГО ВОЗМОЖНОСТИ

***Maharram Sabir Aliyev***
*doctor of philosophy in psychology, associate professor*
*Azerbaijan State Pedagogical University*

***Vugar Ilgar Askerov***
*Azerbaijan State Pedagogical University*

## UNDERSTANDING DISTANCE (ONLINE) EDUCATION AND ITS POSSIBILITIES

**Xülasə:** Elmi məqalədə müəlliflər tərəfindən distant (onlayn) təhsil anlayışının izahı verilmiş və onun aktuallığı əsaslandırılmışdır. Məqalədə distant təhsilin üstünlükləri ardıcıllıqla şərh edilmişdir. Müəlliflərin fikrincə, distant təhsil tələbə və şagirdlərin fiziki olaraq eyni mühitdə olmadığı bir texnologiyadır. Bu sistem təhsil texnologiyaları tərəfindən öyrənilən bir fenomendir.
***Açar sözlər:*** *distant təhsil, informasiya texnologiyaları, pandemiya şəraiti, informasiya təhsil mühiti, komponentlər*

**Резюме:** В научной статье авторы разъяснили понятие дистанционного (онлайн) образования и обосновали его актуальность. В статье последовательно объясняются преимущества дистанционного образования. По мнению авторов, дистанционное обучение – это технология, при которой студенты и учащиеся физически не находятся в одной среде. Эта система является феноменом, изучаемым образовательными технологиями.
***Ключевые слова:*** *дистанционное образование, информационные технологии, условия пандемии, информационная образовательная среда, компоненты*

**Summary:** In a scientific article, the author explained the concept of distance (online) education and substantiated its relevance. The article consistently explains the benefits of distance education. According to

the author, distance learning is a technology in which students and students are not physically in the same environment. This system is a phenomenon studied by educational technologies.

***Key words:*** *distance education, information technology, pandemic conditions, information educational environment, components*

Distant təhsil müasir təhsilalma forması olub məsafədən öyrənməni, eləcə də onlayn şəkildə keçilən dərsləri əhatə edir. Distant təhsil bir-birindən müxtəlif məsafədə olan yeniyetmələri, təhsil müəssisəsi arasında informasiya mübadiləsini operativ və səmərəli təşkil etməyə imkan verən, proqram-texniki vasitələr əsasında qurulmuş xüsusi informasiya-təhsil mühitinin köməyi ilə geniş əhali kütləsinə təqdim edilən təhsil xidmətidir. Dünyada yaranan pandemiya şəraiti distant təhsilalma formasını daha da vacib etmişdir. Ona görə də bu təhsilalma formasına artan tələbat günü-gündən aktuallaşır.

Müasir şəraitdə distant təhsil informasiya texnologiyaları vasitələrindən istifadə etməklə yeni tədris texnologiyalarının tədqiqini həyata keçirir və tədrisin keyfiyyətini yüksəltmək məqsədini daşıyır. Distant təhsil metodunun kifayət qədər uzun tarixi vardır. Bu təhsildən ideya kimi ilk dəfə *Yan Amos Komenskinin* 1633-1638-ci illərdə qələmə aldığı "*Böyük didaktika"* əsərində bəhs olunmuşdur. Onun yaradıcısı isə *İsaak Pitman* hesab olunur. O, 1840-cı ildən başlayaraq birləşmiş Krallıqda yeniyetmələrin poçt göndərişləri vasitəsi ilə stenoqrafiya təhsilini həyata keçirmişdir.

Amerikada isə XIX əsrin 70-ci illərində distant təhsilin təşkil olunmasına ilk cəhdlər olunub. 1873-cü ildə *Anna Eliot Tiknor* poçt vasitəsi ilə qadınların təhsil sistemini hazırlayıb və onu *Tiknor cəmiyyəti* adlandırıb. 1874-cü ildə isə poçt vasitəsi ilə təhsil proqramı *İllinoys ştatının* universiteti tərəfindən təklif olunub. Amerikada *poçt vasitəsi ilə təhsilin atası* hesab olunan *Vilyam Reyni Harper* 1892-ci ildə Çikaqo Universitetində distant təhsilin ilk bölməsini təsis edir. 1906-cı ildə poçt vasitəsi ilə tədris artıq Viskonski ştatının universitetində də tətbiq olunmağa başlayıb. Az bir vaxtda distant təhsil Avstraliyada da yayılır. 1911-ci ildə Brisbendəki Kvinslend Universitetində ali məktəb səviyyəsində distant təhsil üzrə ilk kurslar açılır. 1914-cü ildə adi məktəblərdən kənarda yaşayan uşaqlar üçün ibtidai təlim proqramı üzrə poçt vasitəsi ilə tədris təşkil olunur. Məktəblər üçün bu cür sistemdən tezliklə Kanadada və Yeni Zelandiyada da istifadə olunur.

Dünyada tələbələrə distant təhsil təklif edən universitetlər hazırda *virtual universitet, açıq universitet* adları ilə tanınır. Kanada Açıq Universiteti, Hollandiya Açıq Universiteti, Fern Universiteti (Almaniya) və Britaniya Açıq Universitetini buna nümunə göstərmək olar. Sadaladığımız bu universitetlər illərdir sistemli şəkildə təhsillərini distant formada verirlər. Bu təhsildən yararlananların sayı son zamanlar daha da artır.

Azərbaycanda təhsilalmanın bu forması rəsmi şəkildə 2009-cu ildə qəbul olunmuş *Təhsil haqqında* Azərbaycan Respublikasının Qanununda öz təsdiqini tapmışdır. Həmin Qanunun 13-cü maddəsinə əsasən əyani, qiyabi, sərbəst (eksternat) təhsilalma formaları ilə yanaşı, distant (məsafədən) təhsilalma da mövcuddur. Respublikamızda 2020-ci ilədək bu təhsilalma forması tətbiq olunmasa da yeni növ koronavirus (COVID-19) pandemiyasının yayılmasının qarşısını almaq məqsədilə bütün təhsil müəssisələrində əyani təhsil məhdudlaşdırılmış, tədricən distant təhsilə keçirilmişdir.

Hazırda bütün dünya qeyri-adi vəziyyətdədir. Pandemiya ilə əlaqədar bütün ölkələr karantin tədbirlərinə əməl etməyə məcburdur. Bu vəziyyət uşaqların dərslərini evdə, onlayn davam etdirmələri ilə nəticələnmişdir. Məktəblərin işinin və tədris prosesinin distant təhsilə keçirilməsi qərarı uşaqların sağlamlığını maksimum dərəcədə artırmaq üçün qəbul edilmişdir. Lakin 2020-ci ildə baş verən dünya hadisələri məktəbləri şagirdlərini distant təhsilə köçürməyə məcbur etdi və müəyyən müddətdən sonra uşaqlar tamamilə onlayn öyrənməyə başladılar.

Distant təhsil müəllim və şagirdlərin məsafədən qarşılıqlı əlaqəsidir. Bu əlaqə təhsil prosesinə xas olan bütün komponentləri (məqsədlər, məzmun, metodlar, formalar, təlim vasitələri) əks etdirir, internet texnologiyalarının xüsusi vasitələri və ya interaktivliyi təmin edən digər vasitələrlə həyata keçirilir. Distant təhsildə informasiya texnologiyaları aparıcı vasitədir. Pan-

demiya şəraitində distant rejiminə keçid vəziyyəti yarandı.

Distant və ya onlayn təhsil indi ən vacib tədris metoduna çevrilmişdir. Müəllim və şagirdlərin (tələbələrin) eyni yerdə olma ehtiyacını aradan qaldıran sistem distant təhsildir. Bu təhsil sistemi texnologiyalarla yanaşı günü-gündən inkişaf edən bir təhsil sistemidir. Distant təhsil tələbə və şagirdlərin fiziki olaraq eyni mühitdə olmadığı bir texnologiyadır. Bu sistem təhsil texnologiyaları tərəfindən öyrənilən bir fenomendir. Texnologiya uzaq bir şəxs ilə birbaşa təmasda həyata keçirilən təhsildir. Distant təhsil proqramını digər metodları təkmilləşdirən proqramla yanaşı təhsildə ön planda olan bir üsul kimi də xarakterizə etmək olar. Hazırda distant təhsil ən sürətlə inkişaf edən təhsil formalarından biridir. Veb serverlərin və müasir kompüterlərin mövcud proqram imkanları qlobal şəbəkə vasitəsilə öyrənmə üçün interaktiv proqramlar yaratmağa imkan verir.

İnternet texnologiyalarına əsaslanan distant təhsil öz imkanlarını genişləndirir, televiziyanın beynəlxalq şəbəkəsinin, spesifik təlim texnologiyalarının sintezini əks etdirən perspektivli təhsil sistemi kimi qiymətləndirilir. Bu yeni təhsil forması uşaq, yeniyetmə və gənclər üçün biliklərin yayılmasının intensivləşdirilməsini təmin etməklə yanaşı həm də yeni bilik və texnologiyaların istehlakçıları arasında təhsil üçün bazar mühiti yaradır. Onlayn təhsil çox sürətlə artır. Məktəblərdə distant təhsil pedaqoji heyət üçün nizam-intizam və akademik baxımdan tam bir narahatlıq doğurur. Əslində bu təhsilin bir çox üstünlükləri vardır ki, onları nəzərdən keçirək:

**1. *Hər bir uşaq, yeniyetmə və gənclə fərdi işləmək bacarığı.*** Distant tədris texnologiyası hər bir fərdə öz yanaşmanı tapmağa kömək edir. Məsələn, utancaq uşaq 25 nəfər sinif yoldaşının gözü ona dikilmiş sinifdə fəaliyyət göstərməkdən utanır.

Ancaq uzaqdan belə sakit adam distant təhsil zamanı özünü daha sərbəst hiss edir, söhbət ərəfəsində müəllimə suallar verir və tapşırıqları uğurla yerinə yetirir. Müəllim isə belə şagirdlərin öyrənməyə marağını qorumaq üçün onların meyllərinə uyğun əlavə tapşırıqlar seçə bilər. Distant təhsil şagirdləri daha yaxından tanımaq üçün bir imkandır.

**2. *Proseslərin avtomatlaşdırılması.*** Sadəcə olaraq texnologiya müəllimin işinin ən darıxdırıcı hissəsini öz üzərinə götürə bilər. Məsələn, ev tapşırıqlarını yoxlamaq və sinif statistikasını tərtib etmək. Avtomatik yoxlama dərsi müəllimin gün ərzində ən azı 1-2 saat vaxtını aparacaq. Bu sistem çox sadə işləyir: müəllim sayta daxil olur, fənn, sinif və mövzu seçir, uyğun tapşırığı tapır və şagirdlərə keçid göndərir, sonra sadəcə eyni saytda onların necə işi yerinə yetirdiklərinə nəzarət edir.

**3. *Yeni texnologiyalara yiyələnmək şansı.*** İnteraktiv təlim platformaları ilə bağlı iş təcrübəsi olan müəllimlərə tələbat getdikcə artır. Ancaq burada ən mühüm olan vaxtı düzgün təşkil etmək, şagirdlərlə uzaqdan işləmək, onları idarə etmək və həvəsləndirmək bacarığıdır.

**4. *Oyun tapşırıqları.*** Distant təhsil rəqəmsal texnologiyalardan çox fəal istifadəni nəzərdə tutur. Buraya: onlayn oyunları, viktorinaları, interaktiv beyin oyunlarını aid edə bilərik. Unutmayaq ki, hər bir uşaq üçün oyun dünyanı öyrənməyin ən təbii yoludur. Orta məktəb şagirdləri dərslikdəki quru tapşırıqlardan daha çox belə oyunlara üstünlük verirlər. Oyunlar təkcə şagirdi əyləndirmir, onlar həm də tərəqqini ölçməyə, öyrənməyə sağlam rəqabət elementi gətirməyə kömək edir. Öyrənməkdən həzz alan şagird dərsdə darıxan uşaqdan daha böyük uğur qazanır.

**5. *Daha çox ölçülmüş iş tempi.*** Şagirdlərlə ünsiyyətin çox hissəsi messenjer vasitəsilə həyata keçirildiyinə görə onların suallarına cavabları düşünməyə çox vaxt olur ki, bu da müəllim və şagirdlər arasında münasibətləri daha rahat edir.

**6. *Rahat şəraitdə işləmək bacarığı.*** Uzaqdan işləyən müəllim istənilən yerdə yaşaya bilər. Onlayn dərs verən müəllimlərin hərəkət azadlığı da var. Artıq indi bir çox müəllimlər uzaqdan işləməyin üstünlüyünü yüksək qiymətləndirirlər. Məktəb mühitinin təlaşından uzaqlaşmaq bir çox pedaqoqlar üçün yaxşıdır və onların diqqətini işlərinin vacib aspektlərinə yönəltməyə kömək edir.

**7. *Biliyin aktuallığı.*** Uzaqdan təhsil prosesi müəllimə XXI əsr uşağının maraqlarına cavab verən müvafiq materialları tapmağa imkan verir. Məsələn, ingilis dilini təkcə dərsliklərdən deyil, həm də mahnılardan və televiziya şoularından öyrənirlər.

**8.** ***Tədris materiallarının əlçatanlığı.*** İndi bir çox onlayn kitabxanalar virtual qapılarını açıb dərsliklərindən pulsuz istifadə etməyə icazə veriblər. Şəbəkədə dərs hazırlamaq üçün faydalı olan elektron kitablara çox sayda pulsuz giriş tapmaqdır. Bu həm məktəb kitabxanasında mövcud olan dərsliklərlə məhdudlaşmayan müəllimin, həm də onlarla bahalı əlavə dərs vəsaiti almağa imkanı olmayan şagirdlərin valideynlərinin həyatını asanlaşdırır.

**9.** ***İstənilən vaxt təhsil almaq imkanı.*** Uzaqdan təhsil alan yeniyetmə il ərzində materialın öyrənilməsinə nə vaxt və nə qədər vaxt ayıracağına qərar verə bilər. Özü üçün fərdi məşq cədvəli qura bilər.

**10.** ***Təkbaşına, fərdi təhsil almaq imkanının olması.*** Yeniyetmələr sinif yoldaşlarından geri qalmaqdan narahat deyillər. Həmişə çətin məsələlərin öyrənil- məsinə qayıda, bir neçə dəfə video mühazirələrə baxa, müəllimlə yazışmaları oxuya və artıq öyrəndiyiniz mövzuları atlaya bilərsiniz. Əsas odur ki, yekun imtahanlardan uğurla keçəsən.

**11.** ***İstənilən yerdən təhsil almağın mümkün olması.*** Öyrənməyə başlamaq üçün yalnız internetə çıxışı olan bir kompüter olmalıdır. Distant təhsil ilə Azərbaycanın ən ucqar kəndlərində yaşayan gənclər də yüksək təhsil almaq imkanına sahib olurlar. Təhsildən fiziki məhdudiyyəti olanlar, müəyyən komplekslərinə görə uzaq düşənlər üçün bu təhsilalma forması geniş imkanlar yaradır. Bu təhsil öyrənənin yaradıcılıqla özünütəsdiq, özünüifadə etməsi üçün yeni imkanlar açır.

**12.** ***Yüksək təlim nəticələri.*** Amerikalı alimlərin araşdırmaları göstərir ki, distant təhsilin nəticələri ənənəvi təhsil formalarından heç də aşağı deyil, hətta üstündür. Distant təhsil alan yeniyetmələr tədris materialının çoxunu özləri öyrənirlər. Bu öyrənilən mövzuların yadda saxlanmasını və başa düşülməsini yaxşılaşdırır. Əldə edilmiş bilikləri dərhal praktikada tətbiq etmək bacarığı onları möhkəmləndirməyə kömək edir. Bundan əlavə tədris prosesində ən müasir texnologiyalardan istifadə onu daha maraqlı və canlı edir.

**13.** ***Hərəkətliliyin təmin olunması.*** Müəllimlərlə ünsiyyət həm onlayn, həm də oflayn rejimdə müxtəlif üsullarla həyata keçirilir. E-poçt vasitəsilə müəllimlə məsləhətləşmə bəzən üzbəüz görüş təyin etməkdən daha təsirli və daha sürətli olur.

**14.** ***Müəllim üçün əlverişli olması.*** Uzaqdan dərs deyən müəllimlər və repetitorlar daha çox yeniyetməyə diqqət yetirə bilərlər.

**15.** Distant təhsil yeniyetmə və gənclərin utancaqlıq və auditoriya qarşısında çıxış etmək fobiyası kimi kommunikasiya keyfiyyətləri ilə bağlı psixoloji maneələri dəf etməyə imkan verir.

**16.** ***Fərdi yanaşmanın mümkünlüyü.*** Ənənəvi tədrisdə bir qrupda bütün şagirdlərə lazımi miqdarda diqqət yetirmək və onların hər birinin iş tempinə uyğunlaşmaq müəllim üçün kifayət qədər çətindir. Uzaqdan texnologiyaların istifadəsi fərdi yanaşmanın təşkili üçün əlverişlidir. Yeniyetmənin öyrənmə tempini özü seçməsi ilə yanaşı, repetitordan tez cavab ala bilir.

Pandemiya şəraitinin uzun müddət davam etməsi göstərdi ki, distant təhsilin tətbiqinə hər zaman ehtiyac yarana bilər. Bu təhsilalma formasında öyrədən və öyrənənlərin vaxt və xərclərinə qənaət olunması, internetə çıxışı olan hər məkandan dərslərə, tədbirlərə qoşulmaq imkanı müsbət cəhətlərlə yanaşı distant təhsil formasının kütləviləşməsi bir sıra problemlər də yaratmışdır. Dediklərimizi belə ümumiləşdirə bilərik:

* Bütün fənn müəllimlərinin tədrisdə tətbiq olunan proqramları bilməsi vacib və zəruridir. Bu proses müəllimin distant təhsilalma forması ilə bağlı bilik və bacarıqların öyrədilməsi üçün təşkil olunan təlimlərə qatılmasını şərtləndirir.

* Həm öyrədənlərin, həm də öyrənənlərin informasiya texnologiyalarından istifadə qaydalarını bilməsi çox mühüm amildir.

* Distant təhsilin genişlənməsi ilə yanaşı keyfiyyətinin artırılması da mühüm məsələlərdəndir. Bunun üçün bir sıra işlər görülməlidir.

* Distant təhsillə bağlı seminarların, təlimlərin təşkil edilməsi, orada müəllimlərin fəal iştirakı təmin olunmalıdır.

* Bu təhsilalma formasında tədrisin səmərəli təşkili məqsədi ilə informasiya texnologiyalarından məqsədyönlü şəkildə istifadə olunmalıdır.

Zənnimizcə, müasir dövrdə keyfiyyətli təhsil verilməsi ənənəvi təlim metodları ilə onlayn təlim vasitələrinin optimal (uğurlu) vəhdəti hesabına mümkündür. Bu təhsil sistemi inkişaf

edən texnologiya ilə birlikdə müvəffəqiyyət nisbəti hər keçən gün artan bir təhsil sistemidir. Məsafəli təhsil yeniyetmə və gənc ilə müəllimin fiziki olaraq eyni bir mühitdə olmamasını təşkil edən texnologiyadır.

Ali və orta təhsil müəssisələrinin məsafədən təhsil zamanı istifadə edilmiş elektron materiallarının, dərslərin qeydə alınmış video yazılarının və s. hesabına elektron resurs bazası yaratmaları və prosesin qərarverici orqanlar tərəfindən təbliğ və təşviq edilməsi məqsədəuyğun hesab olunur.

**Problemin aktuallığı.** Pandemiya şəraitinin uzun müddət davam etməsi göstərdi ki, distant təhsilin tətbiqinə hər zaman ehtiyac yarana bilər. Bu təhsilalma formasında öyrədən və öyrənənlərin vaxt və xərclərinə qənaət olunması, internetə çıxışı olan hər məkandan dərslərə, tədbirlərə qoşulmaq imkanı müsbət cəhətlərlə yanaşı distant təhsil formasının kütləviləşməsi bir sıra problemlər də yaratmışdır.

**Problemin elmi yeniliyi.** Elmi məqalədə distant təhsil və ondan istifadə imkanları ardıcıllıqla araşdırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən ali və orta ixtisas məktəblərinin müəllimləri, tələbələr, magistrantlar və doktorantlar istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Əlizadə, T. Distant təhsilin əsas modelləri və metodları // Azərbaycan məktəbi, 2019. № 3, -s. 123–132.
2. İsmayılova, B. Distant təhsil: üstünlüklər, çatışmazlıqlar və müsbət təcrübə. “Elektron dövlət quruculuğu problemləri”. I respublika elmi-praktik konfransı, 4 dekabr, -2014, -s.189-192.
3. Густырь А.В. Проблемы нормативного обеспечения и выбора базовой модели дистанционного образования // Дистанционное образование в России. Постановка проблемы и опыт организации. Сост. Овсянников В.И. - М.:РИЦ "Альфа" МГОПУ им. М.А. Шолохова, -2001.
4. Кирилова Г.И. Информационные технологии и компьютерные средства в образовании // Educational Technology & Society. - 2000. - № 4.
5. Полат Е.С., Бухаркина М.Ю., Моисеева М.В., Петров А.Е. Новые педагогические и информационные технологии в системе образования / Под ред. Полат Е.С. - М.: Изд. Центр "Академия", -2001. - 272 с.
6. Можаева Г.В. Учебный процесс в системе дистанционного образования // Открытое и дистанционное образование. - 2000. № 1, - с. 11 - 17.
7. Овсянников В.И. Структура дистанционного образования. // Дистанционное образование в России. Постановка проблемы и опыт организации. Сост Овсянников В.И. - М.:РИЦ "Альфа" МГОПУ им. М.А. Шолохова, -2001. - с.51.
8. Толстик А.М. Компьютерный лабораторный практикум в дистанционном образовании // Интеграция учебного процесса и фундаментальных исследований в университетах: инновационные стратегии и технологии: Т. 2. - Томск, 2000. - с. 81 - 84.

**E-mail:** vuqaraskerov99@gmail.com
**Rəyçilər:** *psix.ü.fəls.dok., dos.* **N.T. Rzayeva**
*psix.ü.fəls.dok., dos.* **M.C. İsmayılova**
**Redaksiyaya daxil olub:** 06.03.2023

## TƏHSİLİN İDARƏEDİLMƏSİ MƏSƏLƏLƏRİ
## ВОПРОСЫ УПРАВЛЕНИЯ ОБРАЗОВАНИЕМ
## ISSUES OF EDUCATIONAL MANAGEMENT

*UOT 37.0*

***Leyla Tahir qızı Əhmədova***
*Bakı şəhəri Xətai rayonu 55 nömrəli məktəbin təlim-tərbiyə üzrə direktor müavini*

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ TƏHSİLİN KEYFİYYƏTİNİN İDARƏOLUNMASINDA DİREKTOR MÜAVİNİNİN ROLU

***Лейла Тахир гызы Ахмедова***
*заместитель директора по учебно-воспитательной работе школы № 55 Хатаинского района города Баку*

# РОЛЬ ЗАМЕСТИТЕЛЯ ДИРЕКТОРА В УПРАВЛЕНИИ КАЧЕСТВОМ ОБРАЗОВАНИЯ В ОБЩЕОБРАЗОВАТЕЛЬНЫХ ШКОЛАХ

***Leyla Tahir Ahmadova***
*deputy director for educational-upbringing works of school No. 55 of Khatai district of Baku city*

# THE ROLE OF THE DEPUTY PRINCIPAL IN EDUCATION QUALITY MANAGEMENT IN SECONDARY SCHOOLS

**Xülasə.** İstənilən sahədə keyfiyyət anlayışı müəyyən olunmuş standartlara uyğunluğu ifadə edir. Obyektin və ya sistemin halını xarakterizə edən parametrlər standarta nə qədər yaxındırsa, keyfiyyət də bir o qədər yüksək hesab olunur. Təhsildə də belədir. Təhsilin keyfiyyəti əldə olunan nəticələrin əvvəlcədən müəyyən olunmuş meyarlara (standartlara) nisbəti ilə müəyyən olunur. Təhsilin keyfiyyətinin müəyyənləşdirilməsində əsas göstərici şagirdin təlim nəticələrinin obyektiv qiymətləndirilməsi keyfiyyəti uzə çıxaran etibarlı mənbə hesab olunur. Beləliklə, təhsildə keyfiyyətin müəyyən olunması şagird nailiyyətlərinin obyektiv qiymətləndirilməsi ilə şərtlənir. Lakin şagirdin təlim nəticələri təhsil sahəsində baş verən bütün fəaliyyətlərin yekun nəticəsi kimi ortaya çıxdığından, şagirdin təlim nəticələrindən çıxış edərək müəllimin tədris fəaliyyəti, təhsil müəssisələrinin, təhsili idarəetmə strukturlarının və bütövlükdə ölkənin təhsil sisteminin fəaliyyətini də qiymətləndirmək mümkündur. Eyni zamanda, keyfiyyətin faktiki vəziyyətini müəyyənləşdirməklə kifayətlənməyib, onun yaxşılaşması və idarəolunması problemini də həll etmək olar. Azərbaycan Respublikasının ümumi təhsil sistemində belə qiymətləndirmə sistemi yaradılmaqdadır.

***Açar sözlər:*** *ümumtəhsil məktəbi, təhsil, keyfiyyət, şagird, direktor müavini, idarəetmə, monitorinq, təkmilləşmə, dərs planı, standart*

**Резюме.** Понятие качества в любой сфере означает соответствие установленным стандартам. Чем ближе к эталону параметры, характеризующие состояние объекта или системы, тем выше считается качество. То же самое и в образовании. Качество образования определяется отношением полученных результатов к заданным критериям (стандартам). Основным показателем в определении качества образования является объективная оценка результатов обучения ученика, которая считается надежным источником качества. Таким образом, определение качества образования определяется объективной оценкой достижений учащихся. Однако, поскольку результаты обучения учащегося выступают как конечный результат всей деятельности, происходящей в сфере образования, по результатам обучения учащегося, можно оценить педагогическую деятельность учителя, образовательные учреждения, структуры управления образованием и систему образования страны в целом. При этом мало определить фактическое

состояние качества, но можно решить и задачу его улучшения и управления. Такая система оценивания создается в системе общего образования Азербайджанской Республики.

***Ключевые слова:*** *общеобразовательная школа, образование, качество, учащийся, заместитель директора, управление, мониторинг, усовершенствование, план урока, стандарт*

**Summary.** The concept of quality in any field means compliance with established standards. The closer the parameters characterizing the state of the object or system are to the standard, the higher the quality is considered. It is the same in education. The quality of education is determined by the ratio of the obtained results to the predetermined criteria (standards). The main indicator in determining the quality of education is the objective assessment of the student's learning results, which is considered a reliable source of quality. Thus, the determination of quality in education is determined by the objective assessment of student achievements. However, since the student's learning results appear as the final result of all the activities that take place in the field of education, it is possible to evaluate the teacher's teaching activity, educational institutions, educational management structures and the country's education system as a whole, based on the student's learning results. At the same time, it is not enough to determine the actual state of quality, but it is also possible to solve the problem of its improvement and management. Such an evaluation system is being created in the general education system of the Republic of Azerbaijan.

***Key words:*** *secondary school, education, quality, student, vice principal, management, monitoring, improvement, lesson plan, standard*

Təhsilin keyfiyyətinin idarə edilməsi sistemli şəkildə həyata keçirilir. Təhsilin keyfiyyətinin təmin edilməsi, təkmilləşdirilməsi, monitorinqi və qiymətləndirilməsi əməliyyat tədbirləri sisteminə daxildir.

İlk dəfə təhsilin keyfiyyəti məsələsi 1998-ci ildə Fransanın paytaxtı Paris şəhərində ali təhsil səviyyəsi üzrə təhsilin problemlərinə həsr olunmuş ümumdünya konfransında ön plana çəkilmişdir. Həmin konfransda qərara alınmışdır ki, təhsilin keyfiyyəti gələcək inkişaf perspektivində uzunmüddətli məsələ kimi gündəmə gətirilsin və diqqət mərkəzində saxlanılsın.

"Keyfiyyət" anlayışı təhsil sahəsində dinamik və çoxşaxəlidir. Bu anlayışın mahiyyətinin açılması ilə bağlı bir çox mütəxəssislər araşdırma aparmışlar.

Pedaqoji lüğətlərdə "təhsilin keyfiyyəti" anlayışına aşağıdakı kimi izah verilmişdir:

- proses və mənimsəmənin nəticələri;
- sistemləşdirilmiş bilik və bacarıqlar;
- insanın həyata hazırlığının vacib şərtləri.

"Təhsilin keyfiyyəti" anlayışına pedaqoji təsvirlərdə əsasən iki yanaşma məlumudur: fəlsəfi və idarəetmə.

Fəlsəfi nöqteyi-nəzərdən təhsilin keyfiyyəti – onun məzmunu, şagirdin tərbiyəsi və şəxsiyyət kimi formalaşması ilə, idarəetmə yanaşmasında isə təhsilin keyfiyyət nailiyyətlərinin üst-üstə düşməsi, gözləntilərin təmin olunması, nəticələrin standartlara uyğunluğu ilə ölçülür.

Keyfiyyət mürəkkəb və ziddiyyətli anlayışdır. Bu ziddiyyətlər prosesin keyfiyyətilə nəticələrin keyfiyyəti arasında baş verir. İlk keyfiyyət mütəxəssisləri Deminq, Juran və Feigenbaum olmuşdur. Bu mütəxəssislər arasında yaş fərqinin olmasına və müxtəlif ölkələrdə yaşamalarına baxmayaraq, əsasən eyni fikir və prinsiplər irəli sürmüşlər.

"Təhsildə keyfiyyət" anlayışını şaxələndirsək, aşağıdakı sxem alınar:

*Sxem: 1.*



Keyfiyyətli təhsil, hər şeydən əvvəl, mənəviyyatı zəngin, yüksək mədəniyyətə malik bir şəxsiyyətin, insanda özünü realizəetmənin və özünüinkişafetdirmənin, özü-özünü tərbiyələndirmənin, nizamlamanın, insanlar arasında sülh və əmin-amanlıqla yaşama kimi bilik, bacarıq və vərdişlər formalaşdırır. Keyfiyyətli təhsil şagirdə təbiət və cəmiyyət haqqında müəyyən biliklər verməklə kifayətlənmir, həmçinin insanı cəmiyyət içərisində layiqli mövqe qurmağa, nəticədə isə yaxşı vətəndaş kimi formalaşmağa kömək edir. Dahi ingilis yazıçısı Kiplinq (1865-1936) yazırdı: "Təhsil yer üzərində yaranmışların ən xeyirlisidir, əgər o yüksək keyfiyyətə malikdirsə. Əks təqdirdə təhsil tamamilə faydasızdır".

Məktəbin bütün direktor müavinləri təhsil müəssisəsinin ən çox vəzifə borcunu daşıyan və tədris prosesinin düzgün təşkili, nəzarəti, müəssisənin pedaqoji və xidmət personalı tərəfindən xidməti vəzifələrin yerinə yetirilməsi üçün böyük məsuliyyət daşıyan işçilərdir.

Direktorun təlim-tərbiyə işləri üzrə müavini direktorun təqdimatı ilə ali pedaqoji təhsilli və 3 ildən çox pedaqoji stajı olan ən yaxşı müəllimlər tərəfindən təyin edilir. Əsasən tərbiyə işinə rəhbərlik edir, təlim-tərbiyə prosesinin düzgün təşkilinə rəhbərlik və nəzarət edir. Zəruri hallarda o, birinci müavin vəzifəsində direktoru əvəz edə bilər.

Direktor müavininin iş sahələrini aşağıdakı kimi qruplaşdırmaq olar:

- təlimin məzmununun tam yerinə yetirilməsini təmin edir: tədris planlarının və proqramlarının düzgün yerinə yetirilməsinə nəzarət edir;
- vaxtaşırı müəllimlərin təqvimlərini və dərs planlarını müxtəlif fənlər üzrə kurikulumlarda verilmiş tələblərlə müqayisə edir, proqramın icrasında yol verilmiş nöqsanların aradan qaldırılması üçün tədbirlər görür;
- fənnin məzmun standartları əsasında dərs planını tərtib edir və onun düzgün yerinə yetirilməsinə nəzarət edir;
- dərslərin təşkilinə, dərslərin planlaşdırılmasına və ayrı-ayrı fənlər üzrə planların yerinə yetirilməsinə nəzarət edir;
- dərsləri müşahidə edir, onların səmərəli təşkilini, pedaqoji tələblərə uyğunluq dərəcəsini yoxlayır;
- müəllimlə birlikdə dərsin çatışmazlıqlarını aşkar edib təhlil edir, müəllimə metodiki tövsiyələr verir;
- metodik işə rəhbərlik: fənlər üzrə metodiki birliklərin yaradılması, onların işinin planlaşdırılması, metodik birliklərin iclaslarının təşkil edir;
- yeni tədris metod və texnologiyalarının sinifdə tətbiqi vəziyyətini öyrənir və metodbirləşmədə, pedaqoji şurada müzakirələr təşkil edir;
- nümunəvi dərslərin təşkilinə rəhbərlik edir;
- müəllimlərin metodik hazırlığının təkmilləşdirilməsi, ixtisasartırmanın təşkili, qabaqcıl pedaqoji təcrübənin öyrənilməsi və yayılması məsələlərinə rəhbərlik edir;
- konkret müəllimin iş sistemini, üslub və üsullarını, dərsdə tədris, tərbiyə və inkişaf funksiyalarını necə yerinə yetirməli olduğunu öyrənib müzakirəsini təmin edir və nəticə çıxarır;
- şagirdlərin bilik və bacarıqlarının səviyyəsini öyrənir və təhlil edir;
- KSQ və BSQ-lərin vaxtında və düzgün aparılmasına, şagirdlərin obyektiv qiymətləndirilməsinə nəzarət edir.

Hər bir direktor müavini müəllimi yaxşı tanımalı, onun güclü və zəif tərəflərini düzgün qiymətləndirərək, peşəkar müəllim kimi inkişafına nail olmalı və tədrisin keyfiyyətini yüksəltməlidir.

**Problemin aktuallığı.** Keyfiyyətli təhsil, hər şeydən əvvəl, mənəviyyatı zəngin, yüksək mədəniyyətə malik bir şəxsiyyətin, insanda özünürealizəetmənin və özünüinkişaf etdirmənin, özü-özünü tərbiyələndirmənin, nizamlamanın, insanlar arasında sülh və əmin-amanlıqla yaşama kimi bilik, bacarıq və vərdişlər formalaşdırır. Keyfiyyətli təhsil şagirdə təbiət və cəmiyyət haqqında müəyyən biliklər verməklə kifayətlənmir, həmçinin insanı cəmiyyət içərisində layiqli mövqe qurmağa, nəticədə isə yaxşı vətəndaş kimi formalaşmağa kömək edir.

**Problemin elmi yeniliyi.** Keyfiyyətli təhsilin məqsədi, onun strategiyası ilə sıx bağlıdır. Aydın ifadə edilmiş hədəflərin yoxluğu, nəticələrin cəmiyyətin yeni tələblərinə cavab verməməsi, ənənəvi strategiyalardan əl çəkə bilməmək təhsilin məhsuldarlığını aşağı salan səbəblərdəndir. Təhsilin ənənəvi strategiyaları inkişaf etmək istəyən insanın ümumi və xüsusi qabiliyyətlərinə əngəl törədən səbəbdir.

**Problemin praktik əhəmiyyəti.** Keyfiyyətli təhsil Azərbaycan dövləti qarşısında məsuliyyətini

dərk edən, xalqının milli ənənələrinə və demokratiya prinsiplərinə, insan hüquqları və azadlıqlarına hörmət edən, vətənpərvərlik və azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirməli, milli-mənəvi və ümumbəşəri dəyərləri qoruyan və inkişaf etdirən, geniş dünyagörüşünə malik olan, təşəbbüsləri və yenilikləri qiymətləndirməyi bacaran, nəzəri və praktiki biliklərə yiyələnən, müasir təfəkkürlü və rəqabət qabiliyyətli mütəxəssis-kadrlar hazırlamalı, sistemləşdirilmiş bilik, bacarıq və vərdişlərin mənimsənilməsini və ixtisasın daim artırılmasını təmin etmək, təhsilalanları ictimai həyata və səmərəli əmək fəaliyyətinə hazırlamalıdır.

**Ədəbiyyat:**

1. “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanunu.- Bakı: Hüquq ədəbiyyatı, -2009.
2. Azərbaycan Respublikasının ümumtəhsil sistemində Qiymətləndirmə Konsepsiyası. Bakı, 2009.
3. Məmmədzadə R. H. Təhsildə keyfiyyət aparıcı istiqamətlərdən biri kimi. Bakı: Müəllim, – 2010.
4. Бардин К.В. Как научить детей учиться. – Москва, 1987.
5. Загвязинский В.И., Гильманов А. Управление качеством образования: Методические. рекомендации. — Тюмень, 2009. -16 с.
6. Жилина Н. В. Администрирование школы, 2012.

**E-mail:** leylanigar88@mail.ru

**Rəyçilər:** *ped.ü.fəls.dok* , dos. **A.X. Hacıyev,**
*ped.ü.fəls.dok.,* dos. **M.S. Kazımov**
**Redaksiyaya daxil olub:** 02.03.2023

## *MƏKTƏBƏQƏDƏR TƏHSİL VƏ TƏRBİYƏ*
## *ДОШКОЛЬНОЕ ОБРАЗОВАНИЕ И ВОСПИТАНИЕ*
## *PRESCHOOL EDUCATION AND UPBRİNGİNG*

*UOT 373.2*

***Təranə Buta qızı Sadıqova***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti*

# MƏKTƏBƏQƏDƏR YAŞLI UŞAĞIN SOSİAL İNKİŞAFINDA OYUNUN ROLU

***Тарана Бута гызы Садыгова***
*доктор философии по педагогике,*
*доцент Азербайджанского Государственного Педагогического Университета*

# РОЛЬ ИГРЫ В СОЦИАЛЬНОМ РАЗВИТИИ ДОШКОЛЬНИКА

***Tarana Buta Sadigova***
*doctor of philosophy in pedagogy, associate professor*
*at Azerbaijan State Pedagogical University*

# THE ROLE OF THE GAME IN THE SOCIAL DEVELOPMENT OF THE PRE-SCHOOL CHILD

**Xülasə.** Məktəbəqədər dövr uşağın psixi inkişafı və şəxsiyyətinin formalaşmasında mühüm rol oynayır. Bu baxımdan oyundan istifadənin imkanları genişdir. Oyun uşaqların hərtərəfli inkişafında, o cümlədən onların sosial fallığının formalaşdırılmasında mühüm rol oynayır. Məktəbəqədər yaşlı uşaqların sosial fəallığı dedikdə, onun rəngarəng fəaliyyətinin məcmusu nəzərdə tutulur. Sosial fəallıq uşağın müxtəlif fəaliyyətində ifadə olunur: yeni biliklərin qazanılmasına tələbatda; didaktik oyun prosesində əqli vəzifələrin yerinə yetirilməsi zamanı biliklərdən səmərəli və müstəqil istifadə etmək bacarığında (əşya və hadisələrdə özünəməxsus cəhətləri tapmaq, düzgün əqli nəticə çıxarmaq); fəhmlilik, hazırcavablıq, müşahidəçilikdə; Vətənə məhəbbətdə, yaşıdları və yaşlılarla ünsiyyət prosesində xeyirxahlıqda; əşyalara, oyun materialına qayğıkeş münasibətdə və s.

Uşaqların qarşısında oyunun məzmun və qaydasının dəqiq açılması qaydalı oyunlara pedaqoji rəhbərliyin mühüm şərtidir. Oyundan təlim-tərbiyə vasitəsi kimi istifadə etmək üçün tərbiyəçi ona düzgün pedaqoji rəhbərlik etməlidir. Oyuna rəhbərliyi elə təşkil etmək lazımdır ki, o uşağın fallığının və müstəqilliyinin inkişafına, onların özünütəşkilinə təsir etsin.

***Açar sözlər:*** *məktəbəqədər, uşaq, sosial, inkişaf, tərbiyə, oyun, fəaliyyət, tərbiyəçi*

**Резюме**. Дошкольный период играет важную роль в психическом развитии и формировании личности ребенка. С этой точки зрения возможности использования игры широки. Игра играет важную роль во всестороннем развитии детей, в том числе в формировании их социальной личности. Когда мы говорим о социальной активности дошкольника, мы имеем в виду совокупность его красочных занятий. Социальная активность выражается в разнообразной деятельности ребенка: в потребности в получении новых знаний, в умении эффективно и самостоятельно использовать знания при выполнении мыслительных задач в дидактическом игровом процессе (нахождение своеобразных признаков в предметах и явлениях.), понимание, остроумие; любовь к Родине, доброта в процессе общения со сверстниками и старшими, бережное отношение к вещам, игровому материалу и др. Точное раскрытие содержания и правил игры детям является важным условием педагогического руководства игр с правилами. Для того чтобы использовать игру как средство обучения, воспитатель должен обеспечить ей надлежащее педагогическое руководство.

***Ключевые слова:*** *дошкольник, ребенок, социальный, развитие, воспитание, игра, деятельность, воспитатель*

**Summary.** The preschool period plays an important role in the mental development and personality formation of the child. From this point of view, the possibilities of using the game are wide. The game plays an important role in the comprehensive development of children, including the formation of their social personality. When we say social activity of preschool children, we mean the set of his colorful activities. Social activity is expressed in the various activities of the child: in the need to acquire new knowledge, in the ability to use knowledge effectively and independently during the performance of mental tasks in the didactic game process, understanding, wit, observation; love for the country , kindness in the process of communication with peers and elders, caring attitude to things, game material, etc. Exact disclosure of the content and rules of the game to children is an important condition for pedagogical guidance of games with rules. In order to use the game as an educational tool, the educator must provide it with proper pedagogical guidance. It is necessary to organize the management of the game in such a way that it affects the development of the child's personality and independence, and their self-organization.

***Key words:*** *preschool, child, social, development, education, game, activity, educator*

Təhsil sisteminin ilkin pilləsi sayılan məktəbəqədər uşaq müəssisələrində, eləcə də ailələrdə uşaqlarla aparılan təlim-tərbiyə işlərinin səmərəliliyi, uşağın hərtərəfli inkişafı üçün əlverişli şəraitin yaradılması onun məktəbə və həyata hazırlanmasının keyfiyyətini şərtləndirir. Belə ki, məhz uşaqların sosial tərbiyəsində, xüsusilə öz yaşıdları ilə qarşılıqlı münasibətlərin yaranmasında kollektivdə davranış qaydaları və normaları haqqında təsəvvürlərin mənimsənilməsi mühüm yer tutur.

İnsanlara humanist münasibətin əsası ən müxtəlif həyatı situasiyalarda yaranır. Buna görə də, uşaqlarda lazımi davranış və ya kommunikativ vərdişlər haqqında təsəvvürləri, hər şeydən əvvəl, mənəvi hissləri formalaşdırmaq lazımdır. Ancaq belə olan halda uşaq özgənin sevincini öz sevinci kimi qəbul edib, duya bilər.

Məktəbəqədər tərbiyənin bir neçə əsas məqsədi var: uşağın emosional, sosial və intellektual potensialının inkişafı üçün şəraitin yaradılması; uşaqda müsbət keyfiyyətlərin yaradılması; uşaqda müsbət keyfiyyətlərin formalaşdırılması; məktəb təliminə hazırlıq. Bu məqsədlərin həyata keçirimlisində oyunun imkanları genişdir.

İnsan cəmiyyətinin ayrı-ayrı dövrlərində uşaq oyunları filosof, tarixçi, bioloq, xüsusilə, pedaqoq və psixoloqların diqqətini cəlb etmiş, həmin problemlə bağlı müxtəlif mülahizələr irəli sürülmüşdür.

Qədim Yunanıstanın görkəmli filosofları Platon və Aristotelin uşaq oyunları ilə bağlı fikirləri maraq doğurur. Platon oyunu tərbiyənin mühüm vasitəsi hesab edir, uşağın tərbiyəsi ilə məşğul olanlara ondan istifadə etməyi məsləhət görürdü (43, s. 90).

Şəxsiyyətin formalaşmasında məktəbəqədər dövrü mühüm mərhələ hesab edən Aristotel uşaqların əqlini inkişaf etdirən oyunlardan istifadə olunmasını məktəbə hazırlığın mühüm şərti kimi qiymətləndirirdi (9, s. 90).

Azərbaycanın orta əsr mütəfəkkirlərindən olan N. Tusi uşaqların oyunlarına xüsusi əhəmiyyət vermiş, onların müxtəlif oyunlarda iştirakını zəruri saymışdır. O, "Əxlaqi-Nasiri" əsirində yazırdı: "...oyun gözəl olmalıdır, yorub əldən salmamalı, zehnini kütləşdirməməli, təlim və tərbiyəsini çətinləsdirməməlidir" **(**3, s. 160).

M. Əvhədinin pedaqoji fikirləri içərisində "zərərli və xeyirli oyunlar" deyə iki növ oyun haqqında mülahizələri xüsusilə maraqlıdır. O, inkişafı ləngidən və inkişafa xidmət göstərən oyunlardan danışaraq qeyd edir ki, hərbi fiziki hazırlıq və mübarizə ilə əlaqədar oyunları nəinki rəiyyət balalarına, həm də yaşlı nəslə öyrətmək lazımdır. O, "Hünərə səsləyən", "Kamal öyrədən" oyunların öyrədilməsini təklif edirdi (8, s. 153-154). Didaktik oyunlar məhz kamal öyrədən oyunlardır.

Oyun uşağı təlimə və əməyə hazırlayır, həmçinin uşaq ilk müstəqil fəaliyyətə oyun vasitəsilə başlayır. K.D. Usinski yazırdı: "Əsil həyatda uşaq, hələ heç bir müstəqilliyə malik olmayan, həyat axını tərəfindən qayğısız və kortəbii şəkildə cəlb edilən bir məxluqdur, oyunda isə uşaq yetişkən adam olub, öz gücünü sınayır, özünün quraşdırdığı şeylər üzərində müstəqil olaraq hakimlik edir" (10, s. 8, 439).

Oyun uşaqların hərtərəfli inkişafında, o cümlədən onların sosial fəallığının formalaşdırılmasında mühüm rol oynayır.

Məktəbəqədər yaşlı uşaqların sosial fəallığı dedikdə, onun rəngarəng fəaliyyətinin məc-

musu nəzərdə tutulur. Sosial fəallıq uşağın müxtəlif fəaliyyətində ifadə olunur:

- yeni biliklərin qazanılmasına tələbatda, didaktik oyun prosesində əqli vəzifələrin yerinə yetirilməsi zamanı biliklərdən səmərəli və müstəqil istifadə etmək bacarığında (əşya və hadisələrdə özünəməxsus cəhətləri tapmaq, düzgün əqli nəticə çıxarmaq), fəhmlilik, hazırcavablıq, müşahidəçilikdə;
- Vətənə məhəbbətdə, yaşıdları və yaşlılarla ünsiyyət prosesində xeyirxahlıqda, əş-yalara, oyun materialına qayğıkeş münasibətdə;
- təbiət gözəlliklərini görmək, basa düşmək və qiymətləndirməkdə;
- oyun hərəkətlərinin yerinə yetirilməsində, didaktik materialla məqsədyönlü hərəkətlərdə;
- yaşıdları ilə biliklərini mübadilə etmək arzusunda, oyun prosesində nitq fəallığının göstərilməsində;
- yaşlıların əməyinə maraqda, əməkdə böyüklərə kömək etməkdə, oyun zamani müxtəlif peşələri yerinə yetirmək arzusunda və s.

Məktəbəqədər yaşlı uşaq didaktik oyun prosesində öz hərəkət və davranışını təşkil etmək imkanına malik olur.

Oyunun birinci mərhələsində uşaqda fəal hərəkət etmək, oynamaq arzusu yaranır. Yaşıdları ilə oynamaq arzusu tərbiyə etmək sosial fəallığın formalaşmasında mühüm an olub ünsiyyətin inkişafına kömək edir ki, bunun da əsasında dostluq, yoldaşlıq, qarşılıqlı kömək və s. kimi xüsusiyyətlər formalaşır.

İkinci mərhələdə uşaq oyunun vəzifələrini, qaydalarını, hərəkətlərini yerinə yetirməyi öyrənir. Bu dövrdə düzlük, məqsədyönlük, təkidlilik, təkcə özünün yox, həm də yoldaşının müvəffəqiyyətinə sevinmək kimi mühüm xüsusiyyətlərin əsası qoyulur.

Üçüncü mərhələdə uşaq artıq oyunun qaydaları ilə tanışdır, yaradıcılıq göstərir, müstəqil hərəkətlərin axtarışı ilə məşğul olur. O oyunda olan hərəkətləri (seçmək, tapmaq, gizlətmək, tutuşdurmaq, təsvir etmək) yerinə yetirməlidir. Bunları müvəffəqiyyətlə yerinə yetirmək üçün fərasətlilik, hazırcavablıq göstərməlidir.

Məktəbəqədər yaşlı uşaq oyunu mənimsədikdən sonra onun təşkilatçısı və fəal iştirakçısına çevrilir.

Oyundan təlim-tərbiyə vasitəsi kimi istifadə etmək üçün tərbiyəçi ona düzgün pedaqoji rəhbərlik etməlidir. Oyuna rəhbərliyi elə təşkil etmək lazımdır ki, o uşağın fəallığının və müstəqilliyinin inkişafına, onların özünütəşkilinə təsir etsin.

Kiçik qrupda uşaqların böyük hissəsi tərbiyəçinin iştirakı ilə didaktik oyuncaqlarla oynayırlar. Tərbiyəçi özü uşaqların hərəkətlərinin ardıcıllığını və qarşılıqlı münasibətlərini nizamlayır. Uşaqlar kollektiv oyunların qaydalarını çətinliklə mənimsəyirlər.

Orta qrupda uşaqların oyun təcrübəsi artır və onlar müstəqil olaraq iki, dörd, altı nəfərdən ibarət olan kiçik qruplarla oynaya bilirlər. Dəqiq qaydalar uşaqlara birgə oynamağa kömək edir, onların davranışını nizamlayır. Qaydalar uşaqların başa düşəcəyi tərzdə çatdırmalı, lakin çox asan olmamalıdır. Həddən artıq asan vəzifələr uşaqlar tərəfindən tez mənimsənilir, lakin müsbət tərbiyəvi təsiri təmin etmir. Daha mürəkkəb qaydalarla əlaqədar olaraq çətinliklərin öhdəsindən gəlmək uşaqları səfərbər edir, onların inkişafına müsbət təsir göstərir. Uşaqlara qaydanı təqdim edərkən yalnız onun didaktik xarakterini deyil, həm də tərbiyəvi əhəmiyyətini nəzərə almaq lazımdır.

Oyunlarda tezlik və dəqiqlikdə yarış orta qrup uşaqları ucun çətindir. Lakin bu yaş qrupu ucun dəqiqlik üzrə yarış mümkündür. Ona görə də oyunun qaydasını uşaqlara izah edərkən əsas diqqəti oyun tapşırığının dəqiq həllinə yönəltmək lazımdır. Əqli vəzifənin tez, eyni zamanda, dəqiq həlli böyük qrup uşaqları üçün mümkündür. Oyunçular arasında yarış olarkən tezlik amili uşaqları coşdurur, lakin didaktik vəzifənin həllinin keyfiyyətinə təsir göstərmir.

Oyun prosesində uşaqların davranış tərbiyəsi yüksək əhəmiyyət kəsb edir. Onların bir-birinə, dayəyə, aşpaza, tərbiyəçiyə mədəni münasibəti oyun zamanı daha qabarıq nəzərə çarpır. Buna görə uşaqları tərbiyəvi cəhətdən daha faydalı, məzmunlu oyunlara təhrik etmək tərbiyəçidən pedaqoji məharət tələb edir. Hər şeydən əvvəl, qrup otağında elə şərait yaradılmalıdır ki, uşaq sosial-mənəvi təsiri hiss etsin və həmin davranış normalarına tabe olmağa məcbur olsun.

Təsirli tərbiyəvi üsullardan biri müxtəlif formalarda rəğbətləndirmədir. Praktikada bu üsuldan geniş istifadə olunmalıdır. Oyun və ya

əməli fəaliyyət prosesində meydana çıxan konflikt zamani tərbiyəçi əyani surətdə mübahisəli şəraiti aydınlaşdırmalıdır. Bu zaman o, anlaşılmazlığın aradan qaldırılmasında haqlı olan uşağı müdafiə edir. Uşaqlara davranış normalarını xatırlatmağa çalışan tərbiyəçi dolayısı ilə metodların təsirindən istifadə etməlidir.

Məktəbəqədər yaşlı uşaqlarda mühüm sosial münasibətləri formalaşdırarkən, hər şeydən əvvəl, davranışını təkcə öz maraqları baxımından deyil, digər uşaqların maraqları baxımından qurmağı öyrətmək lazımdır. Yaradıcı süjetli-rollu oyunlarda da birgəyaşayış tələbləri kollektivdə uşaqların davranış qaydalarına tətbiq olunmalıdır. Uşaqlar çalışırlar ki, kollektiv oyunda xeyirxah, nəzakətli, diqqətli olsunlar. Oyunun keçirilmə planında dəyişiklik aparmaq zəruri olduqda kollektivin hər bir üzvü buna razılıq verməlidir. Qalibiyyət uşaqların didaktik oyunlara marağını artıran amillərdən biridir. Didaktik vəzifəni başqalarından tez yerinə yetirən uşaqlar oyunun qalibi hesab olunurlar. Kollektiv oyunda uşaqların əksəriyyəti öz nailiyyətlərinə və yoldaşlarının yaxşı nəticələrinə eyni dərəcədə sevinirlər. Şəxsi qələbə uşaqlar tərəfindən heç də müstəsna hal kimi qəbul edilmir. Böyük qruplarda qələbə amili oyuna müsbət təsir göstərməyə başlayır, uşaqları əqli səyə, oyun hərəkətləri və vəzifələrinin dəqiq yerinə yetirilməsinə sövq edir.

Uşaqların qarşısında oyunun məzmun və qaydasının dəqiq açılması qaydalı oyunlara pedaqoji rəhbərliyin mühüm şərtidir. Məktəbəqədər yaşlı uşaqların hərtərəfli tərbiyəsini həyata keçirmək məqsədilə oyunla təlim bacarıqla birləşdirilməli, oyunlardan həm məşğələ, həm də məşğələdən kənar vaxtlarda istifadə edilməlidir.

Beləliklə, məktəbəqədər yaşlı uşaqlarla təlim-tərbiyə prosesində oyundan bacarıqla, sistematik şəkildə istifadə respublikamızın ən kiçik vətəndaşlarının sosial və ahəngdar inkişafının təmin edilməsinə imkan verir.

**Problemin aktuallığı.** Müasir dövrdə məktəbəqədər yaşlı uşaqların sosial inkişafı problemi xüsusi aktuallıq kəsb edir. Bu məqalə məktəbəqədər yaşlı uşaqların sosial inkişafında oyunun roluna həsr olunmuşdur. Həmçinin bu prosesdə uşaqların sosial inkişafını təmin etmək məqsədilə onların maraqlarının, ehtiyaclarının nəzərə alınması, oyundan təlim-tərbiyə vasitəsi kimi istifadə etmək üçün tərbiyəçinin ona düzgün pedaqoji rəhbərlik etməsi kimi məsələlər öz əkini tapmışdır.

**Problemin elmi yeniliyi.** Məqalədə məktəbəqədər yaşlı uşağın sosial inkişafında oyunun rolu ilə bağlı fikirlər təhlil olunmuş, həmçinin onun təlim-tərbiyə işinin keyfiyyətinin yüksəldilməsinə təsiri əsaslı şəkildə göstərilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə əldə olunmuş nəticələr məktəbəqədər yaşlı uşağın sosial inkişafında oyundan istifadə prosesinin səmərəli təşkili üçün əhəmiyyətlidir. Bu nəticələr məktəbəqədər təhsil müəssisələrində uşaqların sosial inkişafı üzrə işin səmərəli təşkilinə kömək edir.

**Ədəbiyyat:**

1. Məktəbəqədər təhsil haqqında Azərbaycan Respublikasının Qanunu, 14 aprel 2017-ci il.
2. Kərimov Y,Ş. Uşaq məktəbə gedir.- Bakı, -2002
3. Nəsirəddin Tusi. Əxlaqi-Nasiri. -Bakı, -1989
4. Əlizadə Ə.Ə., Abbasov A.N. Ailə. -Bakı, -1989
5. Məktəbəqədər təhsilin proqramı (kurikulumu). -2022
6. Sadıqova. T.B. Məktəbəqədər təhsil müəssisələrində təlim-tərbiyə işinin təşkili. -Bakı, -2010
7. Sadıqova, T.B. Məktəbəqədər pedaqogika. / T.B. Sadıqova -Bakı, -2020
8. Mollayev İ.A. Orta əsr Azərbaycan mütəfəkkirləri təlim-tərbiyə haqqında. -Bakı: Maarif, -1996
9. Дошкольная педагогика / Под ред. В.И. Ядэшко, Ф.А. Сохина. М.: Просвещение, -1986, -416 с.
10. Ушинский, К.Д. Сочинение.Т. 8. / К.Д. Ушинский. -М., -1950,- 776 с.
11. Sadıqova T.B . Uşaqlar üçün qaydalı oyunlar. -Bakı, -2009
12. Sadıqova T.B., Məktəbəqədər yaşlı uşaqlar üçün didaktik oyunlar. -Bakı, -2019.

**E-mail:** t.sadiqova2013@ya.ru
**Rəyçilər:** *ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva,**
*ped.ü.fəls.dok.* **N. İsmayılova**
**Redaksiyaya daxil olub**: 01.02.2023.

UOT 373.2

**Nigar Ramiz qızı İsmayılova**
pedaqogika üzrə fəlsəfə doktoru
Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi

**Ayşən Raqif qızı Əhmədova**
Azərbaycan Dövlət Pedaqoji Universitet

# MƏKTƏBƏQƏDƏR YAŞLI UŞAQLARIN AİLƏ TƏRBİYƏSİNDƏ YOL VERİLƏN NÖQSANLARIN ARADAN QALDIRILMASI YOLLARI

**Нигяр Рамиз гызы Исмайлова**
доктор философии по педагогике
старший преподаватель Азербайджанского Государственного Педагогического Университета

**Айшен Рагиф гызы Ахмедова**
Азербайджанский Государственный Педагогический Университет

# ПУТИ УСТРАНЕНИЯ ОШИБОК ДОПУСКАЕМЫХ В СЕМЕЙНОМ ВОСПИТАНИИ ДОШКОЛЬНИКОВ

**Nigar Ramiz Ismayilova,**
doctor of philosophy in pedagogy
senior lecturer at Azerbaijan State Pedagogical University

**Aishan Ragif Ahmadova**
Azerbaijan State Pedagogical University

# WAYS TO ELIMINATE ERRORS IN FAMILY EDUCATION OF PRESCHOOL CHILDREN

**Xülasə.** Məqalədə məktəbəqədər yaşlı uşaqların ailədə tərbiyəsi zamanı yol verilən nöqsanlar və onların aradan qaldırılması üçün görülə biləcək işlər haqqında məlumat verilmişdir. Tərbiyə işi ailədən başlayır, zəncirvari olaraq, məktəbəqədər müəssisədə davam etdirilir. Bu nöqsanların aradan qaldırılması üçün əvvəlcə valideynlər müəyyən işlər görməli, daha sonra isə bunu tərbiyəçi-müəllimlər davam etdirməlidirlər.
***Açar sözlər:*** *tərbiyə, ailədə tərbiyə, tərbiyədə nöqsan, bərpa üsulları, məktəbəqədər tərbiyə*

**Резюме**. В статье представлена информация об ошибках, допущенных при воспитании дошкольников в семье, и о том, что можно сделать для их устранения. Воспитательная работа начинается с семьи и продолжается по цепочке в дошкольном учреждении. Для того, чтобы устранить эти дефекты, сначала должны сделать определенные вещи родители, а затем это должны продолжить воспитатели-учителя.
***Ключевые слова:*** *воспитание, воспитание в семье, ошибки воспитания, методы восстановления, дошкольное воспитание*

**Summary**. The article provides information about the mistakes made during the upbringing of preschool children in the family and what can be done to eliminate them. The work of education begins with the family and continues in a chain in the preschool institution. In order to eliminate these defects, parents must first do certain things, and then educators - teachers must continue this.
***Key words:*** *education, education in the family, defects in education, recovery methods, preschool education*

Tərbiyə - şəxsiyyətin məqsədyönlü şəkildə formalaşması və inkişafı prosesidir. Tərbiyənin məqsədi uşaqlarda elə fərdi keyfiyyətlər formalaşdırmaqdır ki, bu uşaqlar həyatda rast gəldikləri çətinlikləri ən düzgün formada aradan qaldıra bilmiş olsunlar. İnsan həyatında tərbiyə çox mühüm əhəmiyyəti ilə seçilir. Tərbiyəetmə prosesi insan anadan olduğu andan ölənə qədər olan dövrü əhatə edir. Uşağın ilkin tərbiyə olunması genlərdən aldığı tərbiyə, daha sonra təhsil müəssisələrində aldığı tərbiyə, iş fəaliyyətində aldığı tərbiyə və s. formada olmaqla zəncirvari şəkildə davam edir. Bunu nəzərə alaraq deyə bilərik ki, tərbiyə ilkin olaraq genetik tərbiyə kimi başlayır. Genetik tərbiyə dedikdə, valideynlərdən uşağa, onların daşıdığı genlərlə, irsən keçən tərbiyə nəzərdə tutulur. Daha sonra zəncirvari şəkildə davam edən ardıcıllıq isə məktəbəqədər tərbiyədir. Bu müddət ərzində uşağa verilən tərbiyə uşağın bütün həyatı boyu onunla birgə olur və uşaq bütün həyatını həmin aldığı tərbiyə üzərində qurur. Bunu nəzərə alaraq, gərək hər bir valideyn də məhz bu önəmli mərhələyə xüsusilə diqqət etmiş olsun. Lakin günümüzün ən aktual problemlərindən biri də budur ki, əksər valideynlər buna dırnaqarası yanaşır, önəm vermirlər. Bunun nəticəsidir ki, həmin uşaqlar düzgün tərbiyə almış olmurlar, həm özləri əziyyət çəkir, həm də cəmiyyətin həyatında öz mənfi xarakteri ilə seçilərək, bir çox problemlərin, heç də müsbət hesab olunmayan halların yaranmasına səbəb olmuş olurlar. Bir çoxları bu xoşagəlməz halları görərək sonradan uşağın tərbiyəsi ilə məşğul olmağa cəhd edirlər. Əlbəttə ki, bu mənfi hallar heç də həmişə islah olunmur, müsbət yöndə dəyişilmir. Bir məşhur deyimdən alınan şərhə istinad etsək, hər şey öz zamanında olmalıdır, sonradan yağan yağışın qurumuş güllərə bir faydası olmur.

Bir çox alimlərin fikrinə görə, uşaqların tərbiyəsi 4, ya 6 yaşına kimi tamamlanmış olmalıdır. Belə ki, artıq bu yaşa qədər uşağın almış olduğu tərbiyə onun bir ömür həyatı boyu onunla bərabər davam etmiş olur və uşağın zamanla almış olduğu həyati dərs və tərbiyə prosesində əsaslı təsiri ilə seçilir. Həmçinin, uşağın ailədə, məktəbdə aldığı tərbiyə, düşüncə, davranış xüsusiyyətləri, hisslər və s. də ona birbaşa təsiri ilə nəzərə çarpır.

“A.S. Makarenko “Valideynlər üçün kitab” adlı əsərində ailə tərbiyəsinin bir sıra vacib məqamlarına toxunaraq vurğulamışdır: “Ailə tərbiyəsinin müvəffəqiyyətində valideynlərin vətəndaşlıq borclarını fəal surətdə, daimi, şüurlu yerinə yetirmələri həlledici əhəmiyyətə malikdir. Hansı ailələrdə ki, valideynlər bu məsuliyyəti, borcu dərindən dərk edirlər, o ailələrdə heç bir müvəffəqiyyətsizlik baş verə bilməz. Makarenko övlad tərbiyə edilməsində qayğı və sevginin roluna diqqət çəkərək sevgi, məhəbbət göstərilmədən böyüdülən uşaqların ailələrini sərt şəkildə tənqid edərək qeyd edirdi: “Əgər siz övlad həyata gətirib, ona valideyn məhəbbəti göstərmədən ötüşmək istəyirsinizsə, onda zəhmət çəkin cəmiyyəti xəbərdar edin ki, belə bir murdar iş tutmaq arzusundasınız. Valideyn məhəbbəti görmədən tərbiyə edilmiş adamlar əksərən şikəst olurlar” (3, s. 16, 29).

Bu gün məktəbəqədər təhsilin inkişafı ilə əlaqədar olaraq müxtəlif istiqamətli dövlət proqramlarının həyata keçirilməsi, təlim-tərbiyə prosesinin keyfiyyəti, təhsil qanunvericiliyinin icrası, məktəbəqədər təhsildə dövlət standartlarına riayət olunması, məktəbəqədər təhsilin məzmununda yeniliklərə nail olunması günümüzün əsas prioritetlərindəndir. Məktəbəqədər təhsil sisteminin fəaliyyətini və onun inkişafını təmin edən normativ hüquqi bazanın yaradılmasıyla yanaşı, müəyyən məsələlər üzrə təkliflərin hazırlanması, məktəbəqədər təhsil müəssisələrində, ümumtəhsil müəssisələrinin uyğun bölmələrində və qısamüddətli təlim qruplarında işin təşkilinin təmin olunması, təhsil üzrə milli məzmun standartlarının hazırlanması həmin vacib məsələlər sırasındadır.

Uşaq üçün ilkin sosial mühit ailədir. Hər bir uşaq öz inkişafı üçün özünəməxsus sosial inkişaf şəraiti yaratmış olur. Bu şəraitə əsasən o yaşayır, inkişaf edir, cəmiyyət həyatında iştirak edir. Tərbiyə işinin ilkin olaraq ailədən başlandığını bilirik. Deməli, bu işin mütəşəkkilliyinin qurulması da elə ilkin olaraq ailədən başlamalıdır. Əks halda qarşıya qoyulan bu məqsədə nail olmaq mümkün olmaz. Övlad tərbiyə etmək ciddi və bir o qədər də məsuliyyətli bir işdir. Bunun öhdəsindən isə hər ailə layiqincə gələ bilmir. İşin öhdəsindən layiqincə gəlməkdən ötrü gərək həm ana, həm də ata öz məsuliyyətini dərk etsin, öz fikrini, diqqət və iradəsini məhz

bunun üzərində cəmləmiş olsun. Ailə başçılarının öz valideynlik vəzifələrinin məsuliyyətini hər zaman hiss etmələri və bu işi fəal surətdə, məqsədli şəkildə yerinə yetirmələri ailə tərbiyəsi işində müvəffəqiyyət qazanmağın ilkin əsasıdır. Lakin günümüzün aktual problemlərindən biri də budur ki, əksər valideynlər bu məsuliyyəti dərk etmir, işin ciddiyyətini anlamır, övladlarını səhv yöndə tərbiyələndirirlər. Ailə tərbiyəsində olan uğursuzluqların səbəbləri valideynlərin düzgün tərbiyə üsul və vasitələrini bilməməsi, yaxud da bildiyini düzgün istiqamətdə istifadə etməməsi ilə bağlıdır. Nəticə olaraq isə bir çox pedaqoji səhvlər buraxılmış olur ki, bunların da gələcəkdəki daha böyük məsələlərdə qarşısını almaq mümkün olmur. Məsələn, ərköyün uşaq böyüdən ailə hər daim onun istədiyini etməyə çalışır, heç kimin onun xətrinə dəyməməsi üçün əlindən gələni edir, nəticə olaraq isə uşaq "olmaz", "yox" anlayışını bilmir və ya qəbul etmir. Bu uşaqların valideynləri isə uşağa həddindən artıq qayğı, diqqət göstərməsi ilə nəzərə çarpırlar. Ancaq bu qayğı düzgün və normal dərəcədə ifadə olunmadığından xeyir deyil, öz zərəri ilə tərbiyə işinə yanasmış olur.

Bəs, ümumiyyətlə, uşaqların tərbiyəsində yol verilən bu nöqsanları aradan qaldırmaq üçün hansı üsul və yollardan istifadə oluna bilər?

1. Uşaqların tərbiyə işindən danışırıqsa, ilk növbədə, əxlaq tərbiyəsinə diqqət yetirməliyik. Belə ki, bu zaman uşaqların intizamsızlığı diqqəti cəlb edən məqamlardandır. Bu danılmaz faktdır ki, intizam olmayan yerdə heç bir müsbət keyfiyyətdən, tərbiyədən söhbət gedə bilməz. Uşaqların intizamlılığını təmin etmək üçün ailənin xüsusi gündəlik rejimdən istifadə etməsi, buna həm özlərinin, həm də uşaqların əməl etməsini təmin etmək vacibdir. Buraya uşaqların vaxtında yatıb, vaxtında durması, vaxtında işlərini görməsi, öz işlərini düzgün ardıcıllıqla yola qoyması və s. aid edilir. Araşdırmalar göstərir ki, hər uşağın qarşısında eyni tələblərin qoyulması və bunlara hamının eyni dərəcədə əməl etməsi, xüsusi nəzarət ilə buna diqqət yetirilməsi uşaqlar arasında möhkəm nizam-intizamın yaranmasına səbəb olur.

2. İkinci tərəfdən valideynlərin uşaqlar üzərində düzlük və doğruluğun tərbiyə olunmasına ciddi və məsuliyyətlə yanaşmaları olmalıdır. Əgər söhbət düzlük və doğruluqdan gedirsə, elə, ilk növbədə, buna valideynlər özləri əməl etməyi bacarmalıdırlar. Valideynlər özləri nümunə olmalı, nə uşaqlarına, nə də digərlərinə qarşı yalan danışmamalı, bir-birini aldatmağa çalışmamalıdırlar. Valideynlər, həmçinin pedaqoji maariflənməyi də bacarmalıdırlar. Onlar müxtəlif elmi-pedaqoji ədəbiyyatlarla tanış olmalı, nümunə olaraq onlardan istifadə etməlidirlər. Düzdür, bu nümunə hər şəxsdə eyni effektini göstərə bilməz, lakin qazanılmış təcrübə az da olsa, öz təsirini göstərmək iqtidarındadır.

3. Valideynlər öz uşaqlarında yoldaşlıq və dostluq hissinin yaranması və möhkəmlənməsinə çalışmalıdırlar. Buna nail olmağın ən unikal yolu ailədə bu hisslərin əvvəldən formalaşdırılmasıdır. Ailə üzvlərinin bir-birlərinə qarşı səmimi, dostyana davranması müsbət yöndə təsir edən amillərdəndir. Ailədə uşaqların dostluq və yoldaşlığını düzgün qurmağı bacaran valideyn, uşağının artıq ailədən kənarda qonşularla, bağça və sinif yoldaşları ilə münasibətlərini bu yolda qurmaqları üçün əhəmiyyətli təsir göstərir. Uşaqların bu məzmunda ünsiyyətdə olduğu digər uşaqlarla birlikdə oynamaqları, birlikdə gəzintilərdə iştirak etmələri, yaşlarına uyğun hansısa məzmunda danışmaları, öz yeməklərini birbirilə paylaşmaları yoldaşlıq münasibətlərinin yaranması üçün ilkin başlanğıcdır.

4. Valideynlər öz uşaqlarına sadəlik, səmimilik, təvazökarlıq kimi hissləri aşılamalıdırlar. Təbii ki, ilk növbədə, valideynlər buna özləri də əməl etməli, öz danışıqlarında təvazökar, səmimi və sadəliyi ilə uşaqlarına nümunə olmalıdırlar. Lakin etiraf etmək doğru olardı ki, son zamanlar təvazökarlıqdan uzaq olan hallar – insanların dəbdəbəli geyinməyi, bahalı əyləncə mərkəzlərində olmaqları, son model telefonlardan istifadə etməsi, həmçinin bunları digər insanlara da nümayiş etdirmək məqsədilə xüsusilə, göstərmək üçün yollara əl atması və s. daha çox nəzərə çarpan hallardandır. Birmənalı şəkildə, bunların aradan qaldırılmasına çalışılarsa, uşaqlarda da bunu öz qaydasında təlqin etmək mümkündür.

5. Hər bir valideyn öz uşağını qayğıkeşlilik və diqqətlilik ruhunda tərbiyə etməlidir. Yalnız ətrafında qayğıkeş insanlar olan uşaqlarda bu hisslər formalaşmış olur. Onlar uşağa, yaşlıya qarşı diqqətli olmalı, hər fürsətdə insanlara kömək etməyi bacarmalı, laqeyd olmamalıdır-

lar. Uşaqlarda tək insana deyil, hər canlıya – bitkiyə, heyvana da qayğıkeşliliyi təbliğ etmək lazımdır. Onlar heyvanlara qarşı diqqətli olmalı, onlara qarşı tamamən şiddətdən uzaq durmalı, əksinə, onlara yuva qurub, yemək, su verməyi bacarmalı, heyvanları da sevməlidirlər.

6. Valideynlər uşaqlarının səliqəlilik ruhunda tərbiyə olunmasına nail olmalıdırlar. Səliqəlilik, ilk növbədə, şəxsin daxilindən gələn bir hissdir, bunu aşılamaq üçün isə ilkin olaraq uşaq özünəqulluq qaydalarına əməl etməlidir. Uşaq erkən yaşlarından üst-başını səliqəli saxlamağı bacarmalı, gün ərzində iki dəfə dişlərini fırça-lamalı, yemək yeməzdən əvvəl əllərini yumalı, vaxtlı-vaxtında duş almalı, öz yatağını özü yığışdırmalı, götürdüyü əşyaları yerinə qoymalı, geyimlərini səliqə ilə qarderobuna yığmalı, lazım olduğu təqdirdə kömək alaraq bunları yerinə yetirməlidir. Zamanla isə artıq uşaqların sərbəstliyinə də imkan verməli, bu işdə isə sadəcə olaraq, onlara istiqamət verilməlidir.

7. Valideynlər uşaqlarının humanizm və ədalətlilik ruhunda tərbiyə olunması üçün çalışmalıdırlar. Uşaqda humanizm mövqeyinin olması üçün əsas məsələ onlarda sevgi hissinin olmasıdır. Uşaqlar insanları sevməyi, onların fikirlərini dinləməyi, hörmət etməyi, onlarla birgə zaman keçirib ünsiyyət qurmağı bacarmalıdırlar.

8. Valideyn öz uşağını əməyə, əmək adamlarına məhəbbət, əməksevərlik ruhunda tərbiyə etməlidir. Uşaqların ilkin olaraq, əmək vərdişləri onların öz yerini yığışdırması, oyuncaqlarını yerbəyer etməsi, özünəqulluq işlərini yerinə yetirməsi aid edilir. Mütəmadi olaraq yerinə yetirilən bu işlər zamanla uşaqlarda vərdiş və alışqanlıq halını almış olur. Onlarda əməyə sevgi hissi aşılanmalıdır. Əməklə bərabər, uşaqlar əməkçi insanları da sevməlidirlər. Heç zaman əməyə, əməkçi insana xor baxmamalı, onlara qarşı sevgi və hörmət hissi ilə rəftar etməyi bacarmalıdır. Valideyn özü də nümunə olmalı, bu məzmunda uşaqları istiqamətlənirməlidir.

9. Valideynlər uşaqlarını vətənpərvərlik ruhunda böyütməlidirlər. Gözünü ailədə dünyaya açan uşaq elə vətən sevgisini də ilkin olaraq məhz ailədə görmüş olur. Bu yaşda uşaqlar öz vətəninin hara olduğunu bilməli, bayrağını tanımalı, ölkəsi haqqında elementar məlumtlara malik olmalıdır. Uşaq öz vətəninin ana qədər dəyərli, əziz olduğunu bilməli, böyüklərindən eşitdiyi "Vətəni qoruyan" şəxsin tək yurdun əsgəri deyil, bu torpağın suyunu içib, çörəyini yeyən hər bir vətəndaşın olduğunu zaman-zaman müxtəlif stiuasiyalarla anlamalıdır.

10. Valideynlər uşaqlarını milli ruhda, milli adət-ənənələrə sadiq hisslərlə böyütməlidirlər. Uşaqlar milli adət-ənənələrin nə olduğunu və necə yerinə yetirildiyini elə ailədə görərək böyüyürlər. Adətlər bir xalqın keçmişindən bu günə qədər gəlib çıxıbsa, deməli, bu, adətə maraq və diqqətin hələ də mövcud olması ilə bağlıdır. Uşaqlar öz milli bayramlarımızı tanımalı və adətlərini də yerinə yetirməlidirlər. Kiçikyaşlı uşaqlar, xüsusilə, Novruz bayramının adətlərini sevirlər. Onlar üçün papaq atmaq, yumurta boyanmasını həvəslə izləmək, hətta, bəzən özlərinin də yerinə yetirməsi, tonqal qalananda onun ətrafında olması, tonqal üçün çır-çırpı daşımaları, bayramda qonaq gedilməsi və s. xüsusi maraq və böyük istəklə yerinə yetirilən adətlərdəndir.

Sistemləşdirilmiş bu başlıqlar sadəcə görülə biləcək işin bir qismini təşkil edir. Tərbiyədə yol verilmiş nöqsanları aradan qaldırmaq üçün mütləq hər kəs səfərbər olmalı, müsbət yöndə dəyişiklik üçün hamı əlindən gələni etməyə çalışmalıdır. Çiçəklənən gələcək üçün çəkilən hər bir əmək öz faydasını mütləq ki, bir gün göstərmiş olacaq.

**Problemin aktuallığı.** Böyüməkdə olan gənc nəslin tərbiyəsi hər zaman cəmiyyətin maraq və diqqətini cəlb etmiş, bu məsuliyyəti dərk edən hər kəsin narahatlığına səbəb olmuşdur. Hər bir uşağın ilkin tərbiyəsi məhz ailədə başlayır, ona görə də ailədə qurulan tərbiyə işi düzgün əsaslar üzərində formalaşdırılmalıdır. Tərbiyə işi hər kəsdə müsbət yöndə inkişaf etmir, bu prosesin düzgün üsul və yollarını bilməyən hər kəs səhvlərə yol vermiş olur ki, bu da zamanla öz fəsadlarını göstərir. Vacib olan isə bu səhvlərin aradan qaldırılması üçün ən uyğun üsulları tapa bilməkdir.

**Problemin elmi yeniliyi.** Məqalədə ailədə uşaqların tərbiyəsində yol verilən nöqsanları aradan qaldırmaq üçün bir neçə üsul göstərilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqat işində ailə tərbiyəsində yol verilən nöqsanların aradan qaldırılması üçün üsul və yollar sistemləşdirilmişdir. Bundan tərbiyə işini həyata keçirən hər bir şəxs nəzəri və praktik cəhətdən istifadə edib tətbiq edə bilər.

**Ədəbiyyat:**

1. Əliyeva N.R. Məktəbəqədər yaşlı uşaqların ailədə tərbiyəsi.- Bakı: ADPU, -2018.
2. Əliyeva N.R. Məktəbəqədər yaşlı uşaqların ailə tərbiyəsində baş verən yanlışlıqlar və onların aradan qaldırılması yolları. -Bakı: ADPU,- 2021
3. Makarenko A.S. Valideynlər üçün kitab. / A.S. Makarenko -Bakı: Azərtədrisnəşr, -1964.

**E-mail:** ayshn.ehmedova24@gmail.com

**Rəyçilər:** *ped.ü.fəls.dok.,***Y.X. Məmmədova,**
*ped.ü.fəls.dok., dos.***T.B. Sadıqova**
**Redaksiyaya daxil olub:** 01.03.2023

*UOT 373.2*

***Pərvin Aydın qızı Cəfərova***
*pedaqogika üzrə fəlsəfə doktoru,*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*

***Gülderen Mehmet qızı Aydın***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# MƏKTƏBƏQƏDƏR TƏHSİL MÜƏSSİSƏLƏRİNDƏ İNKİŞAFETDİRİCİ TƏLİM MÜHİTİNİN TƏŞKİLİ

***Парвин Айдын гызы Джафарова***
*доктор философии по педагогике, старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

***Гюльдерен Мехмет гызы Айдын***
*Азербайджанский Государственный Педагогический Университет*

# ОРГАНИЗАЦИЯ РАЗВИВАЮЩЕЙ СРЕДЫ ОБУЧЕНИЯ В ДОШКОЛЬНЫХ ОБРАЗОВАТЕЛЬНЫХ УЧРЕЖДЕНИЯХ

***Parvin Aydın Jafarova***
*doctor of philosophy in pedagogy, senior lecturer at*
*Azerbaijan State Pedagogical University*

***Gülderen Mehmet Aydın***
*Azerbaijan State Pedagogical University*

# ORGANİZATİON OF A DEVELOPMENTAL LEARNİNG ENVİRONMENT İN PRESCHOOL EDUCATİONAL İNSTİTUTİONS

**Xülasə.** Məktəbəqədər təhsil müəssisələrində təlim mühitinin təşkil etdirilməsi, təhsil sahəsində standartların həyata keçirilməsində əsas amil hesab olunur. Məktəbəqədər təhsil müəssisələrində inkişafetdirici mühitin təşkil edilməsinin əsas şərti uşaqlar və böyüklər arasındakı qarşılıqlı təsirin hərtərəfli istiqamətləndirilmiş modelinə əsaslanmasıdır.

***Açar sözlər:*** *məktəbəqədər təhsil, inkişafetdirici mühit, məşğələ, fəaliyyət mərkəzi, öyrənmə, yaradıcılıq, proqram*

**Резюме**. Организация учебной среды в дошкольных образовательных учреждениях считается главным фактором реализации стандартов в сфере образования. Основным условием организации развивающей среды в дошкольных образовательных учреждениях является всесторонне ориентированная модель взаимодействия детей и взрослых.

***Ключевые слова:*** *дошкольное образование, развивающая среда, занятия, центр активности, обучение, творчество, программа*

**Summary.** The organization of the learning environment in preschool educational institutions is considered the main factor in the implementation of standards in the field of education. The main condition for organizing a developmental environment in pre-school educational institutions is based on a comprehensively oriented model of interaction between children and adults.

***Key words:*** *preschool education, developmental environment, activity, activity center, learning, creativity, program*

Ümummilli liderimiz Heydər Əliyev təhsil sahəsinin inkişaf etdirilməsi haqqında qeyd edir ki, "Biz təhsil sahəsində bütün yeniliklərin tərəfdarıyıq, dünya təcrübəsindən səmərəli istifadə etməyi tələb edirik " (5. s. 89).

Müasir məktəbəqədər təhsilin, pedaqoji elm və təcrübənin ən mühüm vəzifəsi məktəbəqədər yaşlı uşaqların sağlamlığının və təhlükəsizliyinin təmin olunması, onların hərtərəfli inkişafı, təlim və tərbiyə prosesinin effektivliyinin artırılması və humanistləşdirilməsi məsələləridir. Məktəbəqədər təhsil müəssisələrində təlim mühitinin təşkil etdirilməsi, təhsil sahəsində standartların həyata keçirilməsində əsas amil hesab olunur.

Mühit sözünün mənası Azərbaycan dilinin izahlı lüğətində bu şəkildə izah olunur. Mühit – insanın inkişaf etdiyi real gerçəklikdir (2, s. 56).

Uşağın inkişaf mühiti dedikdə onun fəaliyyət göstərdiyi, hərtərəfli inkişafının, emosional rifahı və idrak fəallığının təmin olunduğu mühit nəzərdə tutulur.

Məktəbəqədər yaşlı uşaqların yaradıcı və idraki qabiliyyətlərinin inkişaf etdirilməsi qrupda düzgün yaradılmış və mütəşəkkil əşya-məkan mühitindən bilavasitə asılıdır. Ətraf mühit, hər bir uşağın özü, başqa uşaqlar, böyüklər və cəmiyyət ilə münasibətlərin subyekti olaraq onların, qabiliyyət və yaradıcılıq potensialının inkişafında bir amil hesab olunur. Bu, təhsil indikatorunun yüksəlməsinə, uşaqların yaradıcılıq qabiliyyətlərinin inkişafına səbəb olur və uşağın gələcək həyatında böyük rol oynayır. Müasir dövrdə cəmiyyətə insan fəaliyyətinin istənilən sahəsində yaradıcılıq qabiliyyəti olan şəxsiyyətlərə ehtiyac vardır. Yaradıcılığın inkişafı heç də öz-özünə baş vermir, o, insandan xüsusi maraq, özünühazırlıq və diqqət tələb edir. O cümlədən, yaradıcı fəaliyyətlərdə uşaq ətrafı və dünyanı öyrənir, daim özü üçün maraqlı olan yeni bir şey kəşf edir və problemləri ortaya qoyaraq onların həlli prosesinə yönəlir.

İnkişafetdirici mühit nəzəriyyəsi Jan Jak Russonun pedaqoji baxışlarında əhəmiyyətli yer tutur. Görkəmli pedaqoq və müəllim ilk olaraq mühitin (təbii və əşyavi) uşağın optimal inkişafı üçün əsas şərt olduğunu müdafiə edirdi. Onun fikrincə, tərbiyə sistemi o zaman təsirli olur ki, hər bir uşaq üçün xüsusi inkişafetdirici mühit olsun, hansı ki, onun təbii ehtiyacları və real imkanları arasında tarazlıq yaratsın. Belə bir mühitdə uşaq hazır bilik almır, o, öz təcrübəsinə əsaslanaraq canlı təbiəti müşahidə edərkən bilikləri əldə etməyi öyrənir. Bununla bərabər, J.J. Russo uşağın inkişafının əsas mənbəyini biliklərin genişliyi deyil, onlardan müstəqil şəkildə istifadə etmək bacarığını qeyd edirdi.

Digər fransız pedaqoqu S. Frenenin fikrincə, uşaq öz şəxsiyyətini özü yaratmağa və potensial imkanlarını üzə çıxartmağa qabildir. Tərbiyəçi müəllimin başlıca funksiyası, uşağın bunları kəşf etməsinə və inkişafına kömək etməkdir. Bu baxımdan S. Frene uşaqların inkişafında mühitin təşkilinə xüsusi diqqət verirdi.

Məktəbəqədər müəssisələrdə təhsil mühitinin inkişaf etdirilməsi standartların həyata keçirilməsində əsas amil hesab edilir. Bu zaman fəaliyyət əsasdır və o, psixikanı qurur. Fəaliyyətsizlik şəxsiyyətin formalaşmasına mənfi təsir göstərir və imkanları məhdudlaşdırır. Bir çox alim şəxsiyyətin inkişafında fəaliyyət və fəaliyyətsizlik haqqında fikirlər bildirmişdir. Məsələn, A.V. Zaporojes fəaliyyəti yüksək dəyərləndirir və onu uşaqların zehni inkişafının gücləndirilməsi zənginləşdirilməsi) kimi izah edirdi (1, s. 138-139)

Məktəbəqədər təhsil müəssisələrində inkişafetdirici mühitin təşkil edilməsinin əsas şərti, uşaqlar və böyüklər arasındakı qarşılıqlı təsirin hərtərəfli istiqamətləndirilmiş modelinə əsaslanmasıdır. Yaşayış mühitinin təşkil olunması strategiyası tərbiyənin şəxsi istiqamətləndirilmiş modelinin xüsusiyyətləri, böyüklərin və uşaqların qarşılıqlı münasibəti ilə müəyyənləşir.

Böyüklərin məqsədi uşağın şəxsiyyət kimi inkişaf etməsinə kömək etmək, onlarda fiziki psixi təhlükəsizlik hissinin, mövcud olmaq (yaşamaq) sevincinin təmin edilməsi və uşaqda müstəqilliyin formalaşdırılması üçün münbit şərait yaratmaqdır. Bu nöqteyi-nəzərdən inkişafetdirici mühitin təşkili xüsusi əhəmiyyətə malikdir.

İnkişafetdirici mühitin təşkil olunması üçün bir sıra tələblər vardır.

1. Təlim mühiti, müasir texniki avadanlıqlarla təchiz olunmuş, erqonomikanın bütün tələblərinə cavab verən olmalıdır.

2. Uşaq fəaliyyətinin inkişafı üçün müasir dövrün tələblərinə cavab verən, perspektivli səviyyəyə nail olmanı təmin etməlidir;

3. Mühitin baza komponentləri, uşaq va böyüklərin fəaliyyətləri onların, makro və mikromühitləri ilə uyğun olmalıdırlar;

4. Uşağın indiki, yaxın gələcək və perspektiv inkişafının, konkret fəaliyyət növlərinin əşyavi əsasının gücləndirilməsi əsasında yaradıcı bacarıqların inkişafını təmin etməlidir;

5. Uşaqların inkişafı və öyrənməsinin təmini üçün onların yaş, fərdi, maraq, tələbat və güclü tərəfləri nəzərə alınmalıdır;

İnkişafetdirici mühitin daxili və xarici olmaqla 2 tipi mövcuddur (4, s. 14).

Xarici inkişafetdirici mühit dedikdə isə məktəbəqədər təhsil müəssisəsinin, həyətyanı sahəsi nəzərdə tutulur. Məktəbəqədər təhsil müəssisəsinin daxili məkanında mümkün olmayan imkanların təmin edilməsidir. Xarici inkişafetdirici mühitə, uşaqlar üçün ekskursiya və gəzintilərin təşkil edilməsini daxil edə bilərik.

Daxili inkişafetdirici mühit dedikdə, məktəbəqədər təhsil müəssisəsinin və qrupun daxili mühiti yəni məşğələ mühiti nəzərdə tutulur. Fəaliyyət mərkəzləri (guşələr) belə mühitin yaradılması üçün əsas vasitə hesab olunur. Belə mühit uşağın maraqlarını, tələbatlarını və bütün bunlar əsasında uyğun təlimin praktikada həyata keçirilməsinə imkan verir.

İnkişafetdirici və dəstəkləyici mühitin yaradılması üçün müxtəlif fəaliyyət mərkəzləri təşkil olunur və bu fəaliyyət mərkəzləri, məktəbəqədər təhsilin dövlət proqramında (kurikulum) olan dörd inkişaf sahəsi (Fiziki inkişaf sağlamlıq təhlükəsizlik, İdrakın inkişafı, Estetik və yaradıcı inkişaf, Sosial-emosional inkişaf) üzrə qurulur və məktəbəqədər yaşlı uşağın hərtərəfli inkişafını təmin edir (4, s 16-17).

Məşğələ prosesində elə şərait yaradılmalıdır ki, uşağın müstəqil şəkildə, maraqlarına mütənasib seçim etmək imkanı olsun. Hər yaş qrupu üçün bir neçə guşə yaradılır və bu guşələrində hər birində uşaqların tədqiqat apara bilməsi və oyunlar üçün kifayət qədər didaktik materiallar təqdim olunur.

Məktəbəqədər təhsilin kurikulumunda yaş qrupları üzrə müxtəlif fəaliyyət mərkəzləri yaradılır. Bu fəaliyyət mərkəzləri aşağıdakılardir:

• Riyaziyyat guşəsi;
• Stolüstü oyunlar guşəsi;
• Kitab guşəsi;
• Elm guşəsi;
• Təsviri fəaliyyət guşəsi;
• Qum və su guşəsi;
• Tikinti materialları guşəsi;
• Sujetli-rollu oyunlar guşəsi ;
• Məişət-təsərrüfat guşəsi;
• Milli guşə;
• Gəlincik guşəsi;
• Nəqliyyat guşəsi;
• Təbiət guşəsi;
• Əl əməyi (məktəbəhazırlıq qrupunda) guşəsi (4, s. 37-38).

Bütün bu fəaliyyət mərkəzlərinin məzmununu aşağıdakı kimi xarakterizə edə bilərik.

*Riyaziyyat guşəsi*. Bu guşə dörd və yuxarı yaşlı uşaqlar olan qruplar üçün yaradılır. Guşənin yaradılmasının məqsədi uşaqların, idrak fəallığını stimullaşdırmaq və onları psixofizioloji xüsusiyyətlərin və yaş mərhələlərinə uyğun sadə riyazi təsəvvür və bacarıqlara yiyələnmə sahəsində müxtəlif fəaliyyətlərə sövq etməkdən ibarətdir.

*Kitab guşəsi*. Bu guşə məktəbəqədər təhsil müəssisəsinin bütün yaş qruplarında təşkil olunur, həmçinin məktəbəqədər yaşlı uşaqlarda bədii əsərlərə qarşı marağın formalaşdırılması və kitaba qayğıkeş münasibət bəsləməyi öyrətmək üçün kitab guşəsi mühüm rol oynayır.

*Stolüstü oyunlar guşəsi.* Bu guşə ətraf aləmdəki bitki, heyvan, canlı və cansız təbiətlə tanış olan uşaqlar üçün maraqlı bir fəaliyyət hesab olunur. Bəzi stolüstü çap oyunları mozaika, pazl, domino və s.

*Elm guşəsi.* Bu guşə, vasitəsilə uşaqlar müşahidə və təcrübə aparmaqla dünyanı başa düşməyə çalışırlar.

*Təsviri fəaliyyət guşəsi.* Bu guşə, uşaqların ətraf mühitin estetik tərəfinə marağının formalaşdırılması, gözəlliyi duymaq hiss etmək və onların vasitəsilə özünüifadə tələbatının ödənilməsini yerinə yetirir.

*Qum və su guşəsi.* Bu guşə uşaqların xırda motorikası, yaradıcılıq imkanları üçün çox əhəmiyyətlidir.

*Milli guşə.* Bu guşə uşaqlara azərbaycançılıq ideologiyasının düzgün təbliği, milli adət və ənənələrimizi təbliğ etmək məqsədilə hazırlanır.

*Gəlincik guşəsi.* Gəlincik, uşaqların cinsindən asılı olmayaraq, onun psixi inkişafında xüsusi əhəmiyyətə malikdir.

*Təbiət guşəsi*. Bu guşə müxtəlif yaş qrupları üzrə müxtəlif şəkildə qurulur. Məsələn, orta qrupda böyük yarpaqlı bitkilər, böyük qrupda isə 5-6 bitki növü, otaq heyvanları (quş, akvarium balığı və s.) növü yerləşdirilir. Beləliklə, uşaqlarda məsuliyyət hissi formalaşdırılır.

*Nəqliyyat guşəsi*. Bu guşədə nəqliyyat, tikinti materialları və peşələri əks etdirən müxtəlif ölçülü maşınlar yerləşdirilir və bunların vasitəsilə uşaqlar yol qaydalarını, yerüstü, hava, su nəqliyyat vasitələri öyrədilir.

*Tikinti materialları guşəsi*. Tikinti guşəsində uşaqlar müxtəlif növ konstruktorlar, kublar, iri və xırda taxta tikinti materiallarından istifadə etməklə ev, maşın, körpü kimi obyektlər düzəldirlər. Bütün bunlar uşaqda yaradıcılıq – quraşdırma qabiliyyəti, problemlərinin həll edilməsi riyazi və sosial bacarıqların inkişafını təmin edir.

*Sujetli-rollu oyun guşəsi*. Bu guşədə uşaqlar real həyatdan götürülmüş səhnələri canlandırmaq arzusunda olurlar, onlar cürbəcür kostyum və əşyalardan istifadə edərək oyun prosesini qururlar.

*Məişət-təsərrüfat guşəsi*. Bu guşədə məişət avadanlıqları olur və uşaqlar onlardan istifadə etməklə sadə əmək bacarıqlarına yiyələnirlər.

Fəaliyyət mərkəzləri bir-birindən ayrı şəkildə, xüsusi avadanlıq və materiallarla təchiz olunur. Mərkəzlərdə qoyulan materiallar oyuncaqlar, kitablar, oyuncaq qablar, həndəsi fiqurlar, mətbəxə aid oyuncaqlar, kağız, boyalar, qələm, karton, plastilin, pazllar, müxtəlif bitkilər və yarpaqlar və s.

Bütün bu avadanlıqlar uşaqların əli çatan yerlərdə qoyulmalı və onlar həmin materiallarla müstəqil və yaradıcı şəkildə yanaşmaya həvəsləndirilməli və maraq oyatmalıdır. Fəaliyyət mərkəzləri elə təşkil olunmalıdır ki, kiçik yaşlı uşaqlar bir-birilə oynayıb ünsiyyət qura və istədikləri fəaliyyət mərkəzlərini özləri seçə bilsinlər. Bunun vasitəsilə uşaqlar, fəaliyyət mərkəzlərində əməkdaşlığı, kollektivdəki davranış qaydalarını və birgə oynamağı öyrənirlər.

Təəssüf ki, məktəbəqədər təhsil müəssisələrinin əksəriyyətində bu fəaliyyət mərkəzləri kifayət qədər mövcud deyil və ya uşaqların fəaliyyət mərkəzlərindən müstəqil sürətdə istifadə etmələrinə icazə verilmir.

**Problemin aktuallığı.** Məktəbəqədər təhsil müəssisəsində təşkil olunan inkişafetdirici mühit, uşaqların fiziki, intellektual, sosial, emosional inkişafı üçün daim aktual olan bir məsələdir. Bunu üçün məktəbəqədər müəssisələrdə təhsil mühitinin inkişaf etdirilməsi standartların həyata keçirilməsində əsas amil hesab edilir.

**Problemin elmi yeniliyi.** Elmi məqalədə məktəbəqədər yaşlı uşaqların hərtərəfli inkişafı üçün vacib hesab olunan, inkişafetdirici mühitin təşkilinə verilən tələblər və yaradılması qaydaları açıqlanmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məktəbəqədər müəssisədə inkişafetdirici mühitin təşkil olunması, uşaqların məşğələ prosesində fəal mövqe tutmasına kömək edəcəkdir.

**Ədəbiyyat:**

1. Baxışova Ş. Məktəbəqədər təhsildə inkişafetdirici təlim. Dərs vəsaiti / Ş. Baxışova. -Bakı, -2021. -s. 291.
2. Ə. Orucov; tərtibçilər. Ə. Orucov, B. Abdullayev, N. Rəhimzadə. Azərbaycan dilinin izahlı lüğəti. IV-cild. Nəsimi adına Dilçilik İnstitutu Şərq-Qərb, -2006. -792 s
3. İnkişafetdirici, dəstəkləyici və təhlükəsiz mühitin yaradılması haqqında modul. BAKI-2020 s.84
4. Məktəbəqədər təhsilin proqramı (Kurikulum). -Bakı, 2022. -s.54
5. Səmədov Abbas. Ümummilli liderimiz Heydər Əliyevin Azərbaycanda təhsilə və təhsil xadimlərinə qayğısı. -Gəncə, 2010. -s.2

**E-mail**: gulderenaydin48@gmail.com
**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **T.B. Sadıqova,**
*ped.ü.fəls.dok.* **N.R. İsmayılova**
**Redaksiyaya daxil olub:** 27.02.2023

*UOT 373.2*

***Sədaqət Ağarəhim qızı Əliyeva***
*pedaqogika üzrə fəlsəfə doktoru,*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti*

***Gülnar Elman qızı Bağışova***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# MƏKTƏBƏQƏDƏR YAŞLI UŞAQLARIN ƏXLAQİ TƏRBİYƏSİNDƏ ADƏT-ƏNƏNƏLƏRİN ƏHƏMİYYƏTİ

***Садагат Агарагим гызы Алиева***
*доктор философии по педагогике, доцент*
*Азербайджанского Государственного Педагогического Университета*

***Гюльнар Эльман гызы Багышова***
*Азербайджанский Государственный Педагогический Университет*

# ЗНАЧЕНИЕ ТРАДИЦИЙ В НРАВСТВЕННОМ ВОСПИТАНИИ ДОШКОЛЬНИКОВ

***Sadagat Agharahim Aliyeva***
*doctor of philosophy in pedagogy, associate professor at*
*Azerbaijan State Pedagogical University*

***Gulnar Elman Bagishova***
*Azerbaijan State Pedagogical University*

# THE SIGNIFICANCE OF TRADITIONS IN THE MORAL EDUCATION OF PRESCHOOL CHILDREN

**Xülasə**. Məqalədə məktəbəqədər yaşlı uşaqların əxlaq tərbiyəsində adət ənənələrin əhəmiyyətindən, əsrlər boyu əxlaqi-mənəvi mədəniyyət təcrübəsi və tərbiyə vasitəsi kimi rolundan bəhs edilir. Eyni zamanda, məktəbəqədər yaşlı uşaqlarda xeyirxahlıq, əməkdaşlıq, mənsubiyyət, öz mədəni irsinə hörmət kimi keyfiyyətlərin formalaşmasında adət-ənənələrin imkanları açıqlanmışdır.

***Açar sözlər:*** *adət-ənənələr, xalq, şəxsiyyət, milli-mənəvi dəyərlər*

**Резюме**. В статье говорится о значении традиций в нравственном воспитании дошкольников, их роли как нравственно – духовного культурного опыта и воспитательного средства на протяжении веков. Здесь выявлены возможности традиций в формировании у дошкольников таких качеств, как доброта, сотрудничество, уважение к своему культурному наследию.

***Ключевые слова:*** *традиции, народ, личность, национально-нравственные ценности*

**Summary**. The article talks about the importance of traditions in the moral education of preschool children, their role as a moral and spiritual cultural experience and educational tool for centuries. Here, the possibilities of traditions in the formation of qualities such as kindness, cooperation, belonging, respect for one’s cultural heritage in preschool children have been revealed. At the same time, the possibilities of raising preschool children through traditions were discussed.

***Key words**: traditions, personality, national and moral values*

Hər xalqın özünün adət-ənənələri vardır ki, hər bir dövrdə onlara müraciət olunmuşdur. Hər bir xalqın səviyyəsi onun öz adət-ənənələrinə sadiq qalması və onu qoruyub saxlaması ilə ölçülür.

Adət-ənənələr nəsihətlər, məsləhətlər, göstərişlər, tələblər, qadağalar və s. sistemidir. Bu sistemdə aparıcı tələb öz xalqının ənənələrinin və arzularının daşıyıcısı olan vətənpərvər, öz xalqına bağlı olan insanın tərbiyəsindən ibarətdir. Xalq yetişən nəslin tərbiyəsində əxlaqi-mənəvi mədəniyyət təcrübəsi olan adət ənənələrdən mənəvi tərbiyə vasitəsi kimi istifadə etmişdir. Adət-ənənələr hər bir insan nəslinin yaratdığı maddi və mənəvi sərvətlər sistemini qoruyub saxlamaq və onları yeni nəslə vermək vasitəsi kimi çıxış edir. Adət-ənənələrimizin əksəriyyəti mənəvi tərbiyənin daşıyıcılarıdır. Adət-ənənələr özündə xalq müdrikliyini, əxlaqi dəyərlər sistemini təqdim edir. Adət-ənənələrə hamının əməl etməsi mütləqdir. Əsrlər boyu əcdadlarımız adət və ənənələrə tərbiyə vasitəsi kimi baxmışlar. Xalqın əxlaqı, mənəvi həyatı bu adət-ənənələr üzərində qurulub. Adət-ənənələr nəsildən-nəslə ötürülən mədəni təcrübələrdir. Hər bir xalqın dəyəri onun adət – ənənələrinin, mədəniyyətinin yüksəkliyi ilə ölçülür. Xalq adət-ənənələri sistemi davranış normalarının, mədəni-mənəvi dəyərlərin nəsildən-nəslə ötürülməsi mexanizmini təmin etdiyi üçün tərbiyənin təsirli vasitələrindən biridir.

Adət-ənənələr tarixi yaddaşın qoruyucusu, ilkin mədəniyyətin, əvvəlki nəsillərin daşıyıcısı olmaqla xalqın pedaqoji təcrübəsini əks etdirir. Adət-ənənələr ahəngdar inkişaf etmiş şəxsiyyətin yetişdirilməsində böyük əhəmiyyət kəsb edir. Xalq adət-ənənələri ən yaxşı şəxsiyyətin xüsusiyyətlərinin və əxlaq normalarının cəmləşdirdiyi nümunə kimi çıxış edir. Adət-ənənələr tarixən formalaşmış norma və prinsipləri, münasibətləri, idealları təsbit edir. Lakin adət-ənənələr təkcə ictimai münasibətlərin norma və prinsipləri, ictimai fəaliyyət yolları, keçmişin irsi və ya insanların davranış normaları ola bilməz. Onlar həm keçmiş, həm də müasir sosial təcrübənin nəticələrini birləşdirir. Onlar insanların birliyinə xas olan ictimai münasibətlərin xarakterini ifadə edir.

Kollektiv yaddaş kimi çıxış edən adət-ənənələr etnik şüurun ayrılmaz elementidir. Təcrübə göstərir ki, əsrlər boyu adət-ənənələr yeni nəsillərin cəmiyyətin həyatına daxil edilməsinin, müəyyən şəxsiyyət tipinin formalaşmasının ən təsirli vasitələrindən biri olmuşdur. Xalq adət-ənənələri uşağın tərbiyə prosesində mühüm rol oynayır. Çünki cəmiyyətdə qəbul olunmuş mənəvi əsaslar və normalar məhz onlarda toplanır. Burada tərbiyəvi təsirin özəlliyi ondadır ki, onlar insanın həyatının hər hansı bir yaş dövrü ilə məhdudlaşmır.

Adət-ənənələr sosial hadisə olmaqla insanların cəmiyyətdə və şəxsi həyatda münasibətlərini tənzimləyən prinsiplər, normalar və qaydalar kimi də çıxış edir, ictimai rəy tərəfindən bəyənilir və dəstəklənir. Adət-ənənələr böyüklərin və uşaqların ailədə və cəmiyyətdə davranış davranış və fəaliyyətlərinin tənzimlənməsi kimi çıxış edir, mənəvi keyfiyyətlərin əsaslarını təşkil edir, yeni mənəvi dəyərlərin dirçəlməsinə töhfə verir, xalqın mədəni irsini zənginləşdirir.

İnsanın mənəvi formalaşmasında ən əlamətdar dövr məktəbəqədər yaşdır. Bu yaş xarici təsirlərə qarşı həssaslığın artması, əxlaq normalarının qeyd-şərtsiz yerimə yetirilməsi və onların zəruriliyinə inam, davranışda əxlaqi tələblərə riayət ilə xarakterizə olunur.

Adət-ənənələr müdriklik və pedaqoji düşüncə mənbəyimizdir. Bu gün adət-ənənələri məktəbəqədər yaşlı uşaqlara aşılamaqla qarşıda aşağıdakı vəzifələr durur:

- uşaqda milli yaddaşın möhkəmlənməsinə kömək etmək;
- qədim köklərimizə hörmət tərbiyə etmək;
- uşaqları xalq mədəniyyətinin mənşəyi ilə sistemli və məqsədyönlü şəkildə tanış etmək.

Adət-ənənələr məktəbəqədər yaşlı uşağa şəxsiyyətlər arası münasibətləri, dəyərləri, ana dilinin zənginliyi əvəzolunmaz şəkildə təqdim edir. Uşağın şəxsiyyəti təkcə xüsusi yaradılmış şəraitdən deyil, həm də ətraf mühitin təsiri altında formalaşır: adət-ənənələr, mərasimlər, folklor, bayramlar və s.

Nəsildən-nəslə ötürülən xalq ənənələri müxtəlif tərbiyə vasitələri və formaları yaradır. Xalqın mənəvi, bədii-estetik ideyalarını ifadə edən ənənələrə müraciət məktəbəqədər yaşlı uşaqda milli qürur hissinin canlanmasına xidmət edir.

Məktəbəqədər yaşlı uşaqların əxlaqi tərbiyəsi onlarda əxlaq və dəyərlər hissini formalaş-

dırmağın vacib aspektidir. Adət-ənənələr uşağın əxlaqi inkişafının formalaşmasında mühüm rol oynayır, çünki onlar mədəni şəxsiyyət hissini və sosial normaları təmin edir.

Əxlaqi tərbiyə kontekstində adət-ənənələr məktəbəqədər yaşlı uşaqlara hörmət, xeyirxahlıq kimi dəyərləri öyrənməyə kömək edə bilər.

Adət-ənənələr uşaqlarda əməkdaşlıq və ətrafdakılara empatiya kimi sosial bacarıqların inkişafına kömək edə bilər. Bundan əlavə, adət-ənənələr məktəbəqədər yaşlı uşaqlarda şəxsiyyət və mənsubiyyət hissini inkişaf etdirməyə kömək edə bilər. Mədəni və ya ailə ənənələrində iştirak etməklə, uşaqlar öz irsi va tarixi haqqında məlumat əldə edirlər.

Adət və ənənələrin tələb və göstərişlərinin yerinə yetirilməsi məktəbəqədər yaşlı uşaqların dünyagörüşünün, hiss və davranış mədəniyyətinin formalaşmasına, onun ətraf aləmə münasibətinə əhəmiyyətli dərəcədə təsir göstərir.

Xalqın pedaqoji yaradıcılığı kimi adət-ənənələr məktəbəqədər yaşlı uşaqların hisslərinə, iradəsinə, şüuruna və davranışına pedaqoji təsir baxımından əhəmiyyətlidir.

Adət-ənənələr uşaqların emosional vəziyyətinə müsbət təsir göstərə bilər. Adət-ənənələrdə iştirak etmək uşaqlarda rahatlıq və təhlükəsizlik hissini təmin edir. Bundan əlavə, adət-ənənələrdə iştirak etmək uşaqların yaddaşında xoşbəxt xatirələr kimi qalır.

Adət-ənənələr məktəbəqədər yaşlı uşaqlarda öz mədəni irsinə və ətrafdakı dünyanın müxtəlifliyinə hörmət hissini inkişaf etdirməyə kömək edir. Fərqli adət-ənənələr və adətlər haqqında məlumat əldə etməklə, uşaqlar fərqli inanclara və ya mədəni təcrübələrə malik ola bilir. Bununla belə, adət-ənənələrin aşılanmasında uşaqların yaşauyğunluğunu nəzərə almaq vacibdir. Məsələn, azyaşlı uşaqlara anlaması mürəkkəb və ya çətin ola biləcək adət-ənənələri izah etmək məqsədəuyğun deyil.

Ənənələrdə birlikdə iştirak etməklə, ailələr ailə üzvləri arasında müsbət münasibətləri gücləndirməyə kömək edə biləcək ortaq təcrübələr yarana bilərlər. Bu, sosial və emosional bacarıqlarını inkişaf etdirən məktəbəqədər uşaqlar üçün xüsusilə vacibdir.

Adət-ənənələrə misal bayram və şənliklərin qeyd olunmasıdır. Bu adət-ənənələr uşaqlara hadisənin əhəmiyyətini və onun mədəni kontekstini anlamağa kömək edir. Onu da qeyd etmək lazımdır ki, adət-ənənələrdəki əxlaq tərbiyəsini digər üsullar ilə, məsələn, hekayə, rol oyunu və s. ilə uşaqlara çatdırmaq olar. Müxtəlif yanaşmaları birləşdirərək, biz məktəbəqədər yaşlı uşaqlara hərtərəfli şəkildə əxlaqi tərbiyəni aşılaya bilərik.

Adət-ənənələr özündə xalqın həyatını, mənəviyyatını əks etdirir. Adət və ənənələrin bir xüsusiyyəti tarixən onların yeni nəslə əyani şəkildə ötürülməsidir. Əsrlər boyu adət-ənənələr insanların ictimai davranışını tənzim etmişdir. Bu adət-ənənələri məktəbəqədər yaşlı uşaqlar canlı gördükləri üçün hafizələrində daha dərin həkk olur.

Adət-ənənələrin qorunması, inkişafı vətənpərvər, yüksək mənəviyyata malik, xalqının adət-ənənələrinə, dilinə, dininə hörmətlə yanaşan şəxsiyyətin tərbiyə edilməsində müstəsna rol oynayır. Milli-mənəvi dəyərlərimizdən olan və xalqın mənəviyyatını təmsil edən adət-ənənələrimizi xalqımız yüz illərlə yaratmış və yaşatmışdır. Adət-ənənələri yaşatmaq üçün gənc nəslə mədəni təcrübəni, onun mahiyyətini, dəyərini düzgün mənimsətmək lazımdır.

Ailə sabit bir sosial birlik kimi məktəbəqədər yaşlı uşağın tərbiyəsində mühüm amildir. O, sosial təcrübənin nəsildən -nəslə ötürülməsi mənbəyi olaraq qalır. Xüsusilə məktəbəqədər yaşda uşağın əxlaq tərbiyəsində ailə mühüm rol oynayır. Şəxsiyyətin əsası ailədə qoyulur. İlk ideyalar, anlayışlar, bacarıqlar, insanlara münasibət, əxlaqi davranış normaları, hisslər ailədə formalaşır. Uşağın həyatının ilk günlərindən Şəxsiyyətin kompleks formalaşması ailədə sosial münasibətlər zəminində davam edir. Burada xalq adət-ənənələri mühüm əhəmiyyətə malikdir.

Adət-ənənələr ilk növbədə ailədə canlandırılmalıdır. Adət-ənənələrin öyrənilməsi, o cümlədən ailədə istifadəsi uşaqların əxlaqi keyfiyyətlərinin hərtərəfli formalaşdırılması yollarını dərk etmək üçün mühüm əhəmiyyət kəsb edir.

Məktəbəqədər yaşlı uşaqlarda xalq adət-ənənələrinə müəyyən münasibət, dərindən hörmət, onların mahiyyətini dərk etmək və onları yerinə yetirən insanlara hörmət hissi yaratmaq lazımdır.

Yekun olaraq qeyd edək ki, adət-ənənələr məktəbəqədər yaşlı uşaqların əxlaqi tərbiyəsin-

də həlledici rol oynayır və mühüm vasitə kimi çıxış edir. Onlar uşaqlara mədəni sosial normalar aşılayır, mühüm dəyərləri və sosial bacarıqları öyrədir, mənlik hissini inkişaf etdirməyə kömək edir. Məktəbəqədər yaşlı uşaqları adət-ənənələrdə iştiraka cəlb etmək vacibdir. Uşaqları prosesə cəlb etməklə, biz onlara adət-ənənənin mənasını və əhəmiyyətini daha dərindən dərk etməyə kömək edə bilərik. Adət-ənənələri məktəbəqədər yaşlı uşaqların tərbiyəsinə daxil etməklə biz ətrafdakı dünyanın mürəkkəbliklərini idarə etməyi bacaran məsuliyyətli, empatik və əxlaqi cəhətdən inkişaf etmiş şəxsiyyətlərin formalaşmasına nail ola bilərik.

**Problemin aktuallığı.** Adət-ənənələrin məktəbəqədər yaşlı uşaqların sosial- mədəni kompetensiyalarının formalaşdırılmasında əhəmiyyəti vurğulanır.

**Problemin elmi yeniliyi.** Adət-ənənələr sosial mahiyyətə malik olmaqla, məktəbəqədər yaşlı uşağın həyat, cəmiyyətlə sosial münasibətlər sisteminə, adaptasiya prosesində cəmiyyətdəki norma, prinsip və qaydalara tabeçilik yanaşmalarının ortaya çıxarılması baxımından mühüm əhəmiyyət kəsb edir.

**Problemin praktik əhəmiyyəti.** Adət-ənənələr vasitəsilə məktəbəqədər müəssisədə təlim-tərbiyə işinin təşkili və uşaqların sosial bacarıqlarının formalaşması baxımından tərbiyəçilər metodik vasitə kimi istifadə edə bilərlər.

**Ədəbiyyat:**


1. Əliyeva S. Xalq pedaqogikasında tərbiyə məsələləri. Bakı, 2016.
2. Əliyeva S. Etnopedaqogika , Bakı , 2016.
3. Nəbiyev A. Mərasimlər , adətlər, alqışlar . Bakı, 1993.
4. Məmmədov Ə . Milli adət və ənənələr . Bakı, 2000.
5. Xəlilova F. Adət və ənənələr . Bakı, 1986.


**E-mail:** baghgulnar4@gmail.com
**Rəyçilər:** *ped.ü.fəls.dok.* **L.A. Məmmədli,**
*ped.ü.fəls.dok.* **S.A. Abdullayeva,**
**Redaksiyaya daxil olub:** 01.03.2023

## *İBTİDAİ TƏHSİLİN AKTUAL PROBLEMLƏRİ*
## *АКТУАЛЬНЫЕ ПРОБЛЕМЫ НАЧАЛЬНОГО ОБРАЗОВАНИЯ*
## *ACTUAL PROBLEMS OF PRIMARY EDUCATION*

*UOT 372.3/.4*

***Şəhla Qasım qızı Əliyeva***
*pedaqogika elmləri doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

***Sevda Sunbat qızı Tağızadə***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# MƏŞĞƏLƏ PROSESİ ZAMANI TƏLİM FƏALİYYƏTİNİN ƏSAS ELEMENTLƏRİNDƏN OLAN ÖYRƏNMƏNİN HƏYATA KEÇİRİLMƏSİ

***Шахла Гасым гызы Алиева***
*доктор педагогических наук*
*Азербайджанский Государственный Педагогический Университет*

**Севда Сунбат гызы Тагизаде**
*Азербайджанский Государственный Педагогический Университет*

# ОСУЩЕСТВЛЕНИЕ ОБУЧЕНИЯ, ЯВЛЯЮЩЕГОСЯ ОСНОВНЫМ ЭЛЕМЕНТОМ УЧЕБНОЙ ДЕЯТЕЛЬНОСТИ В ПРОЦЕССЕ ЗАНЯТИЙ

***Shahla Gasim Aliyeva***
*doctor of pedagogical sciences*
*Azerbaijan State Pedagogical University*

**Sevda Sunbat Taghizadeh**
*Azerbaijan State Pedagogical University*

# IMPLEMENTATİON OF LEARNİNG, WHİCH İS THE MAİN ELEMENT OF THE TRAİNİNG ACTİVİTY DURİNG THE TRAİNİNG PROCESS

**Xülasə:** Məktəbəqədər təhsil müəssisələrində təlim fəaliyyətinin həyata keçirilməsi üçün öyrənmə prosesi düzgün qurulmalıdır. Bu zaman uşaqların öyrənmə marağı, öyrənmə tərzi nəzərə alınmalı və təlim fəaliyyətinə həm skafoldinq, həm də diferensial şəklində yanaşmaq məqsədəuyğundur

***Açar söz:*** *məktəbəqədər təhsil, məşğələ, təlim prosesi, təlim elementi, öyrənmə, difrensial təlim, skafoldinq, öyrənmə tərzi.*

**Резюме**: Для реализации учебной деятельности в дошкольных образовательных учреждениях необходимо правильно организовать учебный процесс. В это время следует принимать во внимание интерес детей к обучению и стиль обучения, и уместно подходить к учебной деятельности как в форме скаффолдинга, так и в дифференциальной форме.

***Ключевые слова:*** *дошкольное образование, занятие, процесс обучения, элемент обучения, обучение, дифференцированное обучение, скаффолдинг, стиль обучения.*

**Summary**: In order to implement the training activities in preschool educational institutions, the learning process must be properly established. At this time, children's learning interest and learning style should be taken into account, and it is appropriate to approach the learning activity in both scaffolding and differential form.

***Key word:*** *preschool education, training, learning process, learning element, learning, differential learning, scaffolding, learning style.*

Məktəbəqədər təhsil müəssisələrində təlim prosesinin mahiyyəti dedikdə fəaliyyəti aktivləşdirən, uşaqların yaradıcılıq qabiliyyətlərini inkişaf etdirən, uşaqların fəal təlim və idrak fəaliyyətinin təşkili və stimullaşdırılmasını, ilkin bilik və bacarıqlara yiyələnməyi, onların dünyagörüşü və əxlaqi-estetik baxışlarının formalaşmasını özündə ehtiva edən məqsədyönlü pedaqoji prosesdir.

Vahid məktəbəqədər təhsil müəssisələrində pedaqoji prosesi təşkil edən təlim fəaliyyəti bir sıra elementləri özündə cəmləşdirir ki, bunlardan biridə öyrənmədir. Öyrənmə elementinin həyata keçirilərək reallaşdırılması üçün əsas şərtlərdən biri təlim prosesini uşaqlar arasında qarşılıqlı əlaqə və fəaliyyət üzərində qurulmasıdır. Bu o deməkdir ki, bu formada həyata keçirilən təlim zamanı uşaqlar informasiyanı passiv şəkildə qəbul edən tərəf olmaqda çıxıb, onu aktiv şəkildə analiz, tətbiq edən, dəyərləndirən tərəfə çevrilirlər və bu zaman informasiyanın mənbəyi də yalnız tərbiyəçi-müəllim deyil, uşaqlar özləri də ola bilirlər. Təlim prosesini uşaqlar arasında qarşılıqlı əlaqə və fəaliyyət üzərində qurarkən uşaqların problem həll etmə və tənqidi düşünmə bacarıqları gücləndirilir, onların həm tərbiyəçi ilə, həm də digər yoldaşları ilə qarşılıqlı əlaqə və fəaliyyətdə olmasını təmin edir. Və qarşıda duran əsas prinsip isə tətbiqetmə zamanı uşaqlara ötürülən informasiyanın onlar tərəfindən qavramasına, bacarıqların formalaşdırılmasına xidmət edir.

Təlim prosesini uşaqlar arasında qarşılıqlı əlaqə və fəaliyyət üzərində qurulmasının bir sıra üstünlükləri vardır: 1) Uşaqların nailiyyətinin ölçülə bilən olması. 2) Uşaqların motivasiyası. 3) Real həyat bacarıqları.

Öyrənmə mühitinin yaradılması üçün lazım olan bir sıra müəyyən direktivlər vardır ki, onlar aşağıdakılardır:

- Uşaqlara cavab verməyə, müzakirə etməyə, praktik tətbiqə sövq edən geniş spektrli sualların verilməsi
- Uşaqların diqqətini cəlb edən, onları cavab verməyə sövq edən təlim vasitə və üsullarında istifadə edilməsi
- Qrupda işçi qrupu atmosferinin yaradılması
- Uşaqlarla bərabər tərbiyəçinin də fəaliyyətə cəlb olunması və s.

Qeyd etdiyimiz kimi öyrənmə təlim fəaliyyətinin əsas elementlərindən biridir və vahid tərifi yoxdur. Bir çox ədəbiyyatlarda isə öyrənməyə müxtəlif təriflər verilmişdir:

"Öyrənmə məqsədyönlü, idarə olunan prosesdir", burada "müəllim bilikləri müəyyənləşdirir, tapşırıqlar verir, biliklərin şüurlu mənimsənilməsi, möhkəmləndirilməsi və tətbiqi üsul və üsullarını öyrədir, bilik, bacarıq və bacarıqların keyfiyyətini yoxlayır. Eyni zamanda, o, məktəblilərin idrak qabiliyyətlərinin inkişafına daim diqqət yetirir "(B.P. Esipov) (4, s.130)

Öyrənmə dedikdə keçirilən materialı mənimsəmək üçün şagirdlərin fəaliyyəti başa düşülür (2, s.132).

Öyrənmə məktəbəqədər yaşlı uşaqların bilik əldə etmək məqsədi ilə həyata keçirdiyi fəaliyyətdir (1, s.18).

Sözlərdəki qeyri-müəyyənliyə baxmayaraq, onların ümumi xüsusiyyətləri var. Öyrənmə dedikdə, uşaqların tərbiyəçinin rəhbərliyi altında fəal məqsədyönlü idrak fəaliyyəti başa düşülür ki, bunun nəticəsində uşaqlar ilkin biliklər, bacarıq və bacarıqlar sistemini mənimsəyir, onda öyrənməyə marağı inkişaf etdirir.

Məktəbəqədər yaşlı uşağı həm əşyalar və obyektlər aləmi, həm də hadisə və təzahürlər aləmi maraqlandırır. Əxlaqi təsəvvürlər və normaların daşıyıcısı olan insan, uşağı müxtəlif tərəflərdən maraqlandırır: nə edir, nə danışır, nəyə nə cür münasibət bəsləyir. MTM-də uşağın zehni fəallığını və maraqlarını azaltmamaq, onun əqli bacarıqlarını, dünyaya aktiv-müsbət münasibətini inkişaf etdirmək üçün böyüyün pedaqoji mövqeyini düzgün müəyyənləşdirmək üçün böyüyün pedaqoji mövqeyini düzgün

müəyyənləşdirmək vacibdir. Pedaqoqun əsas vəzifəsi uşaqlarda sabit zehni fəallığı inkişaf etdirməkdir ( 3, s.136).

Professor Şəhla Əliyevanın dediklərinə istinadən demək olar ki, səriştəli peşəkar tərbiyəçi hər zaman uşaqlarını öyrənmə prosesinə necə cəlb edəcəyini yaxşı bilir və bu zaman o, müxtəlif interaktiv üsullardan istifadə edir, əyləncəli məşğələ fəaliyyətlərini məşğələ planına daxil edərək uşaqların öyrənmə motivasiyasını artırır, onlara yaradıcılıq və təxəyüllərində istifadə etmək imkanı yaradır. Tərbiyəçi-müəllimin təlim taktikalarından istifadə uşaqları məşğələyə daha yaxşı cəlb edir və passiv öyrənmə prosesini aktiv öyrənmə prosesi ilə əvəz edir.

Qeyd etdiklərimizin hər birini ümumiləşdirib əməl edərək həyata keçirildiyi zaman artıq müasir tələblərə cavab verə bilən öyrənmə mühiti formalaşdırmağa və əsas element olaraq öyrənmənin və digər elementlərin də bunun vasitəsi ilə reallaşmasına gətirib çıxara bilər. Onu da qeyd edək ki, öyrənmə prosesi həm skafoldinq şəklində, həm də diferensial formada həyata keçirilə bilər. Diferensial öyrənmə forması skafoldinqin tərkib hissəsini təşkil edir. Çünki skafoldinq diferensialdan daha geniş anlayış olub, yalnız təhsil müəssisələrində deyil, hər yerdə, məsələn, evdə, təbiətdə, müxtəlif ərazilərdə və. s ola bilər. Yalnız burda əsas məsələ odur ki, uşağa öyrədən onu özünə nisbətən daha təcrübəli biri olsun, məsələ, valideyn, bacı, qardaş və s. Diferensial öyrənmə zamanı isə təlim prosesi eyni mühitdə, fərqli öyrənmə marağı, öyrənmə tərzi və bilik səviyyəsi olan uşaqlarla həyata keçirilir. Yəni kollektiv arasında hər bir uşağa fərdi yanaşaraq onların öyrənmə marağı, öyrənmə tərzi nəzərə alınaraq məşğələ prosesini onlara uyğun qurmaq və bunu nəticəsində də təlimin bərabər imkanlar prinsipini gözləmək nəzərdə tutulur. Bir sözlə, hər bir uşaq informasiyanı müxtəlif tərzdə, müxtəlif yollarla qəbul edir. Bəzi uşaqlar informasiyanı fərdi şəkildə, bəziləri qrup şəklində daha çox şey öyrənir. Buna görə də tərbiyəçi-müəllim təlim prosesi zamanı uşaqların öyrənmə tərzlərini nəzərə almalıdır. Məktəbəqədər təhsil müəssisələrində öyrənmə tərzinin əsasən 3 növündən istifadə olunub və nəzərə alınmalıdır: 1) Vizual öyrənmə (görərək), 2) Audial öyrənmə (eşidərək), 3) Kinestetik öyrənmə ( toxunaraq)

Vizual öyrənənlər yeni informasiyaları əldə etmək və anlamaq üçün əsasən şəkillərdən istifadə etməyə üstünlük verir. Məkana bələdləşmə onlarda daha yaxşı inkişaf edir və əsasən rəngli vasitələrdən, şəkilləri olan kartlardan istifadə etməyi, təsəvvürlərində vizuallaşdırdıqları cisimlərin şəklini çəkməyi, rəngli yapışqanlı kağızlardan istifadə etməyi və. s üsullardan istifadə etməyə üstünlük verirlər.

Audial öyrənənlər yeni informasiyanı daha çox tərbiyəçinin səsləndirdiyi nitqi ilə, qrup müzakirələri kimi situasiyalarda danışmaq və dinləməklə anlayırlar.

Kinestetik öyrənənlər informasiyanı taktil vasitəsi ilə, toxunaraq daha yaxşı anlayır və praktik şəkildə öyrənirlər. Bu cür uşaqlar adətən rollu oyunlar vasitəsi ilə məlumatı daha yaxşı qəbul edir. Və tərbiyəçi çalışmalıdır ki, onların sərbəst hərəkəti üçün şərait yaratsın.

Verilmiş öyrənmə tərzləri Hovard Qardner tərəfindən araşdırılaraq tərbiyəçi-müəllimin müxtəlif intellekt növlərini əhatə edən strategiyalardan və yaxud bir neçə iş üsulundan kombinə olunmuş şəkildə uyğunlaşdıraraq konkret formaya salmış və uşaqların öyrənmə tərzlərinə uyğun olaraq 8 intellekt növünü qeyd etmişdir.

H.Qardner bir çox hallarda uşaqların təhsil müəssisəsində öyrəndiyi biliklərinin az bir hissəsinin yadda qalması və istifadə edilməməsinin səbəbini öyrənmə prosesində onların individuallığının nəzərə alınmamasında, hər kəsə eyni tərzdə yanaşılmasında görür. İnsanlar hər biri fərqlidir və buna görə də təlim prosesində uşaqların fərqliliyini nəzərə alaraq informasiyanın müxtəlif tərzdə ötürülməsi daha səmərəli öyrənmənin həyata keçməsinə şərait yaradır.

Hovard Qardner qeyd edir ki, ilk öncə, uşaqların öyrənmə maraqlarını müəyyən etmək, daha sonra isə buna müvafiq fəaliyyət seçərək informasiyanın ötürülməsi prosesini həyata keçirmək vacib amildir. Buna görə də intellektin növlərini və hər növə məxsus xarakterik xüsusiyyətləri bilmək tərbiyəçilər, müəllimlər, pedaqoqlar, uşaqlar və bir sözlə, bütün təhsil işçiləri üçün əhəmiyyətli ola bilər. Hətta uşaqların öz intellekti haqqında məlumata sahib olması özünü tanımağa imkan yaradır və onun metakoqnitiv bacarıqlarının inkişafına şərait yaradır. Bu da uşaqlarda sərbəst öyrənmə qabiliyyətini (öyrənməyi öyrənmək kompetensiyası) inkişaf etdirir.

Eyni zamanda H. Qardner qeyd edir ki, insan intellektinin dəqiq formada sayını müəyyən edə biləcək universal bir siyahı yoxdur. İnsan zəkası olduqca rəngarəng və müxtəlifdir. Tərbiyəçi məşğələdə olan hər uşağın zəka növünü müəyyənləşdirməli, dərk etmə və onların öyrənməsini təmin etmək üçün müxtəlif strategiya və üsullardan istifadə etməlidir. Lakin bu o demək deyil ki, hər məşğələ uşaqların hər birinin intellektinə müvafiq ayrıca fəaliyyət seçilməlidir. Tərbiyəçinin fərqli intellekt növlərini əhatə edən strategiyalardan və yaxud bir neçə iş üsulundan kombinə olunmuş surətdə istifadəsi məşğələ prosesini daha səmərəli edir.

H. Qardner uşaqların intellekt tərzlərini aşağıdakı kimi vermişdir:1) Verbal (linqvistik) qabiliyyət. 2) Məntiqi (riyazi) qabiliyyət. 3) Məkan-vizual qabiliyyət. 4) bədən-kinestetik qabiliyyət. 5) Musiqi-ritmli qabiliyyət. 6) Şəxslərarası qabiliyyət. 7) Fərddaxili qabiliyyət. 8) Naturalistik qabiliyyət (3, s. 45).

1.Verbal (linqvistik) qabiliyyət – uşaqlar çoxlu suallar verir, danışmağı xoşlayır, dilin qrammatik, sintaktik, fonetik qaydalarına əməl edir, lüğəti zəngindir, asanlıqla yeni dil öyrənə bilmə bacarığına malik olurlar.

2.Məntiqi (riyazi) qabiliyyət – uşaqlarda səbəb-nəticə əlaqələrinə və digər abstraksiyalara qarşı həssaslıq daxildir. Rəqəmlərlə oynamağı, əşyaları qruplaşdırmağı, ümumiləşdirməyi, toplamağı xoşlayır, təsnifetmə, hesablama və s. onlar üçün daha maraqlıdır.

3.Məkan-vizual qabiliyyət – uşaqlar əsasən şəkillər çəkməyi, əyani vasitələrdən istifadə etməyi xoşlayır. Onlar üçün səyahət etdiyi yerləri təsəvvürlərində vizuallaşdırmaq daha maraqlıdır.

4.Bədən-kinestetik qabiliyyət – uşaqlar daha çox fikirlərini jestlər vasitəsilə çatdırırlar. Hərəkət etməyi, toxunaraq öyrənməyi xoşlayırlar.

5. Musiqi-ritmli qabiliyyət – uşaqlar səslərə qarşı həssas olurlar, səsləri bir-birindən ayırmağı bacarırlar, musiqi nəğmələrini xoşlayırlar.

6. Şəxslərarası qabiliyyət – uşaqlar qrup şəklində işləməyi xoşlayır, başqalarının fikrinə hörmət edir, həm məsləhət ala bilən, həm də məsləhətçi rolunda çıxış edə bilir.

7. Fərddaxili qabiliyyət – uşaqlar özlərinə aid olan özünəməxsus xüsusiyyətləri bilir, əsasən təklikdə işləməyi xoşlayır, özünə inanır və öz üzərində çalışmağı xoşlayır.

8. Naturalistik qabiliyyət – uşaqlar bitki və heyvanlar aləmini tanıyır, təbiəti sevir.

Və artıq söyləyə bilərik ki, öyrənmə bir fenomen kimi böyüklər və uşaqlar arasında münasibətlərin real praktikasında həmişə mövcud olub və mövcuddur. Onun məqsədi uşağın reallığa uyğunlaşmasını təmin etmək, onu müxtəlif həyat şəraiti və situasiyalarında istiqamətləndirmək və onu işə hazırlamaqdır.

Beləliklə, öyrənmə prosesinin məqsədlərini aşağıdakı kimi qeyd edə bilərik :

- uşaqların öyrənmə və idrak fəaliyyətinin stimullaşdırılması;
- koqnitiv ehtiyacların formalaşması;
- ilkin bilik, bacarıq və vərdişlərin mənimsənilməsində uşaqların idrak fəaliyyətinin təşkili;
- uşaqların idrak və yaradıcılıq qabiliyyətlərinin inkişafı;
- sonrakı özünütəhsil və yaradıcılıq fəaliyyəti üçün öyrənmə bacarıqlarının formalaşdırılması;
- dünyagörüşünün formalaşdırılması və mənəvi-estetik mədəniyyətin tərbiyəsi.

Beləliklə, nəticəyə gəlirik ki, məktəbəqədər təhsil müəssisələrində təlim fəaliyyətinin reallaşması və inkişaf etməsi üçün onun elementlərinin hər birini ayrı-ayrılıqda nəzərdən keçirib, bir-birilə vəhdətdə real həyat bacarıqlarına, yeni əsrin tələbələrinə uyğun, uşaqlarda gələcək həyatına lazım olacaq bilik, bacarıq və vərdişlərin formalaşdırılmasına uyğun planlaşdırmaq lazımdır. Və qeyd etdik o, bu elementlər içərisində ən əsaslarından biri öyrənmə elementidir. Öyrənmə prosesinin düzgün qurulması isə demokratik üsluba uyğun olub, aktiv şəkildə tərbiyəçi ilə bərabər uşaqların da təlimə qoşulub, obyekt yox, subyekt rolunda çıxış edərək uşaqlar arasında qarşılıqlı əlaqə və fəaliyyət üzərində qurulan təlimin baş tutmasıdır.

Bu zaman isə uşaqların öyrənmə marağı, öyrənmə tərzləri nəzərə alınıb, kollektiv daxilində hər bir uşağın fərdi xüsusiyyətləri nəzərə alınaraq həm gündəlik, həm də illik planlaşdırılma zamanı nəzərə alınmalıdır. Amma bu demək deyil ki, bir uşaq fərdi işləməyi sevirsə, hər məşğələ zamanı yalnız o fərdi iş formasından olmalıdır və yaxud bir uşaq audial öyrənmə tərzinə uyğundursa, yalnız ona uyğun məşğələ planlaşdırılmalıdır. Yəni məşğələ zamanı hamının istəyi,

marağı, öyrənmə tərzi nəzərə alınaraq təlimin bərabər imkanları prinsipinə əməl olunmalıdır.

**Problemin aktuallığı:** Məktəbəqədər təhsil müəssisələrində təlim fəaliyyəti elementlərinin inkişaf olunması üçün məşğələ prosesində tərbiyəçi-müəllimin təlimə diferensial yanaşıb öyrənmə prosesini həyata keçirməsi böyük əhəmiyyət daşıyır. Belə ki, təlimin inkişafının yollarından biri də budur.

**Problemin elmi yeniliyi:** Təlim fəaliyyətinin həyata keçirilməsi hər bir elementi ayrı-ayrılıqda nəzərə alınaraq, ona uyğun təşkil olunmağı məqsədə uyğundur.

**Problemin praktik əhəmiyyəti:** Təlim fəaliyyəti zamanı uşaqların fərdi xüsusiyyətləri nəzərə alınması tərbiyəçi-müəllimə məşğələnin səmərəli qurulmasına yardım edəcəkdir.

**Ədəbiyyat:**


1. Həsənova P. Məktəbəqədər təhsil müəssisələrində öyrənmə idrak fəaliyyəti. -Bakı, 2019.
2. Paşayev, Ə. Pedaqogika. / Ə. Paşayev, F. Rüstəmov. -Bakı, 2017.
3. Əliyeva, Ş. Məktəbəqədər pedaqogika. -Bakı, 2015.
4. Gardner, H. Zihin çerçeveleri. -İstanbul, 2022.


**E-mail**: taghizadesevda25@gmail.com

**Rəyçilər**: *ped.ü.fəls.dok.* **L.A. Məmmədli,**
*ped.ü.fəls.dok.* **N.R. İsmayılova**
**Redaksiyaya daxil olub**: 06.03.2023.

*UOT 372.3/.4*

***Xəyalə Arif qızı Məmmədova***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi*

# İBTİDAİ SİNİF ŞAGİRDLƏRİNİN DÜNYAGÖRÜŞÜNÜN FORMALAŞMASINDA MÜƏLLİMİN ROLU

***Хаяла Ариф гызы Мамедова***
*доктор философии по педагогике*
*преподаватель Азербайджанского Государственного Педагогического Университета*

# РОЛЬ УЧИТЕЛЯ В ФОРМИРОВАНИИ МИРОВОЗЗРЕНИЯ УЧАЩИХСЯ НАЧАЛЬНЫХ КЛАССОВ

***Khayala Arif Mammadova***
*doctor of philosophy in pedagogy*
*lecturer at Azerbaijan State Pedagogical University*

# THE ROLE OF THE TEACHER IN FORMING THE WORLD VIEW OF PRIMARY SCHOOL STUDENTS

**Xülasə.** Məqalədə ibtidai sinif şagirdlərinin elmi və gündəlik dünyagörüşünün formalaşmasında müəllimin rolunun funksionallığı tədqiq edilmişdir. Dünyagörüşü vahid psixoloji formalaşma prosesi olub, mürəkkəb və çoxşaxəli struktura malikdir. İbtidai sinif şagirdlərinin ətraf aləmin qanunlarını və rasionallığını dərk etməsi, bu dünyada öz mövqeyini tapması kimi nüanslar dünyagörüşünün inkişafını göstərir.

İbtidai sinif şagirdlərinin dünyagörüşünün tamlığı, məqsədin dərk edilməsini və mütləq təlimatların baxışını nəzərdə tutur.

***Açar sözlər:*** *ibtidai sinif şagirdləri, dünyagörüşü, ibtidai sinif müəllimi, həyati bacarıqlar, fənlərin tədrisi*

**Резюме.** В статье изучен функциональность роли учителя в формировании научного и бытового мировоззрения учащихся начальных классов. Мировоззрение представляет собой единый психологический процесс формирования и имеет сложную и многогранную структуру. Такие нюансы, как понимание законов и рациональности окружающего мира и нахождение собственного положения в этом мире, показывают развитие мировоззрения.

***Ключевые слова:*** *учащиеся начальных классов, мировоззрение, учитель начальных классов, жизненные навыки, преподавание предметов*

**Summary.** In this article, studies the functionality of the teacher's role in the formation of the scientific and everyday outlook of elementary school students. Outlook is a single psychological process of formation and has a complex and multifaceted structure. Such nuances as understanding the laws and rationality of the surrounding world and finding one's own position in this world show the development of the mental outlook.

The completeness of the worldview of younger students implies an understanding of the goal and a vision of absolute instructions.

***Key words:*** *primary school students, outlook, primary school teacher, life skills, school subjects*

“Dünyagörüşü” anlayışının mənası “Dünyaya baxış” terminidir ki, bu da XVIII əsrin sonlarında yaranıb və alman filosofları tərəfindən istifadə edilmişdir.

Pedaqogikada dünyagörüşü insan şüurunun xarakterik forması kimi təqdim edilir ki, bu da onun bilikləri, baxışları, inancları, idealları sistemini özündə cəmləşdirir. Bu da həyatın

müxtəlif sahələrində şagirdlərin təbiətə və cəmiyyətə münasibətini ifadə edir, onun sosial və mənəvi-estetik mövqelərini, davranışlarını müəyyən edir.

Tədqiqatlara əsasən qeyd edə bilərik ki, ibtidai sinif şagirdləri arasında dünyagörüşünün tamlığının, analitik təfəkkür qabiliyyətinin olmaması və əsasən internetdən alınan məlumatlarla məhdudlaşan bilik mozaikası kimi əlamətlər mövcuddur.

Dünyagörüşünün məzmunundan və onun elmi biliklərlə əlaqəsindən, bəşəriyyətin inkişaf tarixində asılı olaraq dünyagörüşünün əsas məqamlarını aşağıdakı kimi qruplaşdırmaq olar:

• mifoloji – təbiət hadisələri haqqında elmi biliklərin olmaması səbəbindən insanların dünya haqqında mövcud olmayan təsəvvürləri;

• dini – müxtəlif dinlər baxımından həyat və dünyanın mənşəyi haqqında təsəvvürlər; Allahın varlığına, ruhun ölməzliyinə inanmaq və s.;

• adi (gündəlik) – mənəvi təcrübə, bir insanın dünya haqqında kortəbii və həmişə təsnif olmayan fikirləri;

• elmi – təbii və sosial hadisələrin inkişafını izah edən səbəb-nəticə əlaqələrinin dərk edilməsi. Elmi dünyagörüşü obyektiv cəhətdən düzgündür, çünki əslində müxtəlif elmlər dünyagörüşünün və inanclarının inkişafı mənbəyi kimi xidmət edir.

Kiçikyaşlı məktəblilərdə ilkin olaraq, adi və elmi dünyagörüşünün formalaşdırılması həyata keçirilir. Daha sonra bu proses mürəkkəbləşərək dini və mifoloji günyagörüşünün inkişafına təkan verir. Hər bir dövr, öz dəyər istiqamətlərinə uyğun olaraq, dünyanın mənzərəsi ilə əlaqəli özünəməxsus dünyagörüşü tipini daşıyır və paradiqmanı müəyyənləşdirir. İbtidai sinif şagirdlərinin dünyagörüşünün formalaşmasında əsas amil müəllim hesab olunur. Bu sistemdə müəllimin dünyagörüşü müəyyən dəyər istiqamətlərinə malik olduğu üçün kiçik məktəblilərin dünya haqqında bilik əldə etmələrinə o istiqamətdən yanaşır.

İbtidai sinif müəllimləri dərs zamanı verdikləri elmi biliklərlə yanaşı, dünyagörüşünün inkişafına təkan verən mühitin yaradılmasına da istiqamətlənməlidir.

Bildiyimiz kimi, qəbul olunan biliyin həqiqəti üçün mütləq meyar olmasa (yəni öyrəndiyi biliyin harada tətbiq olunmasını bilməsə), bilik, ümumiyyətlə, öz mənasını itirir, ibtidai sinif şagirdlərinin öyrənməyə marağı zəifləyir, onların təlim fəaliyyəti aşağı düşür. Bu da nəinki, dünyagörüşünün inkişafını artırır, hətta akademik biliklərin mənimsənilməsini zəiflədir.

İbtidai siniflərdə tədris olunan bütün fənlər (Azərbaycan dili, riyaziyyat, həyat bilgisi, musiqi, texnologiya, informatika, xarici dili, fiziki tərbiyə, təsviri fəaliyyət) şagirdlərin həm akademik biliklər, həm də dünyagörüşünə yiyələnmə funksiyası daşıyır. Məsələn, Həyat bilgisi fənninin tədrisi zamanı kiçikyaşlı məktəblilərdə ətraf aləmin hadisələrinin bütövlüyü və qanunauyğunluğu, onun qanunlarının sabitliyi haqqında yeni düşüncə və anlayışın inkişafına təmin olunur, bunun sayəsində ətraf aləmdəki hadisələrin və tarazlığın qarşılıqlı əlaqəsi təmin edilir. Bu, ibtidai sinif şagirdlərində ətrafdakı reallıqda yerini, fəaliyyətinin mənasını sistematik şəkildə dərk etməyə əsas verir.

İbtidai sinif müəllimi tədris etdiyi fənnin məzmununa yaradıcılıqla yanaşaraq, təhsilin məzmununun tədris olunan elmin məzmunundan nəinki fərqlənə biləcəyini, həm də fərqlənməli olduğunu nəzərə alaraq vahid dünyagörüşünün inkişafına töhfə verə bilər. Müəllim təhsilin məzmununu formalaşdırarkən elmi məzmunu seçir və onu uşaqların yaş və psixoloji xüsusiyyətlərinə uyğun olaraq pedaqogika qanunlarına uyğun qurur.

İbtidai sinif şagirdlərinin dünyagörüşünün bütövlüyünü pozan bir sıra nəzəriyyələr vardır. Bunların əsasında ətraf aləmdəki hadisələrin təsadüfi olması haqqında biliklərin olmasıdır. Bu zaman dərs prosesində bu biliklər şagirdlərin müstəqil fəaliyyətə cəlb olunmasının qarşısını alır.

Biliyin populyarlaşması prosesində hadisələrin naməlum mexanizmi haqqında ifadə tez-tez yox olur və riyazi təsviri qanun kimi təqdim edilən hadisə təsadüfi kimi tanınır. Elmin getdikcə daha tez-tez müraciət etdiyi ehtimal modelləri qavrayışın bütövlüyünü pozur, çünki kiçikyaşlı məktəblilər tərəfindən qəbul olunan biliklərin məqsəd və istifadə sahəsini lazımi şəkildə şərh edilmir. Bu da onu göstərir ki, ibtidai sinif şagirdləri əldə etdikləri biliklərin məqsəd və istifadə sahəsini anlamadan dünyagörüşünün formalaşmasına çata bilməz.

Təhsilin məzmunu ətraf aləmin ən ümumi qanunlarına və sabitliyi ilə seçilən hadisələrə yönəldildikdə, öyrənmə prosesində vahid təbii-elmi dünyagörüşü formalaşır. Məsələn, Riyaziyyat fənnində əldə edilən biliklər şagirdlər tərəfindən həyati təcrübədə tətbiq edildiyi zaman dünyagörüşünün inkişafına təkan vermiş olur.

Həyat bilgisi fənni tədris olunan zaman ibtidai sinif şagirdləri aşağıdakı elmi əlaqələri öyrənirlər:

1) təbiətdə fəsillərin dəyişməsini;
2) hər fəslin öz əlamətlərinin olduğunu;
3) mövsümi dəyişikliklərin olmasını;
4) günəş və küləyə münasibətdə ərazinin mövqeyindən asılı olan temperaturun dəyişməsini və s. [8]

Bildiyimiz kimi, tədris prosesinə müasir yanaşma şəraitində ibtidai sinif şagirdlərinin intellektual inkişafının əsas məqsədi – yaradıcı düşünən şəxsiyyətin formalaşdırılmasıdır. Buna görə də ibtidai sinif şagirdlərinin intellektual inkişafının istiqamətləndirici amilləri aşağıdakılardır:

a) ətraf mühit;
b) kütləvi informasiya vasitələri;
c) elm və texnikanın ən son nailiyyətləri;
ç) müxtəlif sənət növlərinin inkişafı.

**Problemin praktik əhəmiyyəti.** Aparılan müşahidə və tədqiqatlara əsasən ibtidai sinif müəllim şagirdlərində dünyagörüşünü formalaşdırmaq üçün onları tədqiqat fəaliyyətinə hazırlamaqla sürətlə dəyişən həyatda olan informasiyaları müstəqil mənimsəməyə imkan yaradır.

İbtidai sinif şagirdləri üçün dünyagörüşünü formalaşdırmaq mənbələrinə baxdıqda aşağıdakı kimi qruplaşdıra bilərik:

1) Məktəb mühiti (sinif yoldaşları, müəllim və s.);
2) Dərsliklər (vəsaitlər);
3) Ailə üzvləri;
4) Cizgi filmləri (animasiyalar);
5) Dərnəklər (musiqi, idman və s.)
6) Ətraf mühit və s. [6]

Bu qeyd edilənlərdən aydın görünür ki, bu mənbələrin çoxunda şagird özü müstəqil olaraq dünyagörüşünü inkişaf etdirir. Lakin bunun baş verməsi üçün müəllim ibtidai sinifdən şagirdlərdə öyrənməyə, müstəqil tədqiqat aparmağa maraq yaratmalıdır. Belə olduqda şagird qarşılaşdığı hər bir yeni informasiyanı özü üçün dünyagörüşünə çevirə biləcək.

Məktəb mühitində ibtidai sinif şagirdlərinin intellektual mədəniyyətinin (dünyagörüşünün) inkişafının əsas yolları aşağıdakı kimi fərqləndirə bilərik:

1) inkişaf etdirici təhsil prinsipləri əsasında qurulan sistemli təlim prosesi;
2) əqli qabiliyyətlərin inkişafı üçün sinifdənkənar iş. [7]

Əqli qabiliyyətlərin inkişafı ibtidai sinif şagirdlərinin elmi dünyagörüşünün formalaşması ilə bağlıdır. Bu istiqamətdə ibtidai sinif müəlliminin əsas rolu şagirdlərin ideoloji və sosial bacarıqlarının inkişafına şərait yaratmasıdır. İbtidai sinif şagirdləri dünyagörüşünü inkişaf etdirdikcə, nəzəri faktları ümumiləşdirməyi, ideoloji nəticələr çıxarmağı, dünyagörüşü ideyalarının məzmununu müəyyən etməyi, təbiət və sosial hadisələri qiymətləndirməyi, öz mövqeyini müdafiə və mübahisə etməyi, həmsöhbətin əsassız fikirlərini sübut etməyi bacarır.

**Problemin elmi yeniliyi.** Texnologiyanın sürətli inkişafı informasiya artımına və öyrənmə mənbələrinin çoxalmasına səbəb olur. Bu səbəbdən ibtidai sinifdən şagirdlərin texnoloji bacarıqlarının inkişaf etdirilməsi kurikulumda öz əksini tapmışdır. Texniki vasitələrdən (kompüter, planşet, telefon və s.) məqsədli istifadə edərək ibtidai sinif şagirdləri asanlıqla dünyagörüşlərini inkişaf etdirə bilərlər.

**Ədəbiyyat:**

1. Kazımov, N.M. Məktəb pedaqogikası: Dərslik. / N.M. Kazımov -Bakı: Çıraq, -2011. -325 s.
2. Paşayev, Ə. Pedaqogika: Dərslik. / Ə. Paşayev, F. Rüstəmov. -Bakı: Nurlan, -2007.- 464 s.
3. Qasımova, L. Pedaqogika: Dərslik. / L. Qasımova, R. Mahmudova -Bakı: Çaşıoğlu, -2012. -220 s.
4. Əhmədov, H. Pedaqogika: Dərslik. / H. Əhmədov, N. Zeynalova. -Bakı: Elm və təhsil, -2016. -321 s.
5. https://m-eng.ru/az/avtonomnaya-kanalizaciya/vidy-mirovozzrenii-i-ih-opisanie-mirovozzrenie-i-ego.html
6. https://www.sagepub.com/sites/default/files/upm-assets/44226_book_item_44226.pdf
7. https://www.bartleby.com/essay/Worldviews-In-The-Classroom-FCRCMK2GVWM
8. https://truropreschool.org/2017/05/shaping-your-childs-worldview/

**E-mail:** xayalamamedova@gmail.com
**Rəyçilər:** *ped.ü.fəls.dok.* **İ.B. Əmirəliyeva,**
*ped.ü.fəls.dok.* **X.A. Həmidova**

# *MƏKTƏB VƏ PEDAQOJİ FİKİR TARİXİ*
# *ИСТОРИЯ ШКОЛЫ И ПЕДАГОГИЧЕСКОЙ МЫСЛИ*
# *HISTORY OF SCHOOL AND PEDAGOGICAL THOUGHT*

*UOT 37.0*

***Tofiq Əliağa oğlu İsgəndərov***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Cəlilabad filialının baş müəllimi*

## AZƏRBAYCANDA MAARİFÇİLİYİN İNKİŞAFI VƏ BU SAHƏDƏ "ƏKİNÇİ"NİN ROLU

***Тофик Алиага оглы Искендеров***
*старший преподаватель Джалилабадского филиала*
*Азербайджанского Государственного Педагогического Университета*

## РАЗВИТИЕ ПРОСВЕЩЕНИЯ В АЗЕРБАЙДЖАНЕ И РОЛЬ "ЭКИНЧИ" В ЭТОЙ СФЕРЕ

***Tofig Aliagha Iskandarov***
*head teacher of Jalilabad branch of Azerbaijan State Pedagogical University*

## DEVELOPMENT OF EDUCATION IN AZERBAIJAN AND THE ROLE OF "EKİNCHİ" IN THIS AREA

**Xülasə.** Azərbaycan maarifçi realizminin təşəkkül mərhələsi XIX əsrin əvvəllərindən 30-cu illərin sonuna qədərki dövrü əhatə edir. Abbasqulu ağa Bakıxanov, Mirzə Şəfi Vazeh, İsmayıl bəy Qutqaşınlı, daha sonra Qasım bəy Zakir, Baba bəy Şakir, Mirzə Baxış Nadim və b. bu dövrün görkəmli nümayəndələridir.

Mirzə Fətəli Axundovun yaradıcılığı 40-60-cı illər maarifçilik hərəkatında xüsusi əhəmiyyətə malikdir. Onun yaradıcılığında Azərbaycan maarifçiliyi realist ənənələrlə daha da mükəmməlləşərək bir məktəb oldu. Realist dramaturgiyanın, realist nəsrin bünövrəsi qoyuldu. Mirzə Fətəli Axundovun yaradıcılıq ənənələrindən bəhrələnən Azərbaycan maarifçi realizmi əsrin 70-ci illərində yeni bir mərhələyə qədəm qoyaraq inkişafının ən yüksək zirvəsinə çatdı. Həsən bəy Zərdabi, Əsgər ağa Adıgözəlov (Gorani), Nəcəf bəy Vəzirov, Seyid Əzim Şirvani və b. bu dövrün görkəmli nümayəndələridir. Bütün maarifpərvər qüvvələr məhz H. Zərdabi və onun nəşr etdiyi "Əkinçi" qəzetinin ətrafına toplanırdı.

***Açar sözlər:*** *Maarifçi-realist ədəbiyyat, milli teatr, milli mətbuat, satirik cərəyan, realist dramaturgiya, Azərbaycan ziyalılar ordusu*

**Резюме.** Стадия формирования азербайджанского просвещенного реализма охватывает период с начала 19 века до конца 30-х годов. Аббасгулу Ага Бакиханов, Мирза Шафи Вазех, Исмаил бек Гутгашинли, позже Гасым бек Закир, Баба бек Шакир, Мирза Бахиш Надим и другие являются яркими представителями этой эпохи. Творчество Мирзы Фатали Ахундова имеет особое значение в просветительском движении 40-х и 60-х годов. В его творчестве азербайджанское просвещение стало школой, все более совершенствуясь с реалистическими традициями. Были заложены основы реалистической драмы и реалистической прозы. Воспитывая творческие традиции Мирзы Фатали Ахундова, просвещенный реализм Азербайджана в 70-х годах века вышел на новый этап и достиг наивысшей вершины своего развития. Гасан бек Зардаби, Аскер ага Адыгозалов (Горани), Наджаф бек Вазиров, Сайид Азим Ширвани и другие также прославляют данную эпоху. Вокруг Г. Зардаби и издаваемой им газеты «Экинчи» собирались все просвещенные силы.

***Ключевые слова:*** *просветительско-реалистическая литература, национальный театр, национальная пресса, сатирическое течение, реалистическая драматургия, армия интеллигенции Азербайджана*

**Summary.** The formation stage of Azerbaijani enlightened realism covers the period from the beginning of the 19th century to the end of the 30s.. Abbasgulu Agha Bakikhanov, Mirza Shafi Vazeh, Ismayil Bey Gutgashinli, later Gasim Bey Zair, Baba Bey Shakir, Mirza Bakhish Nadim and others are prominent representatives of this era.

The creativity of Mirza Fatali Akhundov is of special importance in the enlightenment movement of the 40s and 60s. Azerbaijani enlightenment is realistic in his work further perfected by traditions. It was a school. Benefiting from the creative traditions of Mirza Fatali Akhundov, the enlightened realism of Azerbaijan entered a new stage in the 70s of the century and reached the highest peak of its development. Hasan Bey Zardabi, Asker Agha Adigozalov, Najaf Bey Vazirov, Sayyid Azim Shirvani and others. prominent representatives of the period. All enlightened forces gathered around Hasan Bey Zardabi and the "Akinchi" newspaper published by him.

***Key words:** Enlightenment-realistic literature, national theater, national press, satirical current, realistic drama, The army of Azerbaijani intellectuals.*

XIX əsr Azərbaycanda bir sıra mühüm ictimai-siyasi və mədəni hadisələrlə yanaşı, həm də maarifçiliyin inkişafı ilə xarakterizə olunur. XVIII əsr ədəbiyyatımızda yaranan realizm ənənələri XIX əsrin əvvəllərində bir tərəfdən satirik cərəyanın, digər tərəfdən isə maarifçi realizmin inkişafına təkan verirdi. Mühüm səciyyəvi xüsusiyyətləri ilə bərabər, XIX əsr ədəbiyyatı məzmunca oxunaqlı və maraqlı məlumatlarla çox zəngin, həm də məhsuldarlığı ilə seçilən bir dövrdür. Bu dövr ədəbi üslubları, bəhs olunan mövzular və janr etibari ilə də çox zəngindir. Məhz XIX əsr Azərbaycan xalqına dünyada tanınmış böyük elm və sənət adamları bəxş etmişdir. Abbasqulu ağa Bakıxanov, professor Mirzə Kazım bəy, İsmayıl bəy Qutqaşınlı, Mirzə Şəfi Vazeh, Mirzə Fətəli Axundov, Həsən bəy Zərdabi (Məlikov), Seyid Əzim Şirvani, Nəcəf bəy Vəzirov, Əbdürrəhim bəy Haqverdiyev kimi böyük maarifçi ziyalılar bu dövrdə yetişmişlər.

Maarifçilər ideal cəmiyyətin qurulmasında ağıla əsaslanmağa üstünlük verirdilər. Onlar inanırdılar ki, insanların əxlaqını saflaşdırmaq və tərbiyə etmək yolu ilə cəmiyyətin ağıllı adamlar tərəfindən idarə olunması və ideal cəmiyyət qurulmasına nail olmaq olar. İlk Azərbaycan maarifçiləri hətta insanı həyatın fəal yaradıcısı hesab edirdilər. Əsrin birinci yarısındakı maarifçilik hərəkatı, xüsusilə Abbasqulu ağa Bakıxanov, İsmayıl bəy Qutqaşınlı və Mirzə Şəfi Vazehin adı ilə bağlıdır. XIX əsrin əvvəlləri həm də realist ədəbi cərəyanın hazırlanması dövrü kimi xarakterizə olunur. .A. Bakıxanov, İ. Qutqaşınlı, M.Ş. Vazeh Q. Zakir və b. yaradıcılığında onun ilk rüşeymləri yaranırdı. Bu ideologiya ədəbiyyatımızda "M.P. Vaqif yaradıcılığı ilə başlanan realizm ənənələrinin dərinləşərək maarifçi səciyyə daşımasına və ədəbi hərəkatın əsas yaradıcılıq metoduna çevrilməsinə faydalı təsir göstərirdi" (8, s. 13). Siyasi dünyagörüşdə materializm və idealizm arasında gedən mübarizə, ədəbiyyat sahəsində də özünü qabaqcıl ideyalarla mürtəce idealist baxışlar arasındakı mübarizədə göstərirdi.

Azərbaycan maarifçi realizmi XIX əsrin əvvəllərindən başlayaraq "Əkinçi" qəzetinin nəşrinə qədər bir sıra mühüm inkişaf mərhələlərindən keçmişdir. "Əkinçi" qəzetinin nəşri milli ədəbi dilimizin və bütövlükdə milli mədəniyyətimizin inkişafında xüsusi əhəmiyyət kəsb edən tarixi hadisə idi.

1828-ci ildə Rusiya və İran dövlətləri (Qacarlar) arasında imzalanmış Türkmənçay sülh müqaviləsinin şərtlərinə görə Şimali Azərbaycanda çar Rusiyası müstəmləkəçilik mövqeyini daha da möhkəmləndirdi. Hər şeydən əvvəl, xalq böyük M. F. Axundovun təbirincə, "qoşunkeşlik və çapqınçılıqdan azad olub asayiş tapdı" (8, s. 11). Rusiyaya inteqrasiyasından sonra Azərbaycanın iqtisadi, siyasi və mədəni həyatında əhəmiyyətli dəyişikliklər baş verdi. Müharibələr və daxili feodal mübahisələri başa çatdıqdan sonra dinc mühitin yaradılması ölkənin mədəni həyatına müsbət təsir göstərdi.

Elə həmin ildən Çar hökuməti rusdilli dövlət məktəblərinin açılması və müxtəlif mətbuat orqanlarının nəşrinə də şərait yaratdı. Rus yazıçısı A.S. Qriboyedovun təşəbbüsü ilə 1828-ci ildən "Tiflisskiye vedomosti" qəzeti nəşr olunmağa başladı. Qəzetin redaktoru P.S. Sankovski təyin edilmişdi. P.S. Sankovski dekabrist yazıçı, demokratik ruhlu bir adam olduğundan qəzet dekabristlər və yerli ziyalıları ətrafında toplayırdı. Ona görə də "Tiflisskiye vedomosti"

bütövlükdə Zaqafqaziya xalqlarının mənafeyinə xidmət etməsi ilə seçilirdi. Daha sonra qəzetə əlavə olaraq, əvvəl farsca, sonra isə azərbaycanca "Tatarskiye vedomosti" nəşr olunurdu. Burda da bütünlüklə Azərbaycan ziyalılarının qüvvəsindən istifadə olunurdu. Beləliklə, P.S. Sankovskinin fəaliyyəti nəticəsində "Tiflisskiye vedomosti" qəzeti Zaqafqaziya xalqlarının mənafeyinə xidmət edən mütərəqqi bir qəzetə çevrilmişdi. Bununla da qəzet Azərbaycan ziyalılarının rus mədəniyyəti ilə tanışlığında mühüm rol oynamışdır.

A. Bakıxanov xalqımızın böyük ədəbi simalarından və ictimai xadimlərindən biridir. Dövrünün tanınmış alimi, mütəfəkkiri, istedadlı şairi və ilk Azərbaycan maarifçiliyinin əsas nümayəndəsi idi. Maarifçi-realist ədəbi cərəyanın yaranması onun adı ilə bağlıdır. Hələ qraf İ.F. Paskeviçin Qafqazın baş hakimi olduğu dövrdə (1827-ci ilin martında çar hökuməti A.P. Yermolovu Qafqazın baş hakimi kimi qraf İ.F. Paskeviçlə əvəz etmişdi) Ərdəbildə rus qoşunlarının əlinə keçən Şərq kitabxanasının tədqiqi ilə məşğul olmuşdur. Çox zəngin və qiymətli materialları olan Ərdəbil kitabxanasındakı Əlyazmalar üzərində işləmiş və Şərq müəlliflərinin yazdığı əsərlərin kataloqunu tərtib etmişdi. O zaman qraf İ. F. Paskeviç Abbasqulu ağa Bakıxanova böyük hörmət və etimad bəslədiyindən kitabxananın tədqiqi işini də yazıçı A.S. Qriboyedovla ona tapşırmışdı. Qraf Paskeviç, həmçinin dövlətlərarası sülh danışıqlarının aparılmasında və digər diplomatik səfərlərdə də Bakıxanova böyük etimad göstərmişdi.

1832-ci ildə Bakıxanov özünün maarifçilik fəaliyyətini davam etdirmək məqsədi ilə məktəb açmağa təşəbbüs edir. Bu barədə hökumətə təqdim etdiyi layihədə məqsədlərini belə izah edir: "Maarifə doğru ilk addım məktəb açmaqdan ibarətdir. Mən də həmvətənlərimin faydası üçün var qüvvəmi bu işə həsr edirəm. Öz nəzarətim altında məktəb təsis etmək haqqında fikir irəli sürməyə cəsarət edirəm" (5, s. 96). Beləliklə, A. Bakıxanov, özünün dediyi kimi, "var qüvvəsi" və potensialı ilə ictimai-siyasi, elmi-mədəni proseslərin mərkəzində idi. Onun bilavasitə iştirakı ilə "Tatarskiye vedomosti" vərəqəsinin 1832-ci ilin yanvarından azərbaycanca nömrəsi çap olunurdu. Maarifçilərin gözəl cəmiyyət yarada bilmək üçün insanların əxlaqını yaxşılaşdırmaqla, onları tərbiyə etmək haqqında fikirləri A. Bakıxanovun "Kitabi-nəsihət", "Gülüstani-İrəm", "Təhzibül-əxlaq" kimi əsərlərində ifadə olunmuşdur.

XIX əsrin I yarısında Azərbaycan ədəbiyyatında təşəkkül tapan ilk maarifçiliyin əsas nümayəndələrindən biri də Mirzə Şəfi Vazehdir. O, Abbasqulu ağa Bakıxanovun müasiri, Mirzə Fətəli Axundovun isə müəllimidir. M.F. Axundovun realist yazıçı və böyük maarifçi kimi yetişməsində onun mühüm rolu olmuşdur. 1840-cı ildə M. F. Axundov Tiflis qəza məktəbində Şərq dilləri üzrə müəllim vəzifəsindən çıxarkən öz yerinə işə müəllimi M.Ş. Vazehi məsləhət görmüşdür. Bununla əlaqədar M. Ş. Vazeh 1840-1846-cı illərdə Tiflisdə yaşamışdır. Beləliklə, Mirzə Şəfi Vazeh imtahan verib Tiflis qəza məktəbində Azərbaycan dili müəllimi işləməyə başlayır. Burada o, həm də fərdi dərs deməklə məşğul olur. Eyni zamanda, dövrün qabaqcıl ziyalıları ilə tanış olur. Hətta 1844-cü ildə "Divani-hikmət" adlı ədəbi məclis də təşkil etmişdir. Bu məclis əvvəlcə Gəncədə təşkil olunmuş, daha sonra isə (1846-cı ilə qədər) Tiflisdə öz fəaliyyətini davam etdirmişdir. Onun tələbələri arasında alman şairi və Şərq dilləri üzrə tərcüməçi Fridrix Martin fon Bodenştedt də var idi. Tiflisdə müəllim işlərkən Mirzə Şəfi Vazeh rus pedaqoqu İvan Qriqoryevlə birlikdə Tiflis gimnaziyası üçün Azərbaycan şeirinin ilk antologiyasını və "Tatar-rus lüğəti"ni tərtib etmişdir. Ədəbi məclisin yığıncaqlarında A. Bakıxanov, M.F. Axundov, İvan Qriqoryev, Mirzə Həsən Vidadi, Mirzə Həsən Ordubadi, İ.A. Slivski, F. Bodenştedt və başqaları iştirak edirdi.

XIX əsrin maarifçiləri sırasında İsmayıl bəy Qutqaşınlının da adı xüsusi qeyd olunmalıdır. İsmayıl bəy Qutqaşınlı Azərbaycan realist nəsrinin inkişafında böyük xidmətlər göstərmiş sənətkarlardandır. Onun "Rəşid bəy və Səadət xanım", yaxud "Şərq hekayəsi" əsəri "Kitabi-Əsgəriyyə"dən sonra ədəbiyyatımızda böyük sensasiya yaradan əsər kimi çox qiymətlidir. Əsərin orijinalı fransızca yazılıb və 1835-ci ildə Varşavada fransız dilində nəşr olunmuşdur. Əsər ilk dəfə iyirminci illərin (XX əsr) əvvəllərində Bakıda Xasay xan Usmiyevin şəxsi kitabxanasından tapılmış və fransız dilindən Azərbaycan dilinə tərcümə edilərək nəşr olunmuşdur. Kitab, İsmayıl bəy Qutqaşınlının Xasay

xana xatirə qeydlərindən göründüyü kimi, Usmiyevə babası Xasay xandan qalmışdır. Mirzə Fətəli Axundovun son səhifədə öz əli ilə yazdığı qeydlərindən görünür ki, M.F. Axundov əsəri orijinaldan oxumuş, onda gələcəyə böyük inam və ruh yüksəkliyi yaratdığını sevinc hissi ilə qeyd etmişdir: “Mən bu gün sizi tamamilə inandıra bilərəm ki, arzularımızın həyata keçirilməsi günü artıq yaxınlaşmışdır. 15 mart 1846. Mirzə Fətəli.”(5,183).

İlk maarifçilərin yaradıcılığında realizmin bünövrəsi qoyulurdu. Qasım bəy Zakirin, daha sonra isə Mirzə Baxış Nadim və Baba bəy Şakirin timsalında maarifçi realistlərin yeni nəsli onu daha da inkişaf etdirdilər. Əsrin ortalarında Azərbaycan maarifçiliyi Mirzə Fətəli Axundovun yaradıcılığında yeni inkişaf mərhələsinə qədəm qoydu. M.F. Axundovun yaradıcılığı XIX əsrin ortalarında formalaşan Azərbaycan maarifçi realizminin parlaq nümunəsidir. Onun ədəbi-tənqidi, ictimai-siyasi və fəlsəfi dünyagörüşünün formalaşmasında qədim yunan, qabaqcıl rus və Qərbi Avropa maarifçiliyinin müsbət təsiri olmuşdur. Dünyagörüşündə maarifçilikdən inqilabi demokratiyayadək ideoloji bir yüksəliş yolu keçmişdir. Müəllimi Mirzə Şəfidən aldığı “dərs”dən başqa fitri istedadı və mütaliəsi sayəsində Qərbi Avropa və rus klassiklərinin əsərlərini rus dilində oxumuşdur. Xalqın elmi dünyagörüşünün inkişafında əlifbanın böyük əhəmiyyətə malik olduğunu bildiyi üçün ərəb qrafikalı Azərbaycan əlifbasında islahat aparılması üçün çalışmışdır. “Aldanmış kəvakib” əsərində məktəbə, elm və maarifə yüksək qiymət verən Yusif Sərracı da ideal hökmdar obrazı kimi yaratmışdır.

M.F. Axundov yaradıcılığı bütün keyfiyyətləri ilə Azərbaycan maarifçi realizminin inkişafında xüsusi bir mərhələdir. Əsərlərində də xalq kütlələrinin azadlığı və tərəqqisinə mane olan ictimai-siyasi nöqsanların tənqidinə əsas yer verirdi. Məhz onun xidmətləri sayəsində əsrin 60-70-ci illərində Azərbaycan maarifçi realistlər ordusu yetişirdi. M.F. Axundovun ədəbiyyata gəlişi ilə ədəbiyyat tariximizdə qəti bir dönüş yarandı. Realizm və maarifçilik ənənələri M.F. Axundovun yaradıcılığında mükəmməl bir yaradıcılıq metodu səviyyəsinə yüksəldi. Bu zamandan başlayaraq, realizm və maarifçilik hərəkatı ardıcıl, şüurlu inkişaf yoluna düşdü.

Mirzə Fətəli Axundovun Azərbaycan mədəniyyəti üçün müəyyən etdiyi ədəbi-estetik inkişaf istiqaməti XIX əsrin ikinci yarısında maarifçi-realist sənətkarların yeni nəslinin meydana çıxmasına, Azərbaycan maarifçiliyinin yeni inkişaf mərhələsinə yüksəlməsinə zəmin yaratdı. Eyni zamanda, qonşu xalqların da ədəbi-mədəni yüksəlişinə xidmət etməsinə səbəb oldu.

Əsrin 70-ci illərindən başlayaraq ədəbiyyata gələn, maarifçi-realistlərin yeni nəsli M.F. Axundov ənənələrinin davamçıları Nəcəf bəy Vəzirov, Vasaq Mədətov, Əsgər ağa Gorani, Əbdürrəhim bəy Haqverdiyev, Həsən bəy Zərdabi və b. timsalında realizm məktəbi özünün ən yüksək inkişaf səviyyəsinə qalxdı. Lirik, epik və dramatik növlərin müxtəlif janrlarında satira yaradıcılığı da yeni inkişaf mərhələsinə qədəm qoydu.

Beləliklə, Azərbaycan maarifçi-realist ədəbiyyatı öz inkişafında klassik Azərbaycan poeziyası, Azərbaycan şifahi xalq ədəbiyyatı və XIX əsr rus realistlərinin qabaqcıl ənənələrindən qidalanaraq, yeni tarixi şəraitdə və milli zəmində inkişaf edirdi. Xüsusən, təbiətşünas alim H. Zərdabinin (1837-1907) nəşr etdiyi "Əkinçi" qəzeti (1875-1877) bu dövrdə ədəbi-mədəni həyatın coşqun inkişafına təkan verirdi. Burada özünə yer tapan bir sıra ədəbi-ictimai müzakirə və mübahisələr Azərbaycan ədəbiyyatında humanist ənənələrin daha da möhkəmlənməsinə və inkişaf etməsinə yardım göstərirdi.

Həsən bəy Zərdabi XIX əsrin II yarısında yetişən görkəmli maarifçi, birinci jurnalist, həm də böyük fədai idi. O, Azərbaycan xalq məişətini bütün incəliklərinə qədər bilən bir maarifçi idi. Gənc nəslin düzgün tərbiyə edilməsi, onların vətənpərvər və xalq ruhunda tərbiyə olunması, azadlıq və maarifçilik hərəkatının fəal mübarizləri kimi yetişməsinə bütün qüvvə və bacarığını sərf edirdi. Hələ Bakıda təbiət elmləri üzrə müəllim işlədiyi dövrdə azərbaycanlı uşaqları məktəbə cəlb etmək üçün təbliğat aparırdı.1872-ci ildə Bakıda ilk dəfə “Cəmiyyəti-xeyriyyə” də təşkil etmişdi. Nəcəf bəy Vəzirov və Əsgər ağa Adıgözəlov (Gorani) ilə birlikdə Azərbaycanın şəhər və kəndlərini gəzərək xeyriyyə cəmiyyətinə üzv yazırdılar. Yorulmaz və qayğıkeş fəaliyyətinə görə müasirləri onu fəxrlə “Zaqafqaziya müsəlman ziyalılarının müəllimi və mənəvi ata-

sı adlandırırdılar”. Onun səy və əzmkarlığı sayəsində 10 mart 1873-cü ildə M.F. Axundovun ”Sərgüzəşti vəziri xani Lənkəran” əsəri ilə Azərbaycan Milli teatrının bünövrəsi qoyuldu. Ardınca “Hacı Qara”, “Xırs quldurbasan” və daha başqa əsərlər tamaşaya qoyuldu. Bu işdə Həsən bəy Zərdabi ilə birlikdə Azərbaycan ziyalılarından Nəcəf bəy Vəzirov, Əsgər ağa Adıgözəlov (Gorani) də yaxından iştirak edirdilər.

Beləliklə, fransız səyyahı Şardenin “Şərqin operası” adlandırdığı (XVII əsrin sonları) xalq tamaşalarından sonra, XIX yüz ildə M. F. Axundov komediyalarının Bakıda müvəffəqiyyətlə tamaşaya qoyulması maarifçilik ənənələrinin daha geniş vüsət almasına şərait yaradırdı. Bakıdan sonra Şuşa, Naxçıvan, Tiflis (1876-cı il) və b. şəhərlərdə də M.F. Axundovun komediyaları tamaşaya qoyulurdu. Belə bir zamanda da teatr binası zərurəti meydana gəldi və ”millət atası” xeyriyyəçi Hacı Zeynalabdin Tağıyevin köməkliyi ilə Bakıda ilk teatr binası tikildi.

Sözsüz ki, xalqın maariflənməsi yolunda atılan hər bir mütərəqqi addım mövcud ictimai-siyasi şərait üçün çox qiymətli idi. Lakin Həsən bəy Zərdabi xalqın dünyagörüşünün dəyişməsi və inkişafına daha geniş imkanlar aça bilən, daha mükəmməl təbliğat vasitələri axtarırdı. Çünki Zərdabi zəhmətkeş xalqın mənafeyinə, onun hərtərəfli inkişafı və mübarizəsinə xidmət edə biləcək mətbuatın tərəfdarı idi. Nəhayət, Həsən bəy Zərdabinin ardıcıl və yorulmaz fəaliyyətinin nəticəsi olaraq, xalq mənafeyinə uyğun və maarifpərvər bir mətbuat orqanı tarixi zərurətdən meydana gəldi. 1875-ci il iyulun 22-də Bakıda ana dilində ilk qəzetin – “Əkinçi” (1875-1877) qəzetinin nəşrə başlaması ilə Azərbaycanda əsl demokratik və milli dəyərlərə söykənən “mətbuat erası” başlandı. Həsən bəy Zərdabinin çox gərgin əməyi sayəsində “Əkinçi” xalqın arzu və istəklərindən doğan bir mətbuat orqanı oldu. Özünün xarakterizə edərək “pul yox, çapçı yoldaş yox, kitabxana yox, hürufat yox” – deyə səciyyələndirdiyi çətinliklərdən ona yalnız Vətən eşqi, xalq məhəbbəti güc verdi. İki illik fəaliyyəti nəticəsində “Əkinçi” Azərbaycanda əsl dünyəvi mətbuatın əsasını qoydu. Qəzetin nəşri elə bir tarixi əhəmiyyət kəsb edən hadisəyə çevrildi ki, XIX əsrdə və XX əsrin əvvəllərində “Molla Nəsrəddin” jurnalının nəşrinəqədərki mətbuat orqanlarının heç biri onun səviyyəsinə yüksələ bilmədi.

Həsən bəy Zərdabi “Əkinçi” qəzetinin nəşrinə nail oluncaya qədər çox böyük maneələrlə üzləşmişdi. Hər şeydən əvvəl, “çarizm Azərbaycan maarifçilərinin bütün mütərəqqi təşəbbüsləri kimi, milli mətbuat yaratmaq cəhdini də boğurdu” (4, s. 4). Ona görə də qəzetin nəşrinə 12 aprel 1873-cü ildən 5 oktyabr 1874-cü ilə qədər Bakı və Tiflis dəftərxanaları arasında keçən 1 il 6 ay ərzində uzun süründürmələrdən sonra icazə ala bilmişdi. Böyük sənətkar və ictimai xadim bu yolda çəkdiyi əziyyətlərdən və məhrumiyyətlərdən bəhs edərək “Rusiyada əvvəlinci Azərbaycan qəzeti” adlı məqaləsində yazırdı: ”Hər kəsi çağırıram, gəlməyir, göstərirəm, görməyir. Deyirəm, qanmayır. Axırda gördüm ki, onları haraylayıb çağırmaqdan, onlara deməkdən başqa bir qeyri əlac yoxdur. Olmaz ki, mənim sözümü eşidənlərdən heç bir qanan olmasın”.

Yenə də qəzet səhifələrindən birində yana-yana yazırdı: “Ey bizə diqqət edənlər, bu qəzetin kəsrini görəndə (çünki qəzet çox böyük maddi və mənəvi problemlərlə üzləşirdi - T. İsgəndərov) gülməyin. Gülmək yeri deyil. Siz ağlayın ki, bizim müsəlmanların bircə qəzeti də basdırmağa (nəşr etməyə - T. İsgəndərov) adamı yoxdur” (8, s. 93).

Əsrin II yarısında S.Ə. Şirvaninin realist şeir yaradıcılığı sahəsinə keçməsində “Əkinçi” və “Kəşkül” qəzetlərinin mühüm rolu olmuşdur . Mədəniyyətə və maarifə həsr etdiyi şeirləri və yazıları ilə mətbuatda tez-tez çıxış edirdi. ”Ziya”qəzetinə”, “Qafqaz müsəlmanlarına xitab”, “Təlim-tərbiyə haqqında”, “Əkinçi” qəzetinə yardım üçün”, “Qəzet nədir”, “Ziya” qəzetinə təbrik”, “Ziya” qəzeti haqqında”, “Həsən bəy Məlikov Zərdabiyə”, “Həsən bəyin hüzurinə” və b. şeirləri gənc nəslin təlim-tərbiyəsinə, təhsilin, elm və maarifin təbliğinə həsr olunmuşdur.

Həsən bəy Zərdabiyə müraciətlərində onun gördüyü işə yüksək qiymət verir, əsərlərinin qəzetdə çap olunmasını xahiş edirdi. Şeirlərində S.Ə. Şirvani həm elm və maarifin cəmiyyətin inkişafında əhəmiyyətli rolunu açıb göstərir, həm də Həsən bəy Zərdabinin bu sahədə maddi və mənəvi çətinliklər bahasına gördüyü işin böyüklüyünü xalqa çatdırırdı. Bu yolla da

xalqa arzu və istəklərini ifadə edirdi. Eyni zamanda, oxucularını "Əkinçi"nin ətrafında sıx birləşməyə, onu qorumağa çağırırdı. "Millləti-Sislam"ın gündən-günə "zəlilü-xar" olmasının səbəblərini "ona bielmlik olur bais," – deyə onları "qəflət yuxusu"ndan ayılmağa çağırırdı. Nadanlıqdan qurtarmaq üçün onları qabaqcıl elmləri öyrənməyə, maariflənməyə həvəsləndirirdi. "Millətin qeyrətin çəkən kəslər"i əlbir olmağa, birgə fəaliyyətə səsləyirdi.

Xüsusilə,"Əkinçi"nin təsiri ilə şair günün vacib olan məsələləri ilə maraqlanırdı. "Əkinçi" qəzetinin nəşrə başlaması S.Ə. Şirvani yaradıcılığının yeni ictimai məzmun kəsb etməsi və formalaşmasına müsbət təsir göstərdi. Şair səsini H. Zərdabinin səsinə qoşdu."(8,173) Müasir həyatın tələblərinə uyğun şeirlər yazıb "Əkinçi"də nəşr etdirən maarifçi şair üçün "Əkinçi" qəzeti bir xitabət kürsüsü idi. O, xalqı qəflət və cəhalət yuxusundan oyatmağa çalışır, Həsən bəy Zərdabinin maarifçilik təşəbbüslərini alqışlayır, onu bilikli bir müəllim və xeyirxah insan kimi qiymətləndirirdi. Məhz "Seyid Əzim Şirvaninin "Əkinçi"də iştirak etməsi ilə maarifçi realist poeziya məktəbi yarandı (8, s.173). Şair "Əkinçi" qəzetinin böyük mədəni faydalarını dərk etdiyi üçün onun nəşrinə mane olanları susdurmağa çalışırdı, əsərlərində mürtəceləri satira atəşinə tuturdu. Müasirlərini bu qəzeti oxumağa və onu qorumağa çağırırdı:

Bəs "Əkinçi"cəlalımızdı bizim,
Nasehi xoşməqalımızdı bizim.
Səy edin, ey guruhi-niksifat!
Etməsin ta bizim "Əkinçi" vəfat (14, s. 431).

Odur ki, milli ədəbi dilimizin və mədəniyyətimizin inkişafı tarixində Həsən bəy Zərdabi və onun nəşr etdiyi "Əkinçi" qəzeti misilsiz xidmətlər göstərmişdir. Xalqın milli təfəkkürünün formalaşması və maariflənməsi, siyasi səbatlılığının artması və dünyagörüşünün inkişafında göstərdiyi səy və yorulmaz fəaliyyətinə görə "Əkinçi" özündən əvvəlki və sonrakı dövr mətbuat orqanları arasında Azərbaycan reallıqlarını daha mükəmməl əks etdirə bilməsi və xalqsevərliyi, tərəqqipərvərliyi, xalq ruhuna uyğunluğu və azadlıqsevərliyi ilə fərqlənirdi. Bu keyfiyyətləri ilə də xalqın sevimlisi oldu. Tədqiqatçılar çox haqlı olaraq "Əkinçi"ni "maarifçilik ideyalarının əkinçisi", ondan sonra gələn və "Əkinçi" qəzetinin ənənələrini davam etdirən mətbuat orqanlarını isə "Əkinçi"nin övladları"(prof. X. Məmmədov) adlandırırlar.

Əsrin sonlarına doğru "Əkinçi" ideyalarını, onun ənənələrini davam və inkişaf etdirən "Kəşkül" (1883-1891) qəzeti oldu. Qəzetə Ünsizadə qardaşlarından Cəlal Ünsizadə redaktorluq edirdi. XIX əsrin 80-90-cı illərində Azərbaycan maarifçilik hərəkatının geniş vüsət almasında onların da böyük xidmətləri olmuşdur. Xalqın həyatını, onun məişəti, gündəlik məşğuliyyəti və maarifçilik ideyalarını təbliğ edən, xalq ruhunu, arzu və istəklərini, qayğı və ehtiyaclarını əks etdirən məhz "Kəşkül" qəzeti idi.1891-ci ildə "Kəşkül" ün bağlanmasından sonra Azərbaycanın demokratik və maarifpərvər ziyalıları N. Nərimanov, S.M. Qənizadə, M. Şahtaxtlı nə qədər çalışsalar da, heç bir qəzet nəşrinə icazə ala bilmədilər. Məqsəd və məramından asılı olmayaraq, çap olunan mətbuat orqanları daim basqı və təzyiqlərə məruz qalırdılar. Mütləqiyyət hökuməti xalq kütlələrini, xüsusən türk-müsəlman əsilli xalqları daim əsarətdə saxlamağa çalışırdı. Buna görə də Azərbaycan dövri mətbuatı çar hökumət orqanları və senzuranın təqibləri ilə üzləşirdilər. Azərbaycanlılardan sayca çox az olan ermənilərin, gürcülərin onlarla qəzet və jurnalları çap olunduğu halda, çar hakimiyyət orqanları və şovinistlər Azərbaycan dilində mətbuatın olmasına, onun məqsəd və məramından asılı olmayaraq, çox qısqanclıqla yanaşırdılar.

**Problemin aktuallığı.** Çar Rusiyasının Azərbaycanda apardığı müstəmləkəçilik siyasəti və Azərbaycan dilində çap olunan mətbuat orqanlarına qarşı qatı amansızlığı tənqid edilir.

**Problemin elmi yeniliyi.** Azərbaycanda maarifçiliyin inkişafı və süni yaradılan maneələr, problemlərin həllində Azərbaycan ziyalılarının əzmkarlığı və səyləri əks olunmuşdur.

**Problemin əhəmiyyəti.** Məqalə magistr, doktorant və gənc tədqiqatçıların istifadəsi üçün əhəmiyyətlidir.

**Ədəbiyyat:**

1. Ağarəfi Zeynalzadə. Azərbaycan mətbuatı və çar senzurası (1850-1905).- Bakı: Elm, -2006.
2. Babayev, B. Azərbaycan realist nəsrində satira. -Bakı: Elm, -2008.
3. Bakıxanov, A. Seçilmiş əsərləri. / A. Bakıxanov. -Bakı: Avrasiya-Press, 2005.
4. Əkinçi. 1875-1877. Tam mətni. Redaktor Ə. Mirəhmədov. -Bakı: Avrasiya Press, -2005.
5. Feyzulla Qasımzadə. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. -Bakı: Maarif, -1974.
6. Xeyrulla Məmmədov. ”Əkinçi”dən “Molla Nəsrəddin”ə qədər. -Bakı, 1986.
7. Xeyrulla Məmmədov. XIX əsrin sonu, XX əsrin əvvəllərində Azərbaycanda maarifçi-realist ədəbiyyat. -Bakı, 1978.
8. Xeyrulla Məmmədov. XIX əsr Azərbaycan ədəbiyyatı. Bakı. 2006.
9. Həsən bəy Zərdabi – 170.Tərtib edən: A. Abdullayeva. -Bakı, 2012.
10. İsmayıl bəy Qutqaşınlı. Əsərləri. Lider nəşriyyatı. -Bakı, 2005.
11. M. Yusifov, Mirzə Şəfi Vazeh. -Bakı: Elm və təhsil, -2014.
12. M. F. Axundov. Bədii və fəlsəfi əsərləri. -Bakı: Yazıçı, -1987.
13. Mir Cəlal, F.C. Hüseynov. XX əsr Azərbaycan ədəbiyyatı. -Bakı: Maarif, -1982.
14. S.Ə. Şirvani. Seçilmiş əsərləri. İki cilddə. I cild. -Bakı: Şərq- Qərb, -2013.

**E-mail:** tofiqisgenderov92@gmail.com
**Rəyçilər:** *filol.ü.fəls.dok***. A.H. Nəzərova**,
*filol.ü.fəls.dok.* **A.A. Əhmədzadə**
**Redaksiyaya daxil olub:** 02.03.2023

UOT 37.0

**Cəmilə Vaqif qızı Kərimova**
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdində*
*Azərbaycan Dövlət Pedaqoji Kollecinin müəllimi*

# AZƏRBAYCAN PEDAQOJİ FİKİR TARİXİNDƏ EKOLOJİ TƏRBİYƏ MƏSƏLƏLƏRİ

**Джамиля Вагиф гызы Керимова**
*преподаватель Азербайджанского Государственного Педагогического Колледжа при Азербайджанском Государственном Педагогическом Университете*

# ВОПРОСЫ ЭКОЛОГИЧЕСКОГО ВОСПИТАНИЯ В ИСТОРИИ ПЕДАГОГИЧЕСКОЙ МЫСЛИ АЗЕРБАЙДЖАНА

**Jamila Vagif Karimova**
*teacher at Azerbaijan State Pedagogical College of the Azerbaijan State Pedagogical University*

# İSSUES OF ECOLOGICAL EDUCATION IN THE HISTORY OF PEDAGOGICAL THOUGHT IN AZERBAIJAN

**Xülasə.** Məqalədə Azərbaycan pedaqoji fikir tarixində ekoloji tərbiyə məsələlərindən bəhs olunur. “Qurani-Kərim”in müvafiq ayələrində, eyni zamanda, Azərbaycan mütəfəkkirlərinin fikirlərində də ekoloji tərbiyə məsələləri barədə danışılır. Həmin mütəfəkkirlərin əsərlərinin təhlili də məqalədə qeyd edilir.
***Açar sözlər:*** *ekologiya, təlim, təhsil, inkişaf, ekoloji tərbiyə*

**Резюме.** В статье рассматриваются вопросы экологического воспитания в истории азербайджанской педагогической мысли. Повествуется о соответствующих аятах Священного Корана, а также обсуждаются вопросы экологического воспитания в суждениях азербайджанских мыслителей. В статье также упоминается анализ произведений этих мыслителей.
***Ключевые слова:*** *экология, обучение, образование, развитие, экологическое воспитание*

Summary. The article deals with issues of environmental education in the history of Azerbaijani pedagogical thought. In the relevant verses of the Holy Quran, at the same time, in the opinions of Azerbaijani thinkers, issues of environmental education are discussed. The analysis of the works of those thinkers is also mentioned in the article.
***Key words:*** *ecology, training, education, development, environmental education.*

Ekologiya, ekoloji tərbiyə ifadələrini, demək olar ki, hər gün eşidirik. Bu baxımdan həmin ifadələr istər dini mənbələrdə, istərsə də mütəfəkkir və pedaqoqların əsərlərində özünəməxsus yer tutmuşdur.

Müqəddəs kitabımız “Quran”ın müvafiq ayələrindən görürük ki, Böyük Yaradan Yer üzünü insanlar üçün yaradıb, onu bitki örtüyü ilə örtüb, su və müxtəlif qidalarla təmin edib. Yerin altını da, üstünü də insanlar üçün zəruri, həyati əhəmiyyətli nemətlərlə zənginləşdirib. Növbənöv taxıl məhsulları, meyvələr, dərman bitkiləri, güllər, çiçəklər, ev heyvanları, quşlar, balıqlar – hamısı insanlar üçündür. Sayı-hesabı bilinməyən bu nemətlərin ən kiçik zərrəsinin də Yaradan yanında hesabı var.

Dini etiqada görə, külli kainatda nə varsa hamısı, o cümlədən, ağaclar, otlar, heyvanat Böyük Yaradanı təsbih etməkdədir (anmaqdadır). Bir ağac kəsən insan Ulu Xaliqi zikr edənin biri-

ni azaltmış olur və günaha batır. Bir ağac əkən insan isə tam onun əksini edir və savab qazanır. Axı yer üzü Allah-taalanın insanlara yaşayış yeri olaraq bəxş etdiyi ən gözəl hədiyyədir. “O Allah ki, sizin üçün yer üzünü döşədi, göyü isə tavan yaratdı, göydən yağmur endirdi və onun vasitəsilə müxtəlif meyvələrdən ruzilər yetişdirdi”. (“Əl Bəqərə”, ayə 22). Dini etiqada görə, həm də heyvanlara zülm etmək günahdır. Heç bir heyvan insan qədər zülmkar və kobud deyil. Dindən danışmışkən, mövzu ilə bağlı İslam Peyğəmbərinin (s) kəlamlarına diqqət yetirək.

Peyğəmbər əleyhissəlam, həmçinin buyurmuşdur: “Yararsız qalmış bir yeri cana gətirən adam bəri başdan savab qazanmış olur”; “Bir adamın basdırdığı ağac nə qədər meyvə verərsə, o adam o qədər savab qazanır”; “Yolun ortasına düşmüş bir daşı götürüb kənara atan, yolu sahmana salan adam savab qazanar”; “Kim daşqınların, sel sularının qarşısını alırsa, yaxud yanğınları söndürürsə, şəhidlərin qazandığı savab qədər savab qazanır”; “Bir müsəlman bir şey əksə, əkdiyi şeyin məhsulundan bir quş, bir insan, yaxud bir heyvan yesə, o, həmin adamın ehsanıdır”; “Allah deyir ki, məndən rəhm istəyirsinizsə, bütün yaratdıqlarıma acıyın”; “Ziyan verən canlılardan başqa hər hansı bir canlını öldürmək qadağandır”; “Heyvana əziyyət verməyi qadağan edirəm”; “Tanrı lənət eləsin bir heyvana əziyyət verənə”; “Hətta bir sərçənin başının kəsilməsinə acıyan, həmin sərçəyə yazığı gələn adama Allah qiyamət günü acıyar”; “Allah lənət eləsin ağac kəsənə”.

Su, hava, qida nemətləri və bütün hər şey insanlara çatacaq qədər yaradılıb. Bu barədə “Məryəm” surəsinin 99-cu ayəsində deyilir: “And olsun ki, Allah onları (bütün yaratdıqlarını) hesablamış və təkrar-təkrar saymışdır”. İnsanların borcu həmin nemətləri qorumaq və ondan düzgün istifadə etməkdir. Lakin “Qurani-Kərim”də buyurulduğu kimi, insan nankor olduğundan hər zaman səhlənkarlığa yol vermiş və verməkdədir. Bu gün yer üzü ilkinliyini itirmişdir. Dəniz və quru çirklənmiş, qidalar təbiilikdən çıxmış, hava zəhərlənmiş, ozon qatı deşilmişdir.

İnsanların var-dövlətə olan hərisliyi onun düzgün olmayan əməlləri törətməsinə gətirib çıxarmışdır. Belə ki, insan qlobal istiləşmə, bitki örtüyünün məhv olması, Qırmızı kitaba düşən heyvanların nəslinin kəsilməsi və müxtəlif xəstəliklər ilə qarşı-qarşıyadır. Təəssüf hissi ilə qeyd etmək istərdim ki, bunlar məhz insan əməyinin nəticəsidir. Ekologiya elmi də məhz bu səbəbdən yaranmışdır.

Müasir dövrdə ekologiya dedikdə, ətraf mühitin – torpağın, suyun, havanın çirklənmədən qorunması və təmiz saxlanması başa düşülür.

“Elmi araşdırmalar onu göstərir ki, əgər insanlar, dövlətlər təbii fəlakətlərin (tufan, sel, qasırğa, isti külək, daşqınlar, yanğınlar və s.) yaranmasına səbəb olan qaz emissiyalarının azaldılması ilə bağlı lazımi və effektiv tədbirlər görməsə 21-ci yüzillikdə dünyanın illik orta temperaturu ən azı 3 dərəcə yüksələ bilər. Bunun ağır nəticələrini təsəvvür etmək isə o qədər də çətin deyil. Bu gün Çin dövləti emissiya üzrə dünya lideridir. Bu sahə üzrə bir statistikanı diqqətə çatdırmaq tam yerinə düşər. Belə ki, 2019-cu ilin məlumatlarına görə, karbon dioksid ekvivalentində qlobal istixana emissiyalarında ilk 5 ölkə liderdir. Çin – 28%, ABŞ – 15%, Hindistan – 7%, Rusiya – 5%, Yaponiya – 3%. Hesablamalara görə, Azərbaycanın payı 0.15%-dır” (1).

Qeyd etməliyik ki, ekologiya XX əsrin elmidir. Yəni bu əsrdə kütləvi hal almış ekoloji böhran – kütləvi qırğın silahlarının hazırlanması və sınaqdan keçirilməsi, kosmik uçuşlar, atom-nüvə reaktorları, kimya zavodları və kimyəvi məhsullar, sənayenin inkişafı naminə təbiətə təcavüz, meşələrin qırılması, çayların istiqamətinin dəyişdirilməsi, dağların partladılması, müharibələr və s. bu elmin yaranmasına səbəb olmuşdur. Beləliklə, pedaqogika elmində “ekoloji tərbiyə” məfhumu yaranmış və böyüməkdə olan nəslin ekoloji tərbiyəsi aktual problemə çevrilmişdir.

Təlim və tərbiyə ilə bağlı elə bir incəlik yoxdur ki, xalqın diqqətindən kənarda qalsın, o cümlədən ekoloji tərbiyə. Neçə əsr bundan əvvəl xalq insanın yer üzərində qalıb-qalmayacağının ekologiyadan asılı olduğunu duyub dərk etmiş və bu barədə tövsiyələrini vermişdir. Halbuki o zaman təbiətə indiki kütləvi təcavüz yox idi.

Azərbaycan pedaqoji fikir tarixində də bir çox mütəfəkkirlər təbiət, ekoloji tərbiyə barədə müxtəlif fikirlər söyləmişlər.

Nizami Gəncəvi insan və onun şəxsiyyəti haqqında qiymətli fikirlər söyləmiş, insanı yer üzünün ən qüdrətli varlığı hesab etmişdir.

O, elmləri dörd qrupa bölür: 1) insanı öyrənən elmlər; 2) heyvan – bitkiləri öyrənən elmlər; 3) dağı - torpağı, yeraltı sərvətləri (yəni cansız aləmi) öyrənən elmlər; 4) hərb elmləri.

Nizami qəhrəmanlarının həyat tərzinə uyğun olaraq təbiət təsvirinə, suya, havaya, günəşə, aya, ulduzlara xüsusi diqqət yetirmişdir. O, insanları təbiətin gözəlliyini qorumağa, təmiz suyun, təmiz havanın qədrini bilməyə çağırır. O, əsərlərində müxtəlif güllərin, çiçəklərin, ayın, günəşin gözəlliyindən danışır. O, flora və faunanın qorunmasının, təbiətin simmetriyasının gözlənilməsini zəruri sayır. Su, hava təmiz olmalıdır, su həyatdır, su hər şeyə təravət verir, hər şeyi təmizləyir.

Nizami Roma təbiətşünası Vəlinasın dili ilə deyir ki, təbiətdəki hər şey dörd ünsürdən – od, su, torpaq, havadan asılıdır. Ona görə də Nizami dörd ünsürə qayğı ilə yanaşmağı tövsiyə edir. Onun qəhrəmanları əkib-biçməyə, bağ salmağa, yaşıllıq yaratmağa xüsusi əhəmiyyət verirlər.

"Nizaminin yaradıcılığında ətraf mühit məsələlərinin təqdimi və təhlili o qədər elmi şəkildə verilib ki, müəllifə təbiəti əla mənimsəmiş və onun qayğısına qalan alim kimi yanaşmalı olursan. O, canlı orqanizmlərə təsir edən faktorları dəqiqliklə çatdırır. Məsələn, orqanizmi təbiətdə əhatə edən və ona təsir göstərən elementləri verməklə ekoloji amilləri göstərmiş olur.

Əncirin budağı bomboş qalardı yayda,
Ənciryeyən olsaydı, bütün quşlar dünyada" (2).

Məhəmməd Füzuli yaradıcılığında da elm, təhsil məsələləri ilə yanaşı, təbiət motivləri də özünəməxsus yer tutur.

"Məhəmməd Füzuli yaradıcılığı üçün səciyyəvi olan cəhətlərdən biri də təbiət təsvirlərindən məharətlə istifadə etməsidir.

Bizi əhatə edən dünya, yer, göy, ay, ulduz, gül-çiçək, bir sözlə, təbiətin min bir əsrarəngiz gözəlliyi onun lirikasının ilham və mövzu mənbəyidir. Təbiət təsviri, peyzaj Füzuli lirikasında məqsəd və vasitədir.

Baharın təsviri, təbiətin oyanması, güllərin açması, bülbüllərin oxuması Füzuli şeirində bədii-poetik qayə kəsb edir. Şərq şeirincə baharla bağlı işlənən bu cür təbiət təsvirlərinə bahariyyələr deyilir (3).

Mirzə Ələkbər Sabir gənc nəslin tərbiyəsində və onun dünyagörüşünün formalaşmasında uşaq ədəbiyyatının böyük rolunu görmüş, bu məqsədlə də balalarımız üçün bir neçə şeirlər, təmsillər, nəsihətlər, mənzum hekayələr yazmışdır.

Sabirin istər təbiət, istərsə cəmiyyət və adi məişət hadisələrinə aid yazılmış şeirləri nəinki uşaqlara həyatı və təbiəti sevdirir. "Cütçü", "Yaz günləri", "Uşaq və buz" və s. şeirləri onun uşaqların tərbiyəsinə dərin münasibətinin parlaq ifadəsidir.

Abbas Səhhət fiziki tərbiyə işində təbiətə, onun gözəlliyinə, suya, təmiz havaya, günəş işığına böyük əhəmiyyət verir, bir həkim kimi insanların sağlamlığında onların böyük rolunu səmimi bir qələmlə tərənnüm edir, sözlə təbiətin tablosunu yaradırdı.

Təbiət sağlamlığın mənbəyidir. Uşaqların hələ kiçik yaşlarından belə bir mənbə ilə təmasda olmalarını zəruri sayan A. Səhhət təbiəti rəngarəng boyalarla təsvir edirdi. Bu baxımdan onun "Yaz", "Yay", "Qış", "Yay səhəri", "Payız çağında", "Köç", "Əkinçi nəğməsi", "İlk bahar" və s. şeirlərinin hər biri gözəl rəsm əsəridir.

12 misralıq "Yaz" şeirində yazın bir çox əlamətləri öz əksini tapmışdır: yazda gecə-gündüzün bərabər olması, havaların istiləşməsi, qarların əriyib çaylara tökülməsi, çayların daşması, quşların isti ölkələrə qayıtması uşağın başa düşəcəyi şeir dili ilə təsvir olunur. "İlk bahar" şeirində yazın digər əlamətləri də (havanın tutulub-açılması, yağmurlu olması, isti küləklərin əsməsi, ağacların yarpaqlanması, çəmənin göyərməsi və s.) göstərilir.

"Yay" şeirində uşaqlar yay fəslinin əlamətləri ilə (havanın istiləşməsi, quş və heyvanların kölgəyə çəkilməsi, meyvələrin yetişməsi, taxılın biçilməsi və s.) tanış olurlar.

"Yaz" və "İlk bahar" şeirlərini əzbərlətmək mümkün olduğu halda, "Yay" şeirinin uşaqlara oxunması münasibdir. Bu şeirlərin məzmunundan məktəbəhazırlıq qrupu uşaqlarının rəsm məşğələlərində təbiət lövhələri çəkmələri üçün də istifadə edilə bilər.

"Güllərin bəhsi" alleqoriyasında uşaqlar qızılgülün xüsusiyyətləri ilə tanış olurlar. "Bağça" şeiri uşaqları bağ-bostanla, onların məhsulları ilə şən bir şəraitdə tanış edir.

Abdulla Şaiqin də ədəbi irsi məktəbəqədər yaşlı uşaqların tərbiyəsi üçün zəngin material

verir. Onun bir çox şeirlərindən uşaqların təbiətlə tanışlığı və nitq inkişafı üçün müvəffəqiyyətlə istifadə etmək olar. Məlum olduğu kimi, təbiət həyata təzəcə göz açan, ona yenicə bələdləşən körpə uşaqlar üçün sirli bir aləmdir. "Bu nədir?" refleksinin təsiri ilə uşaq bu aləmi öyrənməyə can atır. Quşlar, heyvanlar, bitkilər aləmi, təbiətin əsrarəngiz gözəlliyi uşağı özünə cəlb edir. Təbiət uşaq üçün təkcə estetik zövq mənbəyi deyil, həm də idrak mənbəyidir. Təbiətlə tanışlıq uşaqların həyati təsəvvürlərini genişləndirir, onlarda düzgün dünyagörüşünün formalaşmasına kömək göstərir.

Uşaqların təbiətlə tanışlığında bədii ədəbiyyatın əvəzedilməz rolunu duyan A. Şaiq təbiəti tərənnüm etmiş, onlara fəsillər, heyvanlar, quşlar, bitkilər, təbiət hadisələri haqqında sadə şəkildə məlumat verməyə çalışmışdır. Onun bir çox şeirləri ("Bahar", "Payız", "Payız gecəsi", "Qışın nəğməsi" və s.) balacaları ilin fəsilləri ilə tanış edir. Bu şeirləri uşaq bağçasının böyük və məktəbəhazırlıq qruplarında oxumaq və qismən əzbərlətmək məsləhətdir.

A. Şaiqin bitki və heyvanlara dair lirik şeirləri uşaqları mədəni və yabanı bitkilər, vəhşi və ev heyvanlarının həyat tərzi ilə tanış edir. O, uşaqları bitkilərə, heyvan və quşlara qayğı ilə yanaşmağa çağırırdı. Şairin "Qərənfil", "Bənövşə", "Qızılgül", "Zanbaq" kimi şeirləri uşaqları gül və çiçəklərlə tanış etmək cəhətdən maraqlıdır.

"Qərənfil" şeirində uşaqlar qərənfilin çəhrayı, ağ, qırmızı, sarı rəngdə, həm də yaşıl saplaqlı olduğunu öyrənirlər. "Bənövşə" şeirində uşaqlar az ömürlü, gözəl ətirli, boynu bükük bənövşə ilə tanış olurlar. "Qızılgül" şeirində yaşıl belli, qızıl telli, ətri hər yanı tutan, süfrələrin bəzəyi olan qızılgül uşaqların gözü qarşısında canlanır. "Zanbaq" şeirində isə şair balaca oxucuları ağ ipəyə oxşayan, gümüş kimi parıldayan, ətrafa ətir saçan zanbaqla tanış edir. Şair kiçik lirik lövhələrlə uşaqları gül və çiçəklərin konkret əlamətləri ilə tanış edir.

Deyilənləri ümumiləşdirərək belə bir nəticəyə gəlmək olar ki, Azərbaycan pedaqoji fikir tarixində istər dini mənbələr baxımından, istərsə də mütəfəkkirlərin, şair və yazıçıların əsərlərində ekoloji tərbiyə məsələlərinin özünəməxsus xüsusiyyətləri daima mühüm olması ilə seçilmişdir.

**Problemin aktuallığı.** Ekoloji tərbiyə ətraf mühitin dərk olunması və təbiətə qayğı ilə yanaşmanın formalaşması proseslərindən keçir. Ekoloji cəhətdən savadlı insan dərk etməlidir ki, təbiət də onun özü kimi canlıdır. Təbiət güclüdür, ancaq bu güc tükənməz deyil. Təhsil ocaqlarında ekoloji təhsilin gücləndirilməsinin tərəfdarları hesab edirlər ki, uşağa kiçik yaşlarından təbiətə qayğı ilə yanaşmanı aşılamaqla biz onun şəxsiyyətinin formalaşmasına ciddi təkan vermiş oluruq. Başqa sözlə, yeni nəsildə vətəndaş şüurunun formalaşdırılmasının əsas istiqamətlərindən biri də məhz ekoloji təhsil və tərbiyə olmalıdır. Bu yolla gəncləri doğma torpağı və təbiəti sevməyə, ətraf mühitə biganəlikdən qaçmağa öyrədə bilərik.

**Problemin elmi yeniliyi.** Azərbaycan pedaqoji fikir tarixində istər dini mənbələr, istərsə də pedaqoq və mütəfəkkirlərin fikirləri baxımından ekoloji tərbiyə məsələlərinin öyrədilməsi, bir çox əsərlərdə təhlili məhz təqdim olunan problemin elmi yeniliyini təqdim edir.

**Problemin praktik əhəmiyyəti.** Tədqiq olunan problem bu sahədə mövcud olan bir sıra vacib məsələlərin həlli üçün praktik əhəmiyyətə malikdir.

**Ədəbiyyat:**

1. https://www.muallim.edu.az/news.php?id=17421
2. https://diriliqurbanimeclisi.wordpress.com/2013/07/06/nizaminin-ekoloji dunyagorusu/
3. https://azkurs.org/baba-babazade.html?page=10

**E-mail:** camila.piriyeva@gmail.com

**Rəyçilər:** *ped.ü.fəls. dok.,* **G.T. Eminova,**
*ped.ü.fəls. dok.,* **N.R. İsmayılova**
**Redaksiyaya daxil olub:** 15. 02.2023

# *PSİXOLOGİYA, YAŞ FİZİOLOGİYASI VƏ İNKLÜZİV TƏHSİL MƏSƏLƏLƏRİ*
# *ПСИХОЛОГИЯ, ВОЗРАСТНАЯ ФИЗИОЛОГИЯ И ВОПРОСЫ ИНКЛЮЗИВНОГО ОБРАЗОВАНИЯ*
# *ISSUES OF PSYCHOLOGY, AGE PHYSIOLOGY AND INCLUSIVE EDUCATION*

*UOT 159.9*

***Mehriban Cəlal qızı İsmayılova***
*psixologiya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin*
*Pedaqoji psixologiya kafedrasının dosenti*

***Yarməmməd Daşqın oğlu Hüseynov***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

## MÜASİR YENİYETMƏ ŞƏXSİYYƏTİNİN İNKİŞAFI VƏ PSİXOLOJİ XÜSUSİYYƏTLƏRİ

***Мехрибан Джалал гызы Исмайлова***
*доктор философии по психологии*
*доцент кафедры педагогической психологии*

*Азербайджанского Государственного Педагогического Университета*

***Ярмамед Дашгын оглы Гусейнов***
*Азербайджанский Государственный Педагогический Университет*

## РАЗВИТИЕ И ПСИХОЛОГИЧЕСКИЕ ОСОБЕННОСТИ ЛИЧНОСТИ СОВРЕМЕННОГО ПОДРОСТКА

***Mehriban Jalal Ismayilova***
*doctor of philosophy in psychology,*

*associate professor of the department of Educational psychology at the*
*Azerbaijan State Pedagogical University*

***Yarmamed Dashgin Huseynov***
*Azerbaijan State Pedagogical University*

## DEVELOPMENT AND PSYCHOLOGICAL CHARACTERISTICS OF THE PERSONALITY OF A MODERN TEENAGER

**Xülasə.** Elmi məqalədə müəlliflər tərəfindən müasir yeniyetmə şəxsiyyətinin inkişaf və psixoloji xüsusiyyətləri araşdırılmışdır. Məqalədə yeniyetmə şəxsiyyətinin ən mühüm xüsusiyyətləri ardıcıllıqla şərh edilmişdir. Müəlliflərin fikrincə, yeniyetməlik yaş dövrü dünyagörüşün, əxlaqi inancların, prinsip və ideal-ların, o cümlədən yeniyetmənin davranışında dəyər mühakimələri sisteminin intensiv formalaşmasının başlanğıc dövrüdür.

***Açar sözlər:*** *yeniyetmə şəxsiyyəti, psixoloji və inkişaf xüsusiyyətləri, dünya- görüş, əxlaqi inanclar, psixoemosional münasibət, identiklik*

**Резюме.** В научной статье авторы исследовали развитие и психологические особенности личности современного подростка. В статье последовательно трактуются важнейшие характеристики личности подростка. По мнению авторов, подростковый возраст является начальным периодом интенсивного формирования мировоззрения, нравственных убеждений, принципов и идеалов, а также системы оценочных суждений в поведении подростка.

***Ключевые слова:*** *личность подростка, психологические и возрастные особенности, мировоззрение, нравственные убеждения, психоэмоциональное отношение, идентичность*

**Summary.** In a scientific article, the authors studied the development and psychological characteristics of the personality of a modern teenager. The article consistently interprets the most important characteristics of a teenager's personality. According to the authors, adolescence is the initial period of intensive formation of a worldview, moral beliefs, principles and ideals, as well as a system of value judgments in the behavior of a teenager.

***Key words:*** *personality of a teenager, psychological and age characteristics, worldview, moral beliefs, psycho-emotional attitude, identity*

Yeniyetməlik inkişaf dövrü təxminən 10-11 yaşdan 14-15 yaşa qədər olan yaşı əhatə edir, məktəbin orta siniflərində uşaqların təhsili ilə üst-üstə düşür. Yeniyetməliyin psixoloji xüsusiyyətləri müxtəlif müəlliflərin fikrincə, böhran kimi qəbul edilir və üç əsas sahədə yenidən qurulma ilə əlaqələndirilir: *bədən, psixoloji və sosial.*

*Bədən səviyyəsində* əhəmiyyətli hormonal dəyişikliklər baş verir, *sosial səviyyədə* yeniyetmə uşaq və böyüklər arasında aralıq mövqe tutur, *psixoloji səviyyədə* yeniyetməlik özünüdərketmənin formalaşması ilə xarakterizə olunur. Hər bir yaş bir keçid dövrüdür, insanı daha yüksək yaş səviyyəsinə keçidə hazırlayır. Uşaqlara xas olan konkret, obrazlı təfəkkür yeniyetməlik dövründə getdikcə öz yerini mücərrədliyə verir, daha müstəqil, aktiv və yaradıcı olur.

Yeniyetmə şəxsiyyətinin strukturunda baş verən dəyişikliklər özünüdərkin inkişafı ilə müəyyən edilir ki, bunun nəticəsində fərd və ətraf mühit arasındakı keçmiş əlaqə pozulur. Yeniyetməlik dövrünün psixoloji xüsusiyyətləri yetkinlik kompleksi adlanır. Bu yaşın xarakterik xüsusiyyəti ondan ibarətdir ki, yeniyetmələr mümkün qədər çox bilik əldə etməyə həvəslə çalışır, zehni fəaliyyətlərini onları daha çox maraqlandıran sahəyə yönəldirlər. Yeniyetməlik yaş dövründə əhval-ruhiyyə sabit, emosional reaksiyalar daha fərqli olur, baxmayaraq ki, onların gözlənilməzliyi və qeyri-adekvatlığı davam edə bilər. Oğlanlarda emosional qeyri-sabitlik 11-13 yaşda, qızlarda isə 13-15 yaşlarında müşahidə edilir.

Bu dövrdə yeniyetmələrdə yetkinlik hissi formalaşmağa başlayır ki, bu da onun fiziki inkişaf dövründəki dəyişiklikləri dərk etməsi və qiymətləndirməsi nəticəsində yaranır. Yaşlıların etibarı və erkən müstəqillik yeniyetməni təkcə sosial deyil, həm də subyektiv olaraq yetkin edir. Bu hiss hər bir yeniyetmənin həm böyüklərin, həm də həmyaşıdların ona kiçik bir uşaq kimi deyil, böyüklər kimi yanaşması istəyində özünü göstərir. Yeniyetmədə müstəqil və böyüklərin əhatəsində əhəmiyyətli olmasına, özünü digərlərindən fərqli bir insan kimi dərk etməyə ehtiyac vardır. Bu zaman yeniyetmədə özünütəsdiq, özünüdərk və öz müqəddəratını təyin etmək istəyi yaranır.

Yeniyetmə yaşlılarla münasibətlərdə bərabər hüquqlar tələb etməyə başlayır və böyüklərin mövqeyini müdafiə edərək münaqişələrə başlayır. Yetkinlik hissi yeniyetmələrdə həyatının bəzi sahələrini valideynlərin müdaxiləsindən qorumaq istəyində özünü göstərir. Bu daha çox yeniyetmənin görünüş məsələlərində, həmyaşıdları ilə münasibətlərdə təzahür edir. Buraya, həmçinin yeniyetmənin zövqünü, baxışlarını, davranışını aid etmək olar. Bütün bunlarla yanaşı yeniyetmənin şəxsiyyət kimi inkişafının ən qabarıq xarakterini müxtəlif təzahürlərdə özünüdərk strukturunun dəyişməsi ilə izləmək olar ki, buraya özünəhörmət, özünə və başqalarına verilən tələblər, fəaliyyət motivləri, ideallar, maraqlar, meyllər və s. daxildir.

Beləliklə, yeniyetməlik dövrünün ilk mərhələsində (10-11 yaş) onlar özlərinə xüsusi münasibətləri ilə (özünüqəbuletmə) ilə xarakterizə olunurlar. Oğlanların təxminən 34%-i, qızların 26%-i özlərinin tamamilə mənfi xüsusiyyətlərini göstərir, onlarda çaşqınlıq hiss edilir, sanki özlə-

malaşdırılması zəruridir. I sinif riyaziyyat dərsliyində "parçalarla" qrafik təsvirlərin qurulmasına aid çalışmalar kifayət qədər verildiyindən burada onları təkrar etməyə ehtiyac yoxdur. Bundan başqa, onlardan bəziləri gələcəkdə məsələ şərtinin "parçalarla" təsvir edilməsinə hazırlıqla əlaqədar nəzərdən keçiriləcəkdir.

Şagirdlərin ədədlərlə həndəsi obrazlar arasındakı uyğunluğu daha yaxşı başa düşmək üçün bizim təcrübədə tamamilə səmərəli bir vasitə olan qrafik imlalardan istifadə olunmuşdur. Qrafik imlaların aparılması metodikası aşağıdakı kimidir: müəllim söyləyir və ya məsələni (sual, misal) yazır, şagirdlər isə onun cavabını dəftərlərində qrafik təsvir edirlər.

Konkretdən mücərrədə tədricən və ardıcıl keçid prinsipinə əməl edərək vurma və bölmə əməlləri ilə ilk tanışlıq vaxtında, aşkardır ki, əşyavi əyanilikdən, sonra II sinfin riyaziyyat dərsliyinin uyğun şəkillərindən və yalnız bundan sonra həndəsi obrazlar şəklində əyanilikdən istifadəyə keçmək lazımdır.

II sinifdə öyrənilən vurma bərabər toplananların cəmi kimi nəzərdən keçirilir. Şagirdlərə göstərmək lazımdır ki, bərabər ədədlərin toplanmasını illüstrasiya edərkən toplananları qrafik təsvir edən zolaqları (üçbucaqları, bayraqları, dairələri və s.) bir sırada deyil, biri-birinin altında yerləşdirmək əlverişlidir.

İbtidai siniflərin riyaziyyat kursunun təlimində qrafik təsvirlərin əhəmiyyəti yalnız kəmiyyətlər arasındakı aşkar olmayan asılılıqları şagirdlərin şüurlu şəkildə müəyyən etməsi ilə tükənmir, həmçinin fəal düşünməyə məsələ həllinin ən rasional həlli yolunu axtarmağa onları təhrik edir. Alınan biliklərin yalnız mənimsənilməsinə deyil, həm də onların tətbiq edilməsi bacarığına şagirdlərin yiyələnməsinə kömək edir. Bütün bunlar isə təlimin inkişafetdirici xarakter alması üçün zəruri şərtdir.

Qrafik təsvirlərin dəqiq və səliqəli icra edilməsinin şagirdlərin təhsili ilə yanaşı tərbiyəsi üçün də mühüm əhəmiyyəti vardır. Artıq ibtidai siniflərdən başlayaraq tədris işinin təhsil və tərbiyəedici funksiyalarının qarşılıqlı əlaqəsini şagirdlərin özlərinin görməsi çox mühümdür. Səliqəli yerinə yetirilmiş qrafik təsvirlər şagirdlərin estetik tərbiyəsinə əhəmiyyətli dərəcədə təkan verir: məsələnin gözlənilməz, ağıllı qrafik həlli şagirdi sevindirir, yorğunluğunu azaldır, diqqətini toplamağa kömək edir. Əksinə, kobud təsvir isə məsələ şərtindəki qanunauyğunluğu görməyə mane olur.

**Problemin aktuallığı.** Mücərrəd münasibətlərin konkret formalara çevrilməsi zərurəti bir tərəfdən məsələnin şərtində verilən münasibətləri konkretləşdirməyə, digər tərəfdən isə onda verilən məzmun konkretliyindən uzaqlaşmaqda şagirdlərə kömək edir. Qrafiklərin məhz bu mürəkkəb ikili təbiəti ona ümumiləşmiş həll üsulunun əsasında durmasına imkan verir.

**Problemin elmi yeniliyi.** İbtidai siniflərin riyaziyyat kursunun təlimində şagird təfəkkürünün inkişafına qrafik təsvir vasitələrinin təsir imkanları araşdırılmış, təlimin səmərəliliyini təmin edən qrafik təsvirlərdən istifadə edilməsinin imkan və yolları göstərilmişdir.

**Problemin praktik əhəmiyyəti** ondan ibarətdir ki, riyaziyyatın təlimində qrafik təsvirlərin müxtəlif formalarından istifadə edilməsi işində tətbiq olunan vasitələr, formalar və yollar, irəli sürülən müddəalar təlim nəzəriyyəsini müəyyən qədər zənginləşdirəcəkdir.

**Ədəbiyyat:**


1. Əlizadə X. Düşün tap. -Bakı, 2003.
2. Kazımov Z., Tağıyeva S. Riyaziyyat təlimində inkişafetdirici çalışmalardan istifadə yolları (I-IV siniflər). -Bakı, 2017.
3. Mustafazadə S.V. 3-4 sinifdə riyaziyyat kursunda inkişafetdirici məsələlərin rolu və əhəmiyyəti. -Bakı, 2017.
4. Mustafayeva F.F. Riyaziyyat təlimində inkişafetdirici çalışmalardan istifadə yolları (I-IV siniflər). -Bakı, 2019.
5. Mustafayeva F.F. Riyaziyyat təlimində qrafik təsvirlərdən istifadə (I-IV siniflər). -Bakı, 2019.


**E-mail:** mustafayevafiride@gmail.com

**Rəyçilər:** *ped.ü.fəls dok.* **M.T. Rzayev**
*ped.ü.fəls.dok.* **A. K. Nəbiyev**
**Redaksiyaya daxil olub:** 01.03.202

*UOT 372.851*

***Esmira Vahid qızı Cəfərli***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Gəncə Dövlət Universitetinin baş müəllimi*

# VI SİNİFDƏ ŞAGİRDLƏRİN STATİSTİKA VƏ EHTİMAL NƏZƏRİYYƏSİ ELEMENTLƏRİ İLƏ MƏSƏLƏ HƏLLİ VASİTƏSİLƏ TANIŞ EDİLMƏSİ METODİKASI

***Эсмира Вахид гызы Джафарли***
*доктор философии по педагогике, старший преподаватель*
*Гянджинского Государственного Университета*

# МЕТОДИКА ОЗНАКОМЛЕНИЯ УЧАЩИХСЯ В VI КЛАССЕ С ЭЛЕМЕНТАМИ СТАТИСТИКИ И ТЕОРИИ ВЕРОЯТНОСТЕЙ ПОСРЕДСТВОМ РЕШЕНИЯ ЗАДАЧ

***Esmira Vahid Jafarli***
*doctor of philosophy in pedagogy*
*senior teacher of Ganja State Universitety*

# METHODS OF FAMİLİARİZATİON OF STUDENTS WİTH THE ELEMENTS OF STATİSTİCS AND PROBABİLİTY THEORY THROUGH PROBLEM SOLVİNG İN GRADE VI

**Xülasə.** Məqalədə qeyd olunur ki, məsələlərin həllində psixoloji amil mühüm rol oynayır. Düşüncə zehni proses olmaqla yanaşı, həqiqətin dərk edilməsi ilə başlayır. "Statistika və ehtimal" orta məktəb riyaziyyat kursunun məzmun xətlərindən biridir.
***Açar sözlər**: metod, statistika, nəzəriyyə, ehtimal, optimallaşdırma*

**Резюме.** В статье отмечается, что важная роль в решении задач отводиться психологическому фактору, так как процесс решения задач тесно связан с мышлением. Мышление наряду с тем, что является умственным процессом, начинается с осознания истины. «Статистика и вероятность» одна из линий содержания курса математики средней школы.
***Ключевые слова:** метод, статистика, теория, вероятность, оптимизация*

**Summary.** The work notes that a significant role in solving problems belongs to the psychological factor, since the process of solving problems is closely related to thinking. Thinking, along with what is a mental process, begins with an awareness of the truth. "Statistics and Probability" is one of the lines of content of the high school mathematics course.
***Key words:** methodology, statistics, theory, probability, optimization*

Milli kurikulumda orta məktəbin riyaziyyat kursunun məzmun xətlərindən biri “Statistika və ehtimal” adlanır və hər sinif üçün bu xəttin məzmunu müyyənləşdirilmişdir.

VI sinifdə ehtimal nəzəriyyəsi elementləri ilə yanaşı şagirdlər statistika elementləri ilə də tanış olurlar. Burada verilənlər bazası əsasında iş aparılır. İlk mərhələdə işin məzmununu cədvəllər, diaqramlar üzərində iş təşkil edir. Buraya verilmiş hərfi ifadəyə uyğun cədvəlin doldurulması, dərs cədvəli, növbətçilik cədvəli, konkret marşrut üzrə transport vasitələri cədvəli üzrə iş aparıla bilər. Burada çox variasiyalı həll halları nəzərdən keçirilir. Bir qayda olaraq, cədvəllərin əksəriyyətində “cəmi” sütunu olur. Bu da alınmış informasiyanın təhlil edilməsi üçün olduqca mühümdür. Məsələn, hava haqqında aparılmış müşahidə nəticələrinin müqayisəsi və yekun nəticənin çıxarılması.

Əsas vəzifələr aşağıdakılardır:

–verilmiş elementlərdən müxtəlif yazılışların seçmə yolu ilə tərtib edilməsi və onların sayının (kombinasiyaların) hesablanması bacarığı və vərdişlərinin formalaşdırılması;

–kombinator məsələlərin mühakimə vasitəsilə həllinin öyrədilməsi:

–şagirdlərin cəm və hasil qaydaları ilə tanış edilməsi;

–çox variasiyalı həlli olan məsələlərlə tanış edilməsi;

–ehtimallı hadisələrin müqayisə edilməsi bacarıqlarının formalaşdırılması;

–şagirdlərin statistika tezlik, statistik ehtimal anlayışları ilə, statistika sınaq vasitəsilə ehtimalın qiymətləndirilməsi metodu ilə tanış edilməsi.

VI siniflərdə kombinator məsələlərin həlli davam etdirilir. İlk növbədə, mümkün variantlar sayının hesablanmasına aid məsələlər həll edilir. Kombinatorikaya aid biliklər əsasən məsələ həlli vasitəsilə verilir. Pedaqoji təcrübədə aşağıdakı metodik yanaşmalar tətbiq olunur:

nəzəri – çoxluq yanaşması;

leksik – qrafik yanaşma;

nəzəri – ehtimal yanaşması.

Məktəb təcrübəsində birinci yanaşmaya üstünlük verilir. Lakin qismən ikinci yanaşmadan da istifadə etmək əlverişlidir. Çünki bu yanaşmalarda təriflər əlifba, sözlər, sözün uzunluğu və b. haqqında təsəvvürlərə əsaslanır.

Məsələ həllində bəzi hallarda kodlaşdırmadan, yəni leksik-qrafik yanaşmadan istifadə etmək əlverişli olur.

*Məsələ 1.* Bir sıra dövlətlər öz bayraqları simvolu kimi ağ, qırmızı və göy rəngli, eni eyni olan üç üfüqi zolaqdan istifadə etmək istəyirlər. Neçə dövlətdə dövlət bayrağı kimi belə simvoldan istifadə olunur?

Məsələnin aşağıdakı kimi şərtləşmə ilə həll edək: rəngləri uyğun olaraq, “A”, “Q”, “G” işarə edək. Yəni kodlaşdırma aparırıq. Deməli, üç elementli {A,Q,G} çoxluq alırıq. Üç elementdən müxtəlif kombinasiyalar tərtib edək və elementlərin sırası nəzərə alınmalıdır. Məsələn, “AQG” göstərir ki, birinci zolaq ağdır, ikinci qırmızı və üçüncü göy rəngdədir. Aydındır ki, 6 ölkə bu üç zolaqlı bayraqdan istifadə edə bilər.

Məsələ 2. Görüşdə 6 nəfər iştirak edir və cəmi neçə “əlsıxma” olmuşdur?

Bu məsələni mühakimə üsulu ilə həll etmək olar.

1-ci adam 5 nəfərlə;

2-ci adam 4 nəfərlə;

3-cü adam 3 nəfərlə;

4-cü adam 2 nəfərlə;

5-ci adam 1 nəfərlə görüşür.

Cəmi 15 “əlsıxma” olmuşdur.

İndi kodlaşdırmadan istifadə edək: həmin şəxsləri 1, 2, 3, 4, 5, 6 ədədləri ilə nömrələyək. Onda, qarşılıqlı “əlsıxma” belə olacaqdır:

12, 13, 14, 15, 16;

23, 24, 25, 26;

34, 35, 36;

45, 46;

56.

Burada “12” yazılışı 1-ci adamın 2-ci adamla görüşünü bildirir. Onda bütün “əlsıxma”ların sayı 15 olacaqdır:

$$1+2+3+4+5=15$$

Həqiqətən də, bu məsələ IX sinifdə

$$C_6^2 = \frac{6!}{2!\cdot4!} = \frac{4!\cdot5\cdot6}{2\cdot4!} = 15 \text{ olur}$$

Sonrakı mərhələdə mümkün variantların sayının hesablanması məsələsinə baxılır.

*Məsələ 3.* Turistlər A→M→C→D məntəqələri marşrutu ilə gəzintiyə çıxmalıdır. A-dan M-ə çayla və ya piyada getmək olar; M-dən C-yə piyada və ya velosipedlə getmək olar; C-dən D-yə çayla, velosipedlə və ya piyada getmək olar. Turistlər cəmi neçə variant seçməlidir? Əgər marşrutun heç olmasa bir hissəsində velosipeddən istifadə edilərsə, onda neçə variantdan isitfadə olunmalıdır?

Məsələni həll etmək üçün kodlaşdırmadan istifadə edək:

“P” – piyada;

“Ç” – çayla;

“V” – velosipedlə.

Onda məsələnin sxemi belə olacaqdır:

A→M – “Ç” və ya “P”

M→C – ”P və ya “V”

C→D – “Ç”, “V” və ya “P”

Məsələni mühakimə vasitəsilə həll etməyə çalışaq.

A məntəqəsindən M məntəqəsinə getmək üçün bizim iki variantımız var və M-dən C-yə

də iki variantımız var. Deməli, A-dan C-yə getmək üçün 4 variant üsulumuz var (2·2=4). Bu dörd variantın hər biri üçün C-dən D-yə getmək üçün 3 variant var. Yəni, 4·3=12. Beləliklə, məsələ həll olunur.

Biz bu məsələnin həllində mümkün hərəkətetmə halları sayını tapdıq. İndi cəm qaydasına aid məsələlər həllini nəzərdən keçirək.

*Məsələ 4.* Sinifdə 22 qız və 18 oğlan var. Bir nəfər şagirdi nümayəndə kimi seçmək lazımdır. Bunu neçə üsulla etmək olar?

Həlli: Bir qızı seçmək üçün 22 üsul, bir oğlanı seçmək üçün 18 üsul tətbiq etmək lazımdır. Onda bir nəfəri seçmək üçün (22+18=40) üsul tətbiq olunmalıdır.

VI sinifdə ehtimal məzmun xətti davam etdirilir. Belə ki, əvvəlki siniflərdə öyrənilənlər təkrar edilir: təsadüfi hadisə, mütləq hadisə, mümkün olmayan hadisə, azehtimallı hadisə. Burada yeni vəzifə - şagirdlərdə iki və daha çox hadisənin başvermə ehtimalını qiymətləndirmə bacarığını formalaşdırmaqdan ibarətdir. Seçilən məsələlər bilavasitə həyatla bağlı olmalıdır. Şagirdlər həm həyat təcrübələrindən, həm də intuisiyadan istifadə etməyi bacarmalıdırlar.

*Məsələ 5.* Mağazadan alınmış televizorun 2 il qarantiyası var. Aşağıdakı hadisələrdən hansı mümkün deyil, təsadüfidir, mütləqdir?

televizor bir il ərzində xarab olmur;

televizor iki il ərzində xarab olmur;

iki il ərzində televizoru təmir etməyə ehtiyac olmayacaq;

televizor 3-cü ildə xarab olur.

Bu məsələnin məzmununa əsasən ilk iki hadisə təsadüfi hadisədir, çünki zavodun qarantiyası o demək deyil ki, televizor iki il ərzində xarab olmur. Lakin onu da nəzərə almaq lazımdır ki, televizor istehlakçının təqsirindən xarab ola bilər. Dördüncü hadisə təsadüfi hadisədir. Çünki hökm etmək olmaz ki, televizor qarantiya vaxtından sonra xarab olacaq.

İlk iki hadisə təsadüfi olsa da, onlardan biri çoxehtimallı, digəri isə azehtimallı hadisədir. Hadisələri fəqləndirmək qabiliyyətini formalaşdırmaq üçün aşağıdakı tipli çalışmalardan istifadə etmək olar:

sizə saat 6-dan 7-yə qədər heç kim zəng etməz;

sizə saat 8-dən 9-a qədər kimsə zəng edəcək;

sizə axşam saat 10-dan 11-ə qədər kimsə zəng edəcək;

sizə axşam saat 10-dan 11-ə qədər heç kim zəng eləməz.

Bu suallara veriləcək cavabların müxtəlifliyi həm də cavab verənin fərdi xüsusiyyətindən asılıdır.

I halda ehtimal yüksəkdir, ona görə onu mütləq hesab etmək olar.

II halda hadisə azehtimallıdır.

III halda ehtimal çoxdur.

IV halda ehtimal azdır.

Qeyd etdiyimiz kimi, ehtimala aid aparılan sınaqlara eksperiment də deyilir. Məsələn, zər daşının, metal pulun və ya iki üzü olan digər dairəvi əşyanın havaya atılması və nəticələrin hesaba alınması. Eksperimentin nəticələri cədvəldə qeyd olunur.

Eksperiment – tapşırıqları nəzərdən keçirək:

*Tapşırıq 1.* Zər daşını 20 dəfə atın və alınan halları cədvəldə qeyd edin. Hansı hallara daha tez-tez və hansı hallar gec-gec təsadüf olunur.

*Tapşırıq 2.* 20 qəpiklik pulu 30 dəfə atın və alınan nəticələri qeyd edin. Pulun hansı üzü daha çox düşür? Onların nisbətini tapın və faizlə ifadə edin.

Aparılan eksperimentdən sonra statistik tezlik və təsadüfi hadisənin ehtimalı anlayışları verilir. Havaya atılan pulun 43 tərəfinin və "gerb" tərəfinin bir hadisə kimi başvermə tezliklərini tapırıq. Məsələn: bizim misalda pulun üz tərəfinin tezliyi 12/20 və "gerb" üzünün tezliyi 8/20 olmuşdur. Eksperimentin təkrarlanması nəticəsində yuxarıda qeyd etdiyimiz nisbətlərin qiymətləri bir-birinə yaxınlaşır. Deməli, eksperimentlərin sayını artırdıqca tezliyin qiyməti hər hansı bir R ədədi ətrafında "oynayır" və həmin ədədə verilmiş hadisənin ehtimalı deyilir. Məsələn, yuxarıdakı misalda $R \approx 0,5$ olur və bu da təsadüfi hadisənin ehtimalını göstərir.

Riyaziyyatda hadisənin ehtimalı latın əlifbasının R hərfi ilə işarə olunur. Mümkün iki hadisədən birini A ilə, digərini B ilə işarə etsək, onda: R(A)=0,5; R(B)=0,5 yazmaq olar.

Bəzən, ehtimalları faizlə də ifadə edirlər: R(A)=50%; R(B)=50%.

Hər bir eksperimentdə nəzərdə tutulan hadisələrin tezliyi aşağıdakı düsturla hesablanır:

$$\alpha = \frac{\text{baş verən hadisələrin sayı}}{\text{eksperimenlərin sayı}}$$

Əgər eksperimentlərin sayı – m, baş verən hadisələrin sayı – n olarsa, onda:

$$\alpha = \frac{n}{m}, \text{burada n} \leq \text{m}$$
$$0 \leq \alpha \leq 1$$

Eksperimentdən əlavə, elə məsələlərdə olur ki, hər hansı hadisənin baş verməsi qiyməti verilir və bu hadisənin ehtimalını hesablamaq tələb olunur.

Məsələn, 200 eyni məmulatdan 4 dənəsi standart olmaya bilər. Standart olmayan məmulatın alınması ehtimalını hesablayın.

$$R(A) = \frac{4}{200} = \frac{1}{50} = 0{,}02$$

Keçirilmiş eksperimentə aid cədvəllərin tərtib edilməsi nəticəsində şagirdlər statistik verilənlərlə (statistik verilənlərin təqdimatı, nəticələrin çıxarılması və s.) işləmək vərdişləri qazanırlar. Burada həmçinin cədvəllərin tərtib edilməsi, oxunması da həmin işin məzmununa aiddir.

Mürəkkəb cədvəllərlə işə daha çox diqqət yetirmək lazımdır. Məsələn, idman yarışına aid turnir cədvəli. Burada iştirakçılar, keçirilən oyunların sayı, yığılan xallar və s. ayrılıqda qeyd olunur.

Beləliklə, biz bu məqalədə V-VI siniflərdə statistika və ehtimala aid zəruri anlayış və terminləri, məsələ həlli nümunələrini qeyd etdik.

Ehtimala aid məsələlərin didaktik üstünlüyü ondan ibarətdir ki, şagird hər hansı bir məsələnin konkret cavabını deyil, çoxvariasiyalı həlləri araşdırmaqla, zəruri olan həlli (cavabı) tapmağa çalışır. Mühakimə oblastı geniş olduğundan şagird çoxlu variantları müəyyən etməli, onları müqayisə etməli və zəruri olan hadisə və ya faktları seçməyi bacarmalıdır.

**Problemin aktuallığı.** Hazırkı dövrdə bütün məktəb və universitetlərdə statistika və ehtimala aid nəzəri mövzuların keçirilməsi, bu mövzuya qarşı müxtəlif məsələlərin şagirdlərə tətbiqidir.

**Problemin elmi yeniliyi** şagirdlərin statistika və ehtimal nəzəriyyəsi elementləri ilə məsələ həlli vasitəsilə tanış edilməsi onların VI sinifdə tətbiq etmək məntiqi mühakimə yürütmək və əqli nəticə çıxarmaq bacarığını yüksəltməkdir.

**Problemin praktik əhəmiyyəti.** Statistika və ehtimala aid məsələlərin didaktik üstünlükləri, şagirdlərin məsələlərin çoxvariasiyalı həlləri araşdırmaqla, zəruri olan həlli (cavabı) tapmağa çalışdırmaq.

**Ədəbiyyat:**

1. Adıgözəlov A.S. Orta məktəbdə riyaziyyatın tədrisi metodikası: Ali pedaqoji məktəb tələbələri üçün dərs vəsaiti. / A.S. Adıgözəlov. -Bakı: ADPU, -2006.
2. Əmirova R.A. Ehtimal nəzəriyyəsi və riyazi statistika elementləri (metodik vəsait). -Bakı, 2002.
3. Cəfərli E.V. Riyaziyyatın tədrisi metodikasının həyatla əlaqələndirilməsi. -Gəncə: GDU, -2018.
4. Orta məktəb dərslikləri. -2020.

**E-mail:** esmiraceferli@gmail.com
**Rəyçilər:** *dos.* **Ü.İ. Əfəndiyev,**
*dos.* **S.M. Zeynallı**
**Redaksiyaya daxil olub:** 02.03.2023

***KİMYANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ХИМИИ***
***METHODS OF TEACHING CHEMISTRY***

*UOT 372.854*

***Yasin Nağı oğlu Babayev***
*kimya elmləri doktoru, professor,*
*Əməkdar müəllim*
*Naxçıvan Dövlət Universiteti*

***Nigar Yasin qızı Babayeva***
*kimya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*
*ORCİD İD:0000-0001-8954-7210*

## KİMYANIN ZEHİN XƏRİTƏSİ ÜSULU İLƏ TƏDRİSİNDƏ DİDAKTİK FƏNDLƏRDƏN İSTİFADƏ

***Ясин Наги оглы Бабаев***
*доктор химических наук, Заслуженный учитель, профессор*
*Нахчыванский Государственный Университет*

***Нигяр Ясин гызы Бабаева***
*доктор философии по химии, старший преподаватель*
*Азербайджанского Государственного Педагогического Университета*

## ИСПОЛЬЗОВАНИЕ ДИДАКТИЧЕСКИХ ПРИЕМОВ ПРИ ОБУЧЕНИИ ХИМИИ МЕТОДОМ ИНТЕЛЛЕКТ-КАРТЫ

***Yasin Naghı Babayev,***
*doctor of chemistry sciences, Honored teacher*
*professor of Nakhchivan State University*

**Nigar Yasin Babayeva**
*doctor of philosophy in chemistry,*
*senior lecturer at Azerbaijan State Pedagogical University*

## THE USE OF DIDACTIC TECHNIQUES IN THE TEACHING OF GHEMISTRY BY THE BRAIN MAP METHOD

**Xülasə.** Orta ümumtəhsil məktəblərində kimyanın zehin xəritəsi üsulu ilə tədrisində didaktik fəndlərdən istifadə məsələləri araşdırılmışdır. Göstərilmişdir ki, 6 bənddən ibarət olan didaktik fəndlərin içərisində ən əhəmiyyətlisi və bütün fənlərin tədrisində tətbiq oluna biləni dərsdə problem situasiyanın yaradılması və dərsin gedişinin problemin həllinə yönəldilməsidir. Fənnin səciyyəvi xüsusiyyətlərinə görə kimyanın tədrisində problem vəziyyəti yaratmaq və yerindəcə aparılan təcrübi işlərlə problemi (çətinliyi) aradan qaldırmaq üçün geniş imkanlar vardır. Qeyd olunmuşdur ki, kimyadan təcrübi məşğələlərin aparılması zamanı yaranan problem situasiyanın konkret kimyəvi reaksiyaların nəticələri əsasında aradan qaldırılması və həqiqətin praktiki olaraq öz təsdiqini tapması şagirdlərin kimyaya, təcrübi tədqiqatların aparılmasına marağını, yaradıcı düşüncəsini, çətinlikləri aradan qaldırma qabiliyyətini artırır.

Müəyyən edilmisdir ki, kimya təlimində zehin xəritəsi üsulunun tətbiqi didaktik fəndlərdən səmərəli istifadə üçün geniş imkanlar açır.

***Açar sözlər:*** *didaktik fənd, zehin xəritəsi, əks əlaqə, öyrədən, öyrənən, metod, xəyal gücü, yaradıcı düşüncə*

**Резюме.** Исследованы вопросы использования дидактических приемов при обучении химии методом интеллект-карты в средних общеобразовательных школах. Было показано, что среди дидактических приемов, состоящих из 6 пунктов, наиболее значимым и применимым к обучению всех предметов является создание проблемной ситуации на уроке и ориентация хода урока на решение проблемы. Благодаря характерным особенностям предмета, в преподавании химии имеются широкие возможности для создания проблемной ситуации и устранения проблемы (затруднения) экспериментальными работами, проводимыми на месте. Отмечено, что устранение проблемной ситуации, возникающей при проведении экспериментальных занятий по химии на основе результатов конкретных химических реакций и практическое подтверждение факта повышает интерес учащихся к химии, проведению экспериментальных исследований, их творческое мышление, способность преодолевать трудности. Было установлено, что применение метода интеллект-карты в обучении химии открывает широкие возможности для эффективного использования дидактических приемов.

***Ключевые слова:*** *дидактический прием, интеллект (ментальная) карта, обратная связь, обучающий, обучаемый, метод, воображение, творческое мышление*

**Summary.** The issues of using didactic techniques in the teaching of chemistry by the brind map method in secondary general education schools were investigated. It has been shown that the most important of the didactic techniques consisting of 6 points and the one that can be applied in the teaching of all subjects is the creation of a problem situation in the lesson and directing the course of the lesson to the solution of the problem. According to the specific features of the subject, there are ample opportunities to create a problem situation in the teaching of chemistry and eliminate the problem (difficulty) with experimental work carried out on the spot. It has been noted that eliminating the problem situation arising during practical chemistry exercises based on the results of specific chemical reactions and finding the affirmation in practice increases students' interest in chemistry, conducting experimental research, creative thinking, and the ability to overcome difficulties.

It has been determined that the application of the brind map method in the teaching of chemistry creates wide opportunities for effective use of didactic techniques.

***Key words:*** *didactic technique, brain map, opposite relation, teacher, learner, method, imagination, creative thinking*

*I.* ***Didaktika haqqında.*** Təlimi və təhsili nəzəri, daha ümumi səviyyədə tədqiq edən pedaqoji fənn ***didaktika*** adlanır. Buradan məlum olur ki, didaktika təlimin pedaqoji nəzəriyyəsi olub, onun məzmunu, metodları və təşkili formaları barədə *elmi əsaslandırma* verir. Bu və ya digər fənnin tədrisi xüsusiyyətlərinə uyğun olaraq qeyd edilən məsələlərə xüsusi metodikalar tətbiq edilir. Bununla bərabər istənilən metodika özünəməxsus tədqiqat predmetinə malikdir. Metodika müvafiq fənn üzrə bilik, bacarıq və vərdişlər sisteminin nəzəri əsaslarının müəyyənləşdirilməsini, həmçinin tədris prosesinin təşkili metodlarını və formasını işləyib hazırlayır.

Hər bir fənn üzrə metodika özündə təhsilverici, tərbiyələndirici və inkişafetdirici vəzifələri əks etdirir. Həmin məsələlər, eyni zamanda, didaktikanın predmetini təşkil edir. Fənlərin tədrisi metodikaları ilə didaktika arasında qarşılıqlı təsir və üzvi əlaqə mövcuddur; fənlərin tədrisi metodikası təlimin məzmunu, prinsip, metod və vasitələrini verilən fənn üzrə öyrənib müəyyənləşdirir, didaktika isə fənlərin tədrisi metodikasına dair həmin materiallardan müvafiq nəticələr çıxararaq, bütün fənlərin tədrisi üçün ümumi olan təlim prinsiplərini və metodlarını konkretləşdirir, bu barədə ümumi qanunauyğunluqlar və müddəalar formalaşdırır.

Didaktika yunanca didakticos *(öyrədən)* və didasko *(öyrənən)* sözlərindən götürülmüşdür. Didaktikanın inkişafında alman pedaqoqu Adolf Disterveq (1790-1866) özünəməxsus rol oynamışdır. Onun fikrincə, didaktikanın inkişafetdirici və tərbiyələndirici xarakteri xüsusi olaraq diqqəti cəlb edir. Disterveqə görə, təlim prosesi təhsilalanın təkcə zehni qüvvələrini inkişaf et-

dirməklə kifayətlənməyib, həm də onlarda nəcib sifətlər, yüksək mənəvi duyğular, qüvvətli xarakter və möhkəm əqidə formalaşdırır. O, təlimdə əyaniliyin, sistemlilik, ardıcıllıq və şüurluluğun rolunu qiymətləndirir, müəllimin şəxsiyyətinə yüksək tələblər irəli sürürdü. Görkəmli Azərbaycan pedaqoqu Abbasqulu ağa Bakıxanov isə biliklərin konkret, dəqiq və aydın olması ideyasını irəli sürür, təhsilalanlara öz biliklərinə tənqidi yanaşmağı məsləhət görürdü.

*II. Kimya təlimində zehin xəritəsi üsulu və didaktik fəndlər.* Orta ümumtəhsil məktəblərində kimya dərslərinin səmərəliliyinin artırılması və keçilən materialların şüurlu surətdə mənimsənilməsi üçün klassik, müasir və hibrid tipli təlim üsulları ilə yanaşı, tədris prosesində böyük əhəmiyyət daşıyan və bununla bərabər fənn müəllimlərindən pedaqoji ustalıq tələb edən didaktik fəndlərdən istifadə edilməsi, həmçinin məqsədəuyğun hesab edilir [2].

Akademik M. Mehdizadə tərəfindən ümumi pedaqoji aspektdə irəli sürülərək əksər fənlərə, xüsusən təbiətşünaslıq fənlərinə şamil edilə bilən didaktik fəndlərdən kimya dərslərində də istifadə edilməsi şagirdləri dərs zamanı düşünməyə, müqayisələr, ümumiləşdirmələr aparmağa, müstəqil olaraq nəticələr çıxarmağa sövq etməklə onların təşəbbüskarlığını və əqli keyfiyyətlərini artırır, yaradıcılıq qabiliyyətini inkişaf etdirir. Burada "ümumi pedaqoji aspekt" dedikdə nəzərdə tutulan didaktik fəndlərdən kimya daxil olmaqla bütün fənlərin, xüsusən tətbiqi xarakterli təbiətşünaslıq fənlərinin (fizika, coğrafiya, mineralogiya, botanika, zoologiya, kimya) tədrisində istifadə oluna bilməsi nəzərdə tutulur. Qeyd edilən didaktik fəndlərə aşağıdakıları nümunə göstərmək olar:

1. Dərsin əvvəlində problem situasiyanın yaradılması və onun gedişinin problemin həllinə yönəldilməsi.
2. Təlim prosesinin fərdiləşdirilməsi, yəni şagirdlərin fərdi maraq və tələbatının nəzərə alınması, öz qabiliyyətlərini gerçəkləşdirməyə, onların azadlıq və təşəbbüskarlığına geniş imkanlar verilməsi.
3. Müəllim və şagirdlər arasında qarşılıqlı əməkdaşlığın, əks əlaqənin yaradılması.
4. Şagirdlərin emosional-şəxsi keyfiyyətlərindən fəal istifadə olunması.
5. Tədris prosesində təlimin müasir texniki vasitələrindən istifadə.
6. Tədris prosesinin intensivləşdirilməsi.

Göstərilən didaktik fəndlər içərisində ən əhəmiyyətlisi dərsin əvvəlində problem situasiyanın yaradılması və dərsin gedişinin problemin həllinə yönəldilməsidir.

Tədris prosesində şagirdlərin təfəkkürünü inkişaf etdirmək, müstəqilliyini artırmaq, biliklərin şüurlu surətdə və dərindən mənimsənilməsinə nail olmaq, tam fəallığını təmin etmək məqsədilə problem situasiyası yaradılır. Terminoloji mənada problem öz həllini tələb edən nəzəri, yaxud praktiki məsələ deməkdir. Situasiya, elmi müşahidə və müzakirə yolu ilə nəzəri və əməli əhəmiyyətli biliklərin müəyyən sistemə salınması və anlayışların formalaşdırılması zərurətini doğuran prosesdir.

Problemlər müxtəlifdir: elmi, ümumbəşəri (qlobal), regional problemlər, ayrı-ayrı vətəndaşlara, insan qruplarına aid olan problemlər, təlim problemləri və s. Baxılan halda isə təhsildə problemli situasiya (vəziyyət) haqqında müzakirə aparıldığından bu, təlimi problem adlanır. Təbiidir ki, bütün problemlər müəyyən çətinlik anlayışı ilə bağlıdır. Təlimi problem ən müxtəlif fənlərin, o cümlədən kimya fənninin tədrisində yarana bildiyindən ümumi xarakter daşıyır və başlıca didaktik fəndlərdən hesab edilir. Xatırladaq ki, kimya dərslərində problem vəziyyəti yaratmaq üçün geniş imkanlar vardır.

Orta məktəblərdə tədris prosesində təlimi problem çox vaxt müəllim tərəfindən qəsdən, şüurlu surətdə yaradılır, əvvəlcədən planlaşdırılır və şagirdlərin düşünmə qabiliyyətini, çətinliklərdən çıxa bilmə bacarıqlarını inkişaf etdirmək məqsədini güdür. Problem situasiya müəllim tərəfindən, adətən, dərsin əvvəlində yaradılır ki, onun həlli qısa müddət (45 dəqiqə) ərzində başa çatsın. Kimya tədrisi prosesində problem situasiyası yaratmaq üçün müəllim sinif qarşısında problem xarakterli sualları, tədqiqat xarakterli məsələləri plana uyğun şəkildə qoyur və lazım gəldikdə şagirdlərə yönəldici, istiqamətverici suallarla köməklik göstərir. Mümkündür ki, tədris prosesində laborator təcrübələri yerinə yetirərkən özbaşına problem situasiya yaransın. Bu halda müəllimdən dərin savad və böyük ustalıq tələb olunur ki, keçilən dərs müddətində qarşıya çıxan problem öz həllini tapa bilsin.

Kimyanın tədrisində zehin xəritəsi üsulundan [1] istifadə zamanı didaktik fəndlərdən istifadə üçün daha geniş imkanlar açılır. Çünki həm fənn müəllimi, həm də hər bir şagird tərəfindən fərdi olaraq zehin xərətəsinin qurulması və ondan tədris prosesində istifadə xəyal gücünü artırır, yaradıcı düşüncəni inkişaf etdirir, yaddaşı möhkəmləndirir və beyin yarımkürəciklərinin harmoniyasını təmin edir. Qeyd edək ki, zehin xəritələri keçilən mövzunu, onun müəyyən bitmiş hissəsini öyrəndikdən sonra təkrar üçün əvəzsiz bir əyləncəli vasitədir. Yuxarıda sadalanan didaktik fəndlər təhsil islahatının prinsiplərinin və interaktiv təlimin tələblərinin tədris prosesinə tətbiqi nəticəsində Azərbaycanın kimyaçı pedaqoqları tərəfindən formalaşdırılmışdır [2].

Onların fikrincə, problemli təlim anlayışının əhatə dairəsi geniş olub, həm şagirdin müəyyən çətinliklə qarşılaşdırılmasını, həm də çətinliyin aradan qaldılmasını tələb edir. O, şagirdləri həm düşündürmək, həm də gərgin zehni fəaliyyətə təhrik etmək məqsədini daşıyan başlıca didaktik fəndlərdən biridir.

Orta ümumtəhsil məktəbinin IX sinfinin kimya dərsində müəllim tərəfindən problem situasiyanın yaradılması və birgə səylə problemin aradan qaldırılmasını nəzərdən keçirək. Təsəvvür edək ki, müəllim şagirdə kimya laboratoriyasında hidrogenin alınması və onun reduksiyaedicilik xassələrinin yoxlanılması tapşırığını vermişdir. Şagird müəllimə cavab verir ki, laborator şəraitində hidrogenin alınması üçün ən münasib yol dənəvər şəklində olan sink metalına duru xlorid, yaxud sulfat turşusu ilə təsir etməkdir. Hidrogenin reduksiyaedicilik xassəsini yoxlamaq üçün onu probka vasitəsilə sınaq şüşəsinə keçirilmiş nazik şüşə borunun ucunda yandırırlar. Nisbətən çox miqdar hidrogen almaq üçün adətən Kip aparatından istifadə olunur. Şagird qeyd edir ki, hidrogenin reduksiyaedicilik xassələrinin yoxlanılması üçün müxtəlif oksidləşdiricilərdən, məsələn oksigen, kükürd, xlor, azot, mis-2 oksid, kalium permanqanat və s.-dən istifadə etmək olar. Laboratoriya şəraiti üçün ən münasib üsul isə kalium permanqanatın duru məhlulundan istifadə olunmasıdır. Müəllimin razılığı və köməyi ilə şagird kiçik stəkanda kalium permanqanatın duru məhlulunu hazırlayır, Kip aparatını qoşaraq məhlulun içərisindən 15-20 dəqiqə ərzində hidrogen qazı buraxır. Heç bir reaksiyanın və rəngsizləşmənin baş vermədiyi məlum olur. Müəllim şagirdə bir neçə istiqamətləndirici sual verir:

- Hidrogen molekul halında daha qüvvətli reduksiyaedicidir, yoxsa atom halında?

Şagird:

- Atom halında.

- Atom halında hidrogeni hansı yolla alıb məhlulun içərisindən buraxmaq olar?

Şagird çətinlik çəkdiyini bildirir və qeyd edir ki, göstərilən reaksiya üzrə hidrogen atomları alındığı anda cüt-cüt birləşib $H_2$ molekulları əmələ gətirir.

Müəllim növbəti istiqamətləndirici sualı verir:

- Bəs permanqanat məhlulunun içərisində hidrogeni atomar halda alsaq necə?

Bu sual şagirdə çox maraqlı və yerinə yetirilə bilən görünür. Təcrübənin yerinə yetirilməsinə isə şagirdlərin marağı daha da artır. Müəllimin köməyi ilə yenidən təcrübə aparılır: kimyəvi stəkanda 50 ml miqdarında kalium permanqanat məhlulu hazırlanır. Məhlula 3-4 ədəd dənəvər sink salınır, məhlul 3-4 ml duru sulfat turşusu ilə turşulaşdırılır. Get-gedə şiddətlənən reaksiya nəticəsində 15-20 dəqiqə ərzində bənövşəyi rəngli kalium permanqanat məhlulu rəngsiz mangan 2 - sulfat məhluluna çevrilir. Başqa sözlə, kalium premanqanat reduksiya olunur, hidrogen atomları isə oksidləşir, yəni reduksiyaedici xassə göstərir.

Reaksiyanın tənliyi:



$$2KMnO_4 + 10H + 3H_2SO_4 = 2MnSO_4 + K_2SO_4 + 8H_2O$$

Beləliklə, kimya müəllimi tərəfindən yaradılan problemli situasiya öz həllini tapmış oldu.

Yuxarıda göstərilən və 6 bənddən ibarət olan didaktik fəndləri 2 qrupa bölmək olar.

Birinci qrupa təhsil islahatının əsas prinsiplərini və interaktiv təlimin başlıca tələblərini özündə ehtiva edən aşağıdakı didaktik fəndlər aiddir:

- dərsdə problem situasiyanın yaradılması və onun şagirdlərlə birgə həlli;
- təlim prosesinin fərdiləşdirilməsi, yəni şagirdlərin fərdi maraq və tələbatının nəzərə alınması;
- müəllim və şagirdlər arasında əməkdaşlığın, əks əlaqənin təmin olunması;

- tədris prosesində şagirdlərin emosional - şəxsi keyfiyyətlərindən fəal istifadə edilməsi.

İkinci qrupa tədris prosesində təlimin müasir texniki vasitələrindən istifadə və tədris prosesinin intensivləşdirilməsi didaktik fəndləri aid edilə bilər. Əslində bu qrup fəndlər əksər hallarda [2], didaktik fəndlərə aid edilmir və təlim metodlarını əsaslı olaraq təkmilləşdirmək və keçilən dərslərin səmərəliliyini yüksəltmək məqsədini güdür. Həqiqətdə isə birinci qrupa aid edilən didaktik fəndlərdən dərs prosesində istifadəni artırdıqca şagirdlərin müstəqil zehni işlə məşğul olmalarına, tədris materiallarının tam həcmdə keçilməsinə və get-gedə yenilənən elmi-texniki bilikləri mənimsəmələrinə az vaxt qalır.

Müasir dövrün tələbatına uyğun səviyyədə təbiətşünaslıq, o cümlədən kimya dərslərinin təşkili və keçilməsində müxtəlif didaktik fəndlərdən istifadə ilə yanaşı, təlimin texniki vasitələrinin (radio, televiziya, maqnitofon, kompüter texnologiyası, kinofilmlər, kimyəvi istehsal proseslərinin texnoloji sxemləri və s.) tətbiqi böyük əhəmiyyət kəsb edir. Bu qayda ilə şagirdlərin təbiət hadisələrini, kimyəvi proseslərin mahiyyəti və mexanizmini dərk etməyə meyli və marağı artır, bir sıra kimyəvi prosesləri şagirdlərin vizual olaraq müşahidə etməsi təmin olunur. Göstərilən amillərə görə müasir təbiət elmləri dərslərini yüksək səviyyədə təchiz olunmuş kabinə, laboratoriya və texniki vasitələr olmadan təsəvvür etmək qeyri-mümkündür.

Orta ümumtəhsil məktəblərində təlim metodlarını təkmilləşdirmək və dərslərin səmərəliliyini yüksəltməyin başlıca yolu tədris prosesinin intensivləşdirilməsidir. Bunun üçün dərsə ayrılan 45 dəqiqədən həm müəllim, həm də şagirdlər tərəfindən səmərəli istifadə olunmalıdır. Burada öyrətmə və öyrənmə məhsuldarlığı da xüsusi rol oynayır. Çünki bütün canlı orqanizmlər, xüsusən insanlar üçün genetik xarakter daşıyan "tənbəlləşmə" amili oxuyub-öyrənmək üçün normadan artıq vaxt və enerji sərf etməyə maneçilik törədir [3]. Analoji fikirlərə başqa ədəbiyyat mənbələrində də rast gəlinir [4]. Müəlliflərin fikrincə, orta ümumtəhsil məktəblərində kimyəvi biliklərin mənimsənilməsində əsas çətinlik törədən amillərdən biri də dərslik və digər ədəbiyyat mənbələrindəki müvafiq materialların çətin və iri həcmli olmasıdır. Göstərilmişdir ki, kimyanın simvolik dilinin, müvafiq reaksiyaların, əsas kateqoriya və anlayışların asanlıqla əlçatan olması mümkün problemlərin həllini asanlaşdıra bilər.

Orta ümumtəhsil məktəblərində kimya fənninin tədrisində tətbiq olunması tövsiyə edilən təlimin texniki vasitələrindən istifadə və tədris prosesinin intensivləşdirilməsi didaktiv fəndləri dərslərin səmərəliliyinin hər vasitə ilə artırılması məqsədini daşıyır. Qeyd edək ki, qədim zamanlardan bəri istifadə olunan xəritələr içərisində hazırlanma üsuluna və istifadə istiqamətlərinə görə digərlərindən fərqlənən zehin xəritələri həm təlimin yeni, orijinal texniki vasitəsi, həm də tədris prosesinin intensivləşdirilməsi vasitəsi kimi tətbiqi əhəmiyyətlərə malikdir. Zehin xəritələrinin həm müəllim, həm də şagirdlər tərəfindən fərdi qaydada hazırlanması və onlardan istifadə yaradıcı düşüncəni inkişaf etdirdiyinə, yaddaşı möhkəmləndirdiyinə, hafizəni itilədiyinə görə həm öyrənmə, həm də öyrətmə vasitəsi kimi tədris prosesinə sanballı töhfədir. Zehin xəritələri tədris olunan fənnin müəyyən bir bölməsini, keçilən mövzunu, onun müəyyən bir bitmiş hissəsini oxuyub öyrəndikdən sonra təkrar üçün mükəmməl bir vasitədir. Çünki bu xəritələr canlı, parlaq rənglərlə özəl olaraq rəsmləndirilən, şagirdi yormayan əyləncəli bir vasitədir.

Təbiətşunaslıq fənlərinin tədrisi zamanı müəllim tərəfindən yaradılan, yaxud spontan (özbaşına) olaraq yaranan problemli situasiya təcrübə nəticələri, yaxud təcrübi faktorlar əsasında həll edilir. Orta ümumtəhsil məktəblərində kimya fənninin tədrisində isə, bir sıra hallarda, laboratoriya məşğələsi zamanı mübahisə doğuran məsələyə təcrübi faktlarla dərs saatı müddətində aydınlıq gətirilməsi mümkündür. Ümumi halda didaktika öyrədən-öyrənən (müəllim-şagird) münasibətlərini əhatə etdiyindən göstərilən didaktik fəndlərdən, müvafiq fənlərin tədrisi metodikasının səciyyəvi xüsusiyyətləri nəzərə alınmaqla istifadə oluna bilər.

**Problemin aktuallığı.** Tədris prosesində şagirdlərdə mövzuya dair tamlığın və bütövlüyün təmin edilməsi, şagirdlərin kimya fənninə olan marağının artırılması, biliklərin tam mənimsənilməsi texnologiyasının təmin edilməsi problemin aktuallığıdır.

**Problemin elmi yeniliyi.** Orta ümumtəhsil məktəblərində kimya fənninin tədrisində tətbiq olunması tövsiyə edilən təlimin texniki vasitələrindən istifadə və tədris prosesinin intensivləşdirilməsi di-

daktiv fəndləri dərslərin səmərəliliyinin hər vasitə ilə artırılması məqsədini daşıyır.

**Problemin praktik əhəmiyyəti.** Məqalə doktorant, dissertant, magistrant və müəllimlər üçün faydalı ola bilər.

**Ədəbiyyat:**


1. Babayeva N.Y, Babayev Y.N. İnteraktiv (fəal) təlim və zehin xəritələri / "Regional inkişafın təmin olunmasında innovativ tendensiyalar "Respublika elmi konfransının materialları. MDU, Mingəçevir, 11-12 dekabr 2020, s. 410-412
2. Əliyev, R.Y. Kimyanın tədrisi metodikası (Ümumi məsələlər). Ali məktəblər üçün dərslik. / R.Y. Əliyev., Ə.T. Əzizov. -Bakı: BDU-nun nəşriyyatı, -2006, -394 s.
3. Babayev Y.N., Hüseynov H.T. Canlı orqanizmlərdə "tənbəlləşmə" amilləri haqqında. Heydər Əliyevin anadan olmasının 96-cı ildönümünə həsr olunmuş "Müasir təbiət və iqtisad elmlərinin aktual problemləri" beynəlxalq elmi konfransının materialları. 02-03 may 2019, II hissə, Gəncə ,2019, s. 110-113
4. Cəfərov Yasin, Ağayeva Aytac, Paşayeva Arzu. Kimyanın tədrisində anlayışların formalaşdırılmasının didaktik imkanları/"Kimyanın aktual problemləri" II Respublika elmi konfransının materialları. NDU, 2022, s. 57-60


**E-mail**: prof.ybabayev1948@gmail.com
babayevanigar1979@gmail.com
**Rəyçilər:** *kimya.ü.fəls.dok., dos.* **R.M. Ağayeva**
*kimya.ü.fəls.dok.* **G. N. İsmayılova**
**Redaksiyaya daxil olub:** 26.01.2023.

*UOT 372.854*

***Kamil Nəsir oğlu Haqverdiyev,***
*kimya üzrə fəlsəfə doktoru, dosent*
*Bakı Dövlət Universiteti*

***Aygün Aydın qızı Balakişiyeva,***
*Bakı Dövlət Universiteti*

***Xəlil Camal oğlu Nağıyev,***
*Bakı Dövlət Universiteti*

***Esmira Ramiz qızı Rəsulova,***
*Bakı Dövlət Universitetinin müəllimi*

# AKMEO-ELEKTİV ANLAYIŞLAR VASİTƏSİLƏ KİMYA DƏRSLƏRİNİN TƏŞKİLİ

***Камиль Насир оглу Ахвердиев,***
*доктор философии по химии, доцент*
*Бакинский Государственный Университет*

***Айгюн Айдын гызы Балакишиева,***
*Бакинский Государственный Университет*

***Халил Джамал оглу Нагиев,***
*Бакинский Государственный Университет*

***Эсмира Рамиз гызы Расулова***
*преподаватель Бакинского Государственного Университета*

# ОРГАНИЗАЦИЯ УРОКОВ ХИМИИ ЧЕРЕЗ АКМЕО-ЭЛЕКТИВНЫЕ КОНЦЕПЦИИ

***Kamil Nasir Haqverdiyev***
*doctor of philosophy in chemistry, assistant professor*
*Baku State University*

***Aygun Aydın Balakishiyeva,***
*Baku State University*

***Khalil Jamal Nagiyev,***
*Baku State University*

***Esmira Ramiz Rasulova,***
*teacher at*
*Baku State University*

# ORGANIZATION OF CHEMISTRY LESSONS THROUGH ACMEO-ELECTIVE CONCEPTS

**Xülasə.** Elektiv anlayış müəllimin öz fənnini daha dərindən bilməsini və peşəkarlığını akmeo-inkişafını təmin edir. Elektiv anlayışın inkişafı artıq şagirdlərin kimya fənninə qarşı marağın yaranmasında əhəmiyyətli təsiri vardır.

***Açar sözlər**: pedaqoji proses, elektiv anlayışlar, təhsilin akmeologiyası, akmeoloji yanaşma, müəllim peşəkarlığı, elektiv anlayışların pedaqoji prosesə təsiri, akmeo-peşəkarlığın artırılması yolları, şagirdlərin mənimsəmə qabiliyyətinin artırılması*

**Резюме.** Элективная концепция обеспечивает учителю более глубокое знание своего предмета и акмео-развитие его профессионализма. Разработка элективной концепции уже оказывает существенное влияние на интерес учащихся к химии.

***Ключевые слова:** педагогический процесс, элективная концепция, акмеология образования, акмеологический подход, профессионализм учителя, влияние, элективных понятий на педагогический процесс, пути повышения акме-профессионализма, повышение способности учащихся усваивать*

**Summary.** Elective concept provides the teacher with deeper knowledge of his subject and acmeo-development of his professionalism. The development of the elective concept already has a significant effect on the students' interest in chemistry.

***Key words**: pedagogical process, elective understanding, acmeology of education, acmeological approach, teacher professionalism, influence of elective concepts on the pedagogical process, ways of increasing acme-professionalism, increasing students' ability to assimilate*

Kimya tədrisinin müasir səviyyədə tədrisi şagirdlərdə kimya elminə olan marağın artırılmasına üstünlük verməklə əldə olunan üsullardan, metodlardan geniş istifadə edilir. Təbiət elmlərinin öyrədilməsində akmeologiyanın böyük əhəmiyyəti vardır.

Akmeologiya nədir? "Akmeo" – zirvə, "logos" – elm deməkdir. Peşəkarlığın zirvəsinə doğru gedən yolları, üsulları, metodları, metodologiyaları və mexanizmləri öyrənən elmə akmeologiya deyilir.

Müəllimin kimya dərslərinin səmərəli təşkil edilib keçilməsində elektiv anlayışların rolu olduqca böyükdür. Elektiv anlayış dedikdə, elmi biliklərin təcrübi olaraq bu və ya digər sahələrdə istifadəsidir. Elektiv anlayışlar vasitəsilə kimyəvi biliklərin elmi sahələrdə və pedaqogikada pedaqoji prosesə tətbiq edilməsi müəllimin peşəkarlığının akmeo-inkişafından asılıdır. Həmçinin elektiv anlayış müəllimin öz ixtisasının daha dərindən bilməsini və eyni zamanda, peşəkarlığı akmeo-inkişaf etdirməsini tələb edir. Elektiv anlayışlar və elektiv kursların sırasına aşağıdakıları aid etmək olar: "gübrələrin sintezi və tətbiqi", "dərman maddələrinin sintezi və istifadəsi", "azotlu birləşmələrin istehsala və xalq təsərrüfatına tətbiq edilməsi", "partladıcı maddələrin istehsalı", "zəhərli maddələrin tətbiqi və onun sahələrinin genişləndirilməsi" kimi məsələlər həll edilir.

Məlum olduğu kimi, akmeo-peşəkarlıq müəllimin bütün pedaqoji prosesə tətbiq etdiyi üsul, metod və metodologiyalardan daha səmərəli istifadə edərək şagirdləri dərsdə və pedaqoji prosesdə fəal vəziyyətə gətirilərək elmsizlikdən elmi biliklərin inkişaf etdirməsinə doğru yönəldilməsidir. Müəllimin peşəkarlığı o zaman artırıla bilər ki, pedaqoji prosesdə istifadə edilən bütün üsul, metod və metodologiyalar öyrənənlərin inkişaf etməsinə səbəb olsun. Öyrənənlərlə öyrədənlər arasında işgüzar, sərbəst, məqsədyönlü fəaliyyət axtarılan səmərəli üsulların tapılması və asan yol ilə şagirdlərə öyrədilməsindən asılı olur. Elektiv anlayışların inkişaf etdirməsinin məqsədi ondan ibarətdir ki, qarşıya qoyduğumuz məqsədə çatmaq üçün bu anlayışların daha da genişləndirilməsi, ekstensiv və intensiv inkişaf etdirilməsi şagirdlərdə kimya elminə qarşı olan maraq və motivasiyanı artıraraq, kimyəvi biliklərin həm əldə edilməsi, həm də tətbiq edilməsini özündə ehtiva edə bilir. Müəyyən elektiv anlayışları başa düşülən şəklə salaraq şagirdlərdə interaktiv biliyin inkişaf etdirilməsinə nail oluruq. Məsələn: "azot və onun birləşmələri"nə elektiv anlayış tətbiq edərək "azotun təbiətdə dövranı", "azotun alınması", "azotun birləşmələrinin sintezi"ni məqsədyönlü şəkildə şagirdlərə çatdıraraq azotdan alınan dərman maddələrini, gübrələri, partladıcı maddələri, boyaq maddələrini, ardıcıl və sistemli olaraq şagirdlərin nəzərinə çatdırırıq.

*Azot və onun birləşmələrinin elektiv anlayışlar vasitəsilə tədrisi*

*Azot* (N) – Azot ilk dəfə 1772-ci ildə ingilis kimyaçısı D. Rezerford tərəfindən havadan ayrılmışdır. D.İ. Mendeleyevin kimyəvi elementlərin dövri sistemində 7-ci element olub, atom kütləsi 14-dür.

Azot dövranı havadakı azot qazı ($N_2$) ilə başlayır. Bəzi bitkilərdə yaşayan bakteriyalar havadakı azotu ammonyaka ($NH_3$) çevirirlər. Başqa növdən olan bakteriyalar isə ammonyakı nitrata ($NO_3$) çevirirlər (havadakı azotun ammonyaka çevrilməsində ildırımlar da mühüm rol oynayır). Sonrakı mərhələdə nitrat yaşıl bitkilər kimi qidasını özü hazırlayan canlılar tərəfindən udulur. İnsanlar və heyvanlardakı azotun yenidən təbiətə qayıtması isə bu canlıların tullantıları və ölülərinin bakteriyalar tərəfindən parçalanması nəticəsində həyata keçir. Bakteriyalar bu işi görərkən sadəcə təmizlik etmir, eyni zamanda azotun əsas mənbəyi olan ammonyakı da yenidən üzə çıxarırlar. Ammonyakın bir qismi başqa bakteriyalar tərəfindən karbona çevrilərək yenidən havaya qarışır, digər qismi isə başqa növ bakteriyalar tərəfindən nitrata çevrilir. Bunlardan bitkilər faydalanır və dövran beləcə davam edir.

Xarici səviyyənin ns2np3 elektron quruluşuna uyğun olaraq azot yarımqrupu elementləri birləşmələrində ən yüksək +5, ən aşağı –3 oksidləşmə dərəcəsi göstərir.

*Azotun alınması*

1. Laboratoriyada azotu ammonium-nitritin $NH_4NO_2$ və ammoniumdixromatın $(NH_4)_2Cr_2O_7$ termiki parçalanmasından, həmçinin mis (II) oksidin ammonyakla reduksiyasından almaq olur.

2. Sənayedə azot ($N_2$) maye havanın fraksiyalı distilləsindən alınır.

*Tətbiqi*. Tərkibində azot qida elementi olan gübrələrə azotlu gübrələr deyilir. Bitkilərin qidalanmasında azot xüsusi rol oynayır. O, xlorofil və zülalların tərkibinə daxildir. Bitkidə azot çatışmazlığı yaşıl kütlənin əmələ gəlməsini çətinləşdirir, bitkilər pis inkişaf edir və yarpaqları saralır. Bitkilər azotu onun birləşmələri, əsasən ammonium $(NH_4)^+$ və nitrat $(NO_3)^-$ ionları şəklində mənimsəyir. Azotlu gübrələr sadə, mürəkkəb və qarışıq olur.

a) Sadə azotlu gübrələrə misal olaraq natrium-nitratı, ammonium nitratı, maye ammonyakı, ammonyaklı suyu, sidik cövhərini $CO(NH_2)_2$ göstərmək olar.

b) Mürəkkəb azotlu gübrələrə misal olaraq ammofosu $NH_4H_2PO_4$ (ammoniumdihidrofosfat), diammofosu $(NH_4)_2HPO_4$ (ammoniumhidrofosfat), kalium şorasını $KNO_3$və s. göstərmək olar.

c) Qarışıq azotlu gübrələrdən ammofoskanı ($(NH_4)_2HPO_4 + NH_4H_2PO_4 + KCl$) və nitrofoskanı ($NH_4H_2PO_4 + NH_4NO_3 + KCl$)

**Problemin aktuallığı.** Peşəkar fəaliyyət zamanı bir mütəxəssisin davamlı inkişafı və özünü inkişafetdirmə prosesinin ehtiyacı ilə müəyyən edilir. Təhsil və təlimdə akmeo-elektiv anlayışların tətbiq edilməsi ilə şagirdlərin mənimsəmə qabiliyyətlərinin inkişaf etdirilməsi elektiv anlayışların pedaqoji prosesə tətbiqidir.

**Problemin elmi yeniliyi.** Akmeo-elektiv anlayışlardan tədris prosesində yeni anlayış kimi istifadə edilərək orta məktəblərdə dərsin daha fəal təşkili şagirdlərin interaktiv biliyini inkişaf etdirərək kimya elminə qarşı marağın və motivləşdirmənin artırılmasıdır.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqatın praktiki əhəmiyyəti ondan ibarətdir ki, tədqiqatda irəli sürülən fikirlərdən ali və orta məktəb müəllimləri, şagirdləri pedaqoji prosesdə istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Программы элективных курсов: Химия: 10-11 кл.: Профильное обучение / [Авт.-сост. Г.А. Шипарева]. – М.: Дрофа, 2006. – 79 с..
2. Акмеология профессионального образования: Чупина В. А.
3. Аршанский Е.Я. Обучение химии в классах педагогического профиля // Химия: Прил. к газ. «ПС». – 2005. - № 12. – С.11-14.
4. Ушаков, А.А. Акмеологические основы высшего образования: Учеб.-метод. пособие / А.А. Ушаков. – Краснодар: Кубанский гос. ун- т, -2019. – 148 с.

**E-mail:** balakishiyevaaygun@gmail.com
**Rəyçilər:** kim.elm.dok., prof. **F.M. Sadıqov,**
*kimya.ü.fəls.dok.* **G. N. İsmayılova**
**Redaksiyaya daxil olub:** 22. 02.2023

*UOT 372.854*

***Gülər Ənvər qızı Şükürova***
*"Evrika" özəl tam orta ümumtəhsil məktəbinin kimya müəllimi*

# KİMYA DƏRSLƏRİNDƏ ŞAGİRDLƏRİN TƏDRİS FƏALİYYƏTİNİN MOTİVASİYASININ ARTIRILMASI YOLLARI

***Гюлер Анвар гызы Шюкюрова***
*учитель химии частной общеобразовательной школы «Эврика»*

# ПУТИ ПОВЫШЕНИЯ МОТИВАЦИИ УЧЕБНОЙ ДЕЯТЕЛЬНОСТИ УЧАЩИХСЯ НА УРОКАХ ХИМИИ

***Gular Anvar Shukurova***
*"Eureka" chemistry teacher of a private secondary school*

# WAYS TO INCREASE THE MOTIVATION OF STUDENTS' EDUCATIONAL ACTIVITY IN CHEMISTRY LESSONS

**Xülasə**. Pedaqoji fəaliyyət zamanı bir çox müəllim müasir şagirdlərin öyrənmə motivasiyasının son dərəcə aşağı olduğunu və xüsusilə ilkin olaraq mürəkkəb olmayan, ikinci dərəcəli hesab etdikləri fənlərə marağın azaldığını qeyd edir. Belə fənlərdən biri də kimya fənnidir. Bu vəziyyəti müsbət və effektiv şəkildə necə yaxşılaşdırmaq olar? Şagirdlərin kimyanın öyrənilməsində motivasiya səviyyəsini necə artırmaq, onların fənnə və tədris fəaliyyətinə münasibətini necə yaxşılaşdırmaq olar?
***Açar sözlər**: kimya, motivasiya, maraq, şagird, fəaliyyət, müəllim, tədris prosesi, tədris texnologiyaları*

**Резюме.** В ходе педагогической деятельности многие учителя отмечают, что мотивация к учебе у современных учеников крайне низка, а их интерес к предметам, которые они считают второстепенными, особенно несложными поначалу, снизился. Одним из таких предметов является химия. Как можно положительно и эффективно улучшить эту ситуацию? Как повысить уровень мотивации учащихся в изучении химии, как улучшить их отношение к предмету и учебной деятельности?
***Ключевые слова:** химия, мотивация, интерес, ученик, деятельность, учитель, учебный процесс, обучающие технологии*

**Summary.** During the pedagogical activity, many teachers note that modern students' motivation to learn is extremely low, and their interest in subjects, which they consider to be secondary, especially uncomplicated at first, has decreased. One of such subjects is chemistry. How can this situation be positively and effectively improved? How to increase the motivation level of students in studying chemistry, how to improve their attitude to the subject and teaching activities?
***Key words:** chemistry, motivation, interest, student, activity, teacher, teaching process, teaching technologies*

Hər bir müəllim istəyir ki, şagirdləri yaxşı oxusunlar, tədris prosesində maraqla, həvəslə iştirak etsinlər. Şagirdlərin valideynləri də bu baxımdan maraqlıdır. Amma bəzən həm müəllimlər, həm də valideynlər təəssüf hissi ilə deyirlər: "oxumaq istəmir", "bacarığı var, amma həvəsi yoxdur". Bu hallarda şagirddə biliyə ehtiyacının olmaması, öyrənməyə marağının formalaşmaması ilə qarşılaşırıq.

Məlumdur ki, şagird öyrənməyə, biliyə laqeyd yanaşarsa, maraq göstərmədən, onlara olan ehtiyacı dərk etmədən onu müvəffəqiyyətlə öyrənə bilməz olmaz. Buna görə də məktəb qarşısında təhsil prosesinin səmərəliliyini artırmaq

üçün şagirdin təlim fəaliyyətinə müsbət motivasiyasını formalaşdırmaq və inkişaf etdirmək vəzifəsi qoyulur.

Şagirdləri kimya fənnini öyrənməyə həvəsləndirməyin bir çox yolu var.

*1.Şagirddə öz qabiliyyət və imkanlarına inamın və nikbinliyin yaradılması;*

Kimya fənnini öyrənmək və ünsiyyət qurmaq üçün motivasiya yaratmaq, sinifdə həvəs, nikbinlik və şagirdlərin qabiliyyət və imkanlarına inam mühiti yaratmadan mümkün deyil. Şagirdlərdə realist düşüncənin nəticəsi olan nikbinlik hissini tərbiyə etmək lazımdır. Bunun üçün müəllimin şagirdlərə qarşı optimist olması vacibdir. Uğurlu nəticəni təmin etmək üçün lazımi dəstəyi təmin etməklə, şagirdlərə özləri üçün real və əldə edilə bilən məqsəd və vəzifələr təyin etmək və ya onlara kömək etmək, çətin tapşırıqlar vermək və məqsədlərə çatmaq üçün lazım olan prosesi modelləşdirmək vacibdir və zəruridir. Şagirdlərin kimya fənnindən müxtəlif xarakterli tapşırıqların yerinə yetirilməsinə sərf etdiyi əzmkarlığa və səylərə diqqət yetirmək lazımdır. Şagird uğurun uğursuzluq üzərində qurulduğunu anlamalıdır**.** Şagirdlərə təkcə özlərinin deyil, həm də korporativ nailiyyətlərini qiymətləndirməyi öyrətmək vacibdir.

*2. "Altı Düşüncə papağı" yaradıcı texnikasından istifadə;*

“Altı Düşüncə papağı” şagirdlərin kimyanı öyrənməyə daha çox həvəsləndirilməsinə kömək edən yaradıcı bir texnikadır. “Altı Düşüncə papağı” müxtəlif nöqteyi-nəzərləri ifadə edərək şagirdlərə problemləri müzakirə etməyə kömək edən bir üsuldur. Bu mühüm və güclü texnologiya Edvard de Bono tərəfindən işlənmiş ən məşhur düşüncə üsullarından biridir. Bu üsulun əsasında paralel düşüncə dayanır. Hər hansı bir məsələni 6 müxtəlif düşüncə ilə müzakirə etmək üçün çox maraqlı üsuldur. Şagirdlərin düşünməsi, müzakirə aparması, müəyyən hadisəni analiz etməsi, qiymətləndirilrməsi onların təhsilə marağını artırır, təfəkkürlərini inkişaf etdirir. Məsələn, kimya fənnində qeyri-üzvi kimyanın əsas siniflərinin ümumiləşdirici dərsində bu üsuldan istifadə daha da səmərəlidir. De Bono düşüncəni 6 hissəyə bölür və hər birini digərlərindən ayırır. Hər bir düşüncə yönü müxtəlif rənglərdə papaqlarla təmsil olunur. Nəyə görə məhz papaq? Çünki papaqları taxıb çıxarmaq çox asandır. İnsan düşüncəsi də müxtəlif olur və onu tez-tez dəyişə bilir. Papaqların hər rənginə uyğun funksiyaları vardır. Müəyyən rəngdə papağı taxdıqda düşüncələr lazımi istiqamətə yönəlir. Papaqları dəyişdikdə isə eyni məsələyə müxtəlif rakurslardan baxırlar. Bu zaman şagird məsələni tam əhatə edə bilir. Bu metod dərsi rəngarəng və maraqlı edir. Üsulun tətbiqi zamanı bütün rənglərdən eyni anda istifadə etmək vacib deyil, bu artıq müəllimin öz fantaziyası və peşəkarlığından asılıdır.

*3.Yeni informasiya texnologiyalarının tətbiqi;*

Kimya fənninin tədrisində yeni informasiya texnologiyalarından istifadə tədris prosesinin təkmilləşdirilməsi və optimallaşdırılması, iş formalarının şaxələndirilməsinə imkan verən, dərsin şagirdlər üçün maraqlı və yaddaqalan olmasına imkan verən metodik vasitə və üsulların arsenalının zənginləşdirilməsinin ən mühüm aspektlərindən biridir. Müasir müəllim tədris prosesində informasiya-kommunikasiya texnologiyalarını səmərəli tətbiq etməlidir. Bəzi texnologiyalar, demək olar ki, bütün müəllimlər tərəfindən istifadə olunur. Məsələn, təqdimatlardan istifadə geniş yayılmışdır. Onlar həm müəllimlər, həm də şagirdlər üçün əlverişlidir. Təqdimata ümumi kimyaya aid mövzuların tədrisində mətndən əlavə şəkillər, qrafiklər, cədvəllər daxil ola bilər ki, bu da şagirdlərdə öyrənmə motivasiyasının inkişaf etdirilməsinə səbəb olur.

İKT-dən istifadə etməklə keçirilən dərslər şagirdlərə həddən artıq yüklənmədən aktiv idrak və praktik fəaliyyətlə məşğul olmağa imkan verir, şagirdlərin fənnə və təlim prosesinə marağını əhəmiyyətli dərəcədə artırır.

*4. Sinifdənxaric və məktəbdənkənar fəaliyyətlər;*

Bu fəaliyyət növü şagirdlərdən öyrənmə və özünü təsdiqləməsindəki çətinlikləri aradan qaldırmağa kömək edir, çünki bu, onların imkan və qabiliyyətlərini üzə çıxarmağa imkan verir. Sinifdənxaric iş məktəblilərin yaradıcılıq və idrak fəaliyyətini inkişaf etdirə biləcəyi, ən yaxşı şəxsi keyfiyyətlərini reallaşdıra biləcəyi məkanı artırır, yəni sinifdə tez-tez tələb olunmayan qabiliyyətləri nümayiş etdirir. Bu qəbildən kimya gecələrinin, viktorinaların, bilik yarışlarının maarifləndirici oyunlar, axtarış və elmi tədqiqatlar, layihələrin və s. rolu çox böyükdür. Bütün

bunlar uğur üçün əlverişli zəmin yaradır ki, bu da öz növbəsində, təlim fəaliyyətinə müsbət təsir göstərir. Sinifdənxaric fəaliyyətlər həm də öyrənmə motivasiyasını artırmağa, idrak fəaliyyətini aktivləşdirməyə, fənn üzrə bilikləri dərinləşdirməyə və əlavə olaraq onların yaradıcı tətbiqində məşq etməyə imkan verir. Şagirdlərin müxtəlif məktəbdənkənar fəaliyyəti aşağıdakı formalarda həyata keçirilir – ekskursiyalar, olimpiadalar, beynəlxalq müsabiqələr. Belə tədbirlərdə də şagirdlərin kimya fənninə marağı artır və öyrənmə motivasiyası daha da yüksəlir.

*5. Məsafədən olimpiada və yarışlar;*

Kimya fənnindən distant olimpiada və müsabiqələrdə iştirak şagirdlərin öyrənmə, özünü həyata keçirmə və təhsil səviyyəsinin yüksəldilməsi üçün səmərəli üsuldur. Distant olimpiada və müsabiqələr şagirdləri biliklərini sınamağa, özünü təsdiq etməyə, imtahanlara hazırlaşmağa, yaradıcılıq potensialını üzə çıxarmağa sövq edir. Distant olimpiadaların və müsabiqələrin iştirakçıları öz təhsillərinin inkişafı ilə maraqlanırlar, çünki tapşırığa hazır cavabı olmadan müasir informasiya cəmiyyətində həyata uyğun olan öz yaradıcı məhsullarını inkişaf etdirirlər.

*6. Oyunlar;*

Oyun şagirdlərin öyrənilən materialın yeniliyinə və yerinə yetirilən məşqlərin müxtəlifliyinə olan tələbatını ödəyən ən güclü həvəsləndirici amildir. Oyun, yəni rollu oyun, öyrənmə prosesini gücləndirmək üçün geniş imkanlar verir. Rollu oyun onun iştirakçıları tərəfindən real və praktik fəaliyyətin şərti surətdə təkrar istehsalıdır, real ünsiyyət üçün şərait yaradır. Burada təlimin effektivliyi, ilk növbədə, motivasiyanın formalaşması, mövzuya marağın artması ilə bağlıdır. Məsələn, “Kimya həyatımızda” adlı layihənin işlənməsində bu üsul çox yaxşı nəticə verir.

Rollu oyun şagirdlərdə kimyəvi terminlərin istifadəsində nitq fəaliyyətini stimullaşdırır, belə ki, şagirdlər nəyisə demək, soruşmaq, öyrənmək, sübut etmək, həmsöhbətlə nəyisə bölüşmək ehtiyacının aktuallaşdığı bir vəziyyətdə olurlar. Oyun şagirdlərin bir-biri ilə və müəllimlə əlaqə qurmaq istəyini aktivləşdirir, nitq tərəfdaşlığında bərabərliyə şərait yaradır, müəllimlə şagird arasındakı maneəni məhv edir. Oyun özünə inamsız şagirdlərlə danışmaq və bununla da qeyri-müəyyənlik səddini keçmək imkanı verir. Rollu oyunda hər kəs bir rol alır və şifahi ünsiyyətdə fəal tərəfdaş olmalıdır. Oyunlarda şagirdlər söhbətə başlamaq, onu dəstəkləmək, fikri ilə razılaşmaq və ya vaxtında təkzib etmək, aydınlaşdırıcı suallar vermək bacarığı kimi ünsiyyət elementlərini mənimsəyir.

Sinifdə şagirdlərin motivasiyası mərhələlərlə baş verir:

*İlk addım.* Motivasiyanın yaranması.

*İkinci mərhələ.* Yaranan motivasiyanın gücləndirilməsi və davamlı olması

*Üçüncü mərhələ.* Motivasiyanın tamamlanması

Kimya dərslərində motivasiyanin yaradılması böyük rol oynayır. Şagirdləri maraqlandırmaq vacibdir. Dərsdə qeyri-adi, adı, xüsusi psixoloji ab-hava yaratmağa, dərsliyin ayrı-ayrı mövzularından kənara çıxmağa və koqnitiv problemi həll etməyə imkan verən bir növ deviz də motivasiya rolunu oynaya bilər.

Bu gün şagirdlərin idrak qabiliyyətlərinin və yaradıcılıq fəaliyyətinin inkişafı dərsdənkənar vaxtlarda dərslərdə və məşğələlərdə innovativ texnologiyaların tətbiqinin daha da səmərəli olması məhz öyrənmə motivasiyasının yaradılmasından bilavasitə çox asılıdır.

Kimya fənnində kimyəvi reaksiyaların aparılması dərsdə şagirdlərin birgə fəaliyyətinin təşkili də tədris fəaliyyətinin uğuruna böyük təsir göstərir. Kollektiv formalar motivlərin inkişafında xüsusi rol oynayır. Belə bir təşkilatla ən zəif şagirdlər də işə cəlb edilir. Birgə zehni fəaliyyətin xüsusiyyətləri nəzərə alınmaqla qrupun bütün üzvlərinin fəaliyyəti əlaqələndirilməlidir, qrupda ünsiyyət tənqidi təfəkkür, dinləmək, bir-birini başa düşmək, mövqelərini ifadə etmək, onları müdafiə etmək bacarığını inkişaf etdirir. Komandada işləyərkən hər bir şagird özünü tədris prosesinin subyekti kimi hiss edə, bunda fəal rol oynaya bilər. Bu zaman şagird özü üçün uyğun tapşırıq seçə bilər ki, bu da öyrənmə motivasiyasına kömək edir.

Motivasiya məktəblilərin təhsil fəaliyyətinin qiymətləndirilməsi zamanı da müəyyən rol oynayır. Dərslərdə qeyri-standart, şagirdlər üçün maraqlı təlim nəticələrinə nəzarət üsullarından istifadə oluna bilər: şagirdin nəzəri bilikləri mənimsəməsi, biliklərin təcrübələr və praktiki işlərlə möhkəmləndirilməsi, kimyəvi proseslərə aid çalışmaların həll olunması və s.

Motivasiya fərdi bir hadisədir. Birisini motivasiya edən hər hansı bir vəziyyət və ya hadisə başqasını motivasiya etməyə bilər. Şagirdin məktəbdəki müvəffəqiyyətləri təhsil sisteminin keyfiyyətinin göstəricisi olmaq etibarı ilə olduqca əhəmiyyətlidir.

Deməli, şagirdlərin kimya dərslərindəki müvəffəqiyyətlərinə təsir edən faktorlardan biri də dərs zamanı qurulmuş məqsədəuyğun motivasiyadır. Bu səbəbdən kimya dərsində şagirdlərin öyrənmə prosesində motivasiya səviyyələrinin nəzərə alınması olduqca faydalıdır.

Motivasiya – problemli öyrətmə yanaşması problemlər əks etdirən, öyrətmə məqsədlərə xidmət edən, şagirdlərin öyrəndiklərini sentez edərək istifadəyə əlverişli olan və onları düşünməyə yönəldən bir üsuldur. Aktiv öyrətmə modellərindəndir.

Motivasiya şagirdlərin gündəlik həyatdan götürülmüş gerçək, ya da gerçəyə yaxın problemləri qruplar halında əməkdaşlıq içində həll etməyə çalışdıqları bir öyrənmə yanaşmasıdır. Bu yanaşmanın bir çox faydaları olmasına baxmayaraq, bunların içərisində ən əhəmiyyətlisi şagirdlərə öyrənməyi, necə öyrənəcəklərini öyrətməkdir. Bu yanaşmada şagirdlər əldə etdikləri məlumatları istifadə edərək problemləri həll etməyə çalışdıqları üçün problem ilə əlaqədar mövcud məlumatları yenidən xatırlama, ehtiyac duyulan məlumatları araşdırma və bunları şərh bacarığını da qazandırır. Problem qoyaraq öyrənmədə şagird məlumatı araşdıraraq, sınayaraq, ətrafı ilə daha çox əlaqələndirərək əldə etdiyindən aldığı məlumat daha da yaddaqalan olur.

Şagirdlər özləri üçün müəyyən bir məna daşıyan problemləri həll etmək üçün yaradılmış motivasiyaya maraq göstərirlər. Onlar bu problemi həll etmək üçün məlumatları axtarır, tapır, onlar arasında əlaqələr qurmağa çalışırlar.

Öyrənmə motivasiyası bir neçə amildən asılıdır.

1. Fənnin məzmunu.
2. Müasir resurslar.
3. Öyrənmə metodları.
4. Tədris materialları ilə təmin etmə.
5. Müxtəlif təlim formalarında öyrənmə.
6. Müəllim yanaşması.
7. Valideyn əməkdaşlığı.

Motivasiyası yüksək olan şagird dərsdə fəal iştirak edir, sual verir, tədqiqat aparır, təqdimat edir, bu da onun müvəffəqiyyətinə təkan verir.

Motivasiya fəal dərsin ən mürəkkəb və mühüm mərhələsidir. Çünki dərsin sonrakı gedişi motivasiyanın necə yaradılmasından və keçirilməsindən asılıdır. Motivasiyanın başlıca xüsusiyyəti bir sıra fərziyyələri törədən problemli vəziyyətin yaradılmasıdır.

Motivasiya yaradılarkən bir sıra mühüm amillər mütləq nəzərə alınmalıdır. Bu amilləri aşağıdakı kimi sistemləşdirmək olar:

- material qeyri-adiliyi ilə fərqlənməli, şagirdi düşünməyə məcbur etməli, müstəqil təfəkkürü inkişaf etdirməyə yönəlməlidir;
- materialın təqdimetmə üsulları və formaları şagirdləri fəaliyyətə və tədqiqata həvəsləndirilməlidir;
- fərziyyələri yoxlamaq və təqdimat aparmaq imkanı verilməlidir;
- yaradıcılığa maksimum imkanın yaradılması;
- müəllim düzgün yönəldici üsullar verməli, cavablar dəstəklənməli və istiqamətləndirilməlidir.

**Problemin aktuallığı**. İlk növbədə mövzunun aktuallığını üzə çıxarmaq, öyrənilməsi zərurətini mərkəz mövqeyə gətirmək üçün problemli vəziyyətin yaradılması əsasdır. Problemli vəziyyətin gərginlik dərəcəsi müəllimin fantaziyasından, şagirdlərlə ünsiyyət qurmaq bacarığından, vəziyyətdən çıxmaq üçün manevretmə cəhdlərinin çevikliyindən, sərbəstliyindən, işgüzarlığından və s. şəxsi amillərdən asılıdır.

**Problemin elmi yeniliyi.** Əməkdaşlıq və qarşılıqlı dialoqun həyata keçirilməsi əsasən problemin qoyulması – müzakirəsi – nəticənin cıxarılması – tətbiq edilməsi mərhələlərini əhatə edir. Bu anlayış "öyrənən" və "öyrədən" arasında qarşılıqlı dialoqun mövcudluğu zəruriliyini tələb edir. İndiyədək mövcud olmuş "monoloji" təlimdə şagirdlərin mövqeyi nəzərə alınmadığından, müzakirə edilən məsələyə dair onların fərziyyə və baxışları diqqətdən kənarda qalmışdır. "Dialoji təlim" isə problemin həlli üçün optimal üsulların tapılmasını, dərs prosesində müəllim və şagirdin eyni səviyyədə fəallığını tələb edir.

**Problemin praktik əhəmiyyəti**. Motivasiya yaradarkən müəllimin məqsədi şagirdlərin idrakı fəallığını artırmaq, tədris olunan fənnə və öyrəniləcək dərsin məzmununa maraq yaratmaq, şagirdin müstəqil tədqiqat və axtarış aparmaq üçün açılan imkanı qiymətləndirmək həvəsini oyatmaqdır.

**Ədəbiyyat:**

1. "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu. -Bakı: Hüquq ədəbiyyatı, -2009.
2. "Azərbaycan Respublikasının ümumtəhsil sistemində Qiymətləndirmə Konsepsiyası". -Bakı, 2009.
3. Məmmədzadə R. H. Təhsildə keyfiyyət aparıcı istiqamətlərdən biri kimi. -Bakı: Müəllim, – 2010.
4. Бардин К.В. Как научить детей учиться. – Москва, 1987.

**E-mail:** gulersukurova91@gmail.com

**Rəyçilər:** *ped.ü.fəls.dok.* **S. Tağıyeva**
*ped.ü.fəls.dok*. **K. Mahmudova**
**Redaksiyaya daxil olub:** 01.03.2023

# FİZİKANIN TƏDRİSİ METODİKASI
# МЕТОДИКА ПРЕПОДАВАНИЯ ФИЗИКИ
# METHODSOF TEACHING PHYSICS

UOT 372.853

**Afət Calal qızı Məmmədzadə**
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Gəncə Dövlət Universiteti*

## "QRAVİTASİYA SAHƏ İNTENSİVLİYİ" MÖVZUSUNUN TƏDRİSİNDƏ ASTRONOMİYA FƏNNİNİN ROLU

**Афет Джалал гызы Мамедзаде**
*докторант по программе доктора философии*
*Гянджинский Государственный Университет*

## РОЛЬ ПРЕДМЕТА АСТРОНОМИИ В ПРЕПОДАВАНИИ ТЕМЫ «ИНТЕНСИВНОСТЬ ГРАВИТАЦИОННОГО ПОЛЯ»

**Afet Jalal Mammadzadeh**
*doctorial student in the proqram of doctor of philosophy*
*Ganja State University*

## THE ROLE OF THE SUBJECT ASTRONOMY IN TEACHING THE TOPIC INTENSITY OF THE GRAVITATIONAL FIELD

**Xülasə.** Ümumdünya cazibə qanununu ümumtəhsil məktəbinin X sinfində "Qravitasiya qüvvələri" bölməsində tədris olunur. Metodik ədəbiyyatda bu qanunun bir neçə yolla tədrisinə təsadüf olunur [1]. Qanunun kəşfi ilə əlaqədar aşağıdakı üç əsas tarixi mərhələni nəzərdən keçirək:

1. Nyutona qədərki dövr.
2. Nyutonun fəaliyyəti dövrü.
3. Nyutondan sonrakı dövr.

Ümumdünya cazibəsi haqqında ilk elementar təsəvvürləri yunan alimləri Aristotel, Empidokl, Anaksaqor və Demokrit yaratmışlar. Qədim Yunan mütəfəkkirlərinə görə təbiətdə oxşar olan cisimlər birləşməyə çalışırlar. Aristotel müəyyən hündürlükdən buraxılmış cisimlərin Yerə düşmə hadisəsini belə izah edirdi: bütün cisimlər Yerin mərkəzinə doğru hərəkət etməyə çalışır. O, Yeri kainatın mərkəzi hesab edirdi [2].

***Açar sözlər:*** *Qravitasiya, cazibə, period, astronomiya, Günəş, Yer, planet*

**Резюме.** Закон всемирного тяготения изучается в разделе "Силы гравитации" в X классе общеобразовательной школы. В методической литературе этот закон преподается несколькими способами [1]. Рассмотрим следующие три основных исторических этапа в связи с открытием закона:

1. Эпоха до Ньютона.
2. Период деятельности Ньютона.
3. Постньютоновская эра.

Впервые элементарные представления о вселенской гравитации создали греческие ученые Аристотель, Эмпидокл, Анаксагор и Демокрит.По мнению древнегреческих мыслителей, сходные по своей природе объекты имеют свойство соединяться. Феномен падения предметов на Землю с определенной высоты Аристотель объяснял так: все предметы стремятся двигаться к центру Земли. Он считал Землю центром Вселенной [2].

***Ключевые слова:*** *гравитация, притяжение, период, астрономия, Солнце, Земля, планета*

**Summary.** The law of universal gravitation is taught in the section "Forces of gravity" in the X grade of a comprehensive school. In the methodological literature, this law is taught in several ways [1]. Consider the following three main historical stages in connection with the discovery of the law:

1. The era before Newton.
2. The period of Newton's activity.
3. Post-Newtonian era.

For the first time, elementary ideas about universal gravity were created by the Greek scientists Aristotle, Empidocles, Anaxagoras and Democritus. According to ancient Greek thinkers, objects similar in nature tend to combine. Aristotle explained the phenomenon of objects falling to the Earth from a certain height as follows: all objects tend to move towards the center of the Earth. He considered the Earth to be the center of the Universe [2].

***Key words:*** *Gravity, attraction, period, astronomy, Sun, Earth, planet*

Kopernikin verdiyi heliosentrik sistem astronomiyada inqilab yaratdığı kimi mexanikanın inkişafına da güclü təkan vermiş və Günəş sisteminin öyrənilməsi problemi yaranmışdır. Bu sahədə ilkin fikirlər ingilis alimi Hilbertə və fransız riyaziyyatçısı R. Dekarta məxsusdur. Hilbert planetləri nəhəng maqnit kimi təsəvvür edib, qarşılıqlı təsirin maqnit təbiətli olduğunu söyləyirdi. R. Dekarta görə isə, Kainat gözəgörünməz şəffaf burulğanlı materiya ilə dolu olduğundan, planetlər burulğana düşüb fırlanmaqla bərabər Günəş ətrafında da hərəkət edirlər. O dövrdə bu təsəvvürlərdən kəmiyyət xarakterli nəticələr almaq mümkün olmadığından, onlar elm tarixində sadəlövh təsəvvürə çevrilmişdir.

İlk dəfə olaraq danimarkalı astronom Tixo Braqe uzun müddət planetlərin hərəkətini müşahidə etmiş, onların hərəkətini izləmiş və vəziyyətlərini qeydə götürmüşdür. T. Braqenin astronomik müşahidə cədvəllərindən istifadə edən İ. Kepler planetlərin hərəkətinin üç kinematik qanununu kəşf etmişdir [3].

1. Bütün planetlər fokuslarının birində Günəş yerləşən ellipslər üzrə hərəkət edir.
2. Planetin radius vektoru bərabər zamanlarda eyni sahələr cızır.
3. Planetlərin Günəş ətrafında fırlanma periodlarının kvadratları nisbəti orbitlərinin böyük yarımoxlarının kubları nisbətinə bərabərdir.

$$\frac{T_1^2}{T_2^2} = \frac{R_1^3}{R_2^3} \quad (1)$$

Bununla da ümumdünya cazibə ideyasına doğru yeni yol açılmışdır. Təbii olaraq belə bir sual meydana gəlmişdir: planetlərin Günəş ətrafındakı hərəkətinin səbəbi nədir? Bu suala cavab vermək üçün o dövrün alimləri, o cümlədən Kepler, Qaliley böyük zəhmət sərf etmişlər. Həmin axtarış zamanı Qaliley cisimlərin hərəkətinin qanunauyğunluqlarını tədqiq etmiş, qüvvələrin asılı olmaması prinsipini və ətalət qanununu kəşf etməklə həmin yolu daha da genişləndirmişdir [4].

Ümumdünya cazibə qanunu tədris olunarkən tarixi faktlara əsaslanmaq vacibdir. Bu qanunun ideyası XVII əsrin əvvəllərində Qaliley tərəfindən verilmişdir. Nyuton o dövrdə ona qədər olan fikirləri ümumiləşdirərək bu ideyanı ifadə edən qanun vermişdir. Təəssüflər olsun ki, Nyutonun bu barədə heç bir yazılı məlumatı saxlanılmamışdır. Nyutonun sözlərinə görə, bu qanunun kəşfinə səbəb almanın ağacdan düşməsi və Ayın Yer ətrafında hərəkəti mühüm rol oynamışdır. O dövrdə Nyutona aşağıdakı faktlar məlum idi. Məhz bu faktların təhlili ümumdünya cazibə qanununun kəşfi üçün əsas olmuşdur [5].

1. Bütün cisimlər Yerə düşür.
2. Bütün cisimlər Yerə eyni təcillə düşür.
3. Ay fırlanma periodu təqribən 27,3 sutka olan periodla Yer ətrafında dairəvi orbitə yaxın trayektoriya boyunca fırlanır.
4. Ayın Yer ətrafında firlanma orbitinin radiusu Yerin radiusunun təqribən 60 mislinə bərabərdir.

Təbii ki, yuxarıda sadalanan faktların Nyuton tərəfindən hansı ardıcıllıqla araşdırılması məlum deyil. Bizə məlum olan faktları təhlil edib Nyutonun qanunlarından və onun mülahizələrindən istifadə edib müəyyən mülahizələrlə ümumdünya cazibə qanununun riyazi ifadəsini çıxaraq:

1. Cisimlərin Yerə düşməsini Nyuton cisimlərin Yer tərəfindən cəzb olunması ilə izah etmişdir;

2. Müxtəlif cisimlər üçün sərbəstdüşmə təcilinin eyni olması göstərir ki, cisimlərə təsir edən cazibə qüvvəsi cisimlərin kütləsi ilə mütənasibdir. Nyutonun ikinci qanununa görə

$F = mg$ və ya $F \approx m$;

3. Dairəvi orbit boyunca hərəkət edən cismə mərkəzəqaçma qüvvəsi təsir edir. Nyuton təklif etmişdir ki, Ay Yeri hansı qüvvə ilə cəzb edilirsə, Ay da həmin qüvvə ilə Yerə cəzb olunur. Bu cazibə qüvvəsi də Ayın kütləsi ilə mütənasibdir:

$F \approx m_Y$;

4. Yer də özlüyündə Ay tərəfindən onun kütləsi ilə mütənasib olan qüvvə ilə cəzb olunur:

$F_{Y\approx} \approx m_Y$

Nyutonun III qanununa görə, Yerin Ay tərəfindən və Ayın Yer tərəfindən cazibə qüvvələri qiymətcə bir-birinə bərabərdir:

$F_A = F_Y$

Deməli, Ayın Yerə cəzb olunma qüvvəsi həm də Yerin kütləsi ilə mütənasibdir:

$F_A \approx m_Y$

3. Nyuton ona məlum olan məlumatlara əsaslanaraq Ayın mərkəzəqaçma təcilini hesablamışdır:

$$a_{Ay} = \frac{\upsilon_{Ay}^2}{R_{or.Ay}}$$

Burada, $R_{or.Ay}$ – Ayın orbitinin radiusudur. Ayın orbit boyunca fırlanma sürətinin $\upsilon = \frac{2\pi R_{or.Ay}}{T_{Ay}}$ olduğunu nəzərə alsaq, onda mərkəzəqaçma təcili üçün alarıq:

$$a_{Ay} = \frac{4\pi^2 R_{or.Ay}}{T_{Ay}^2} =$$

$$= \frac{4\cdot 9{,}8\cdot 60\cdot 640\cdot 10^3}{(27{,}3\cdot 24\cdot 360)^2} = \frac{9{,}8}{3600}\frac{m}{san^2} = \frac{g}{3600}\frac{m}{san^2}$$

Sonuncu ifadədən alınır ki, Ay öz orbitində olduqda Yer tərəfindən Yer səthinə nəzərən 3600 dəfə az qüvvə ilə cəzb olunur. Kepler qanunundan istifadə etsək, onda Ay orbitinin radiusunun kvadratının, Yerin radiusunun kvadratına olan nisbəti üçün alarıq:

$$\frac{R_{or.Ay}^2}{R_Y^2} = \frac{(60R_Y)^2}{R_Y^2} = 3600$$

Başqa sözlə, Ayın Yer tərəfindən cəzbolunma qüvvəsi Ay və Yer arasındakı məsafənin kvadratı ilə tərs mütənasibdir:

$$F_A \approx \frac{1}{R_{or.Ay}^2} \text{ [6]}$$

Yuxarıdakı ifadələri

$$(F_{Ay} \approx m_{Ay};\ F_A \approx m_Y;\ F_{Ay} \approx \frac{1}{R_{or.Ay}^2})$$

ümumiləşdirsək, ümumdünya cazibə qanununun ifadəsini alarıq:

$$F_{Ay} \approx \frac{m_{Ay}\cdot m_Y}{R_{or.Ay}^2} \text{ və ya}$$

$$F = G\frac{m_{Ay}\cdot m_Y}{R_{or.Ay}^2}$$

Burada $G$ mütənasiblik əmsalı olub, Ümumdünya cazibə sabiti adlanır. Ümumdünya cazibə qanunu təbiətin fundamental qanunlarından biridir. Kainatda olan bütün cisimlər bir-birinə qarşılıqlı təsir edir. Bəs bu təsir necə yaranır? Müəyyən olunmuşdur ki, hər bir cisim ətrafında bu təsiri yaradan qravitasiya sahəsi mövcuddur. Bu sahəni biz onun təsirinə görə, məsələn, cisimlərin Yerə cəzb olunması ilə müşahidə edirik. Qravitasiya sahəsi cisim ətrafında eyni olmayıb, cismin səthindən uzaqlaşdıqca zəifləyir. Ona görə də cisim bizdən nə qədər uzaq olarsa, onun cazibəsi də zəif olur.

*İki maddi cisim arasındakı qarşılıqlı təsir qüvvəsi bu maddi cisimlərin kütlələri hasili ilə düz, onların aralarındakı məsafənin kvadratı ilə tərs mütənasib olub bu maddi cisimləri birləşdirən düz xətt boyunca yönəlmişdir.* Bu qüvvə qravitasiya qüvvəsi və ya ümumdünya cazibə qüvvəsi adlanır:

$$\vec{F} = G\frac{m_1\cdot m_2}{r^2}\vec{r} \text{ [7]. (2)}$$

Burada $G$ - *qravitasiya sabiti olub fiziki mənaca bir-birindən 1 m məsafədə yerləşmiş və kütlələri 1 kq olan iki maddi cisim arasındakı qarşılıqlı təsir qüvvəsidir.* Qravitasiya sabitinin ədədi qiyməti təcrübi olaraq ilk dəfə Kavendiş tərəfindən müəyyən olunmuşdur. Bu məqsədlə Kavendiş burulma tərəzisindən istifadə etmişdir. Təcrübədə ipə bağlanmış və müəyyən ox ətrafında dönə bilən çubuğun uclarından hər birinin kütləsi $m = 729\ q$ olan iki kürə asılmışdır. Tərpənməz $C$ linginin uclarından isə kütləsi

$M = 158\ kq$ olan iki kürə asılır. *C* lingini fırlatmaqla *m* və *M* kürələri arasındakı məsafə dəyişdirilir və hər bir halda burulma tərəzisi ilə qüvvə ölçülür. Təcrübədən alınan nəticələrə görə qravitasiya sabiti təyin olunmuşdur. Qravitasiya sabiti başqa bir təcrübədə Jole tərəfindən də təyin olunaraq bu sabit üçün $G = 6{,}67 \cdot 10^{-11} \frac{N \cdot m^2}{kq^2}$ qiyməti müəyyən olunmuşdur.

Fizika dərsliklərində Ümumdünya cazibə qanunu aşağıdakı kimi ifadə olunur: *İstənilən iki maddi cisim bir-birini kütlələrinin hasili ilə düz, aralarındakı məsafənin kvadratı ilə tərs mütənasib qüvvə ilə cəzb edir*. Kainatda əksər hallarda iki göy cismi bir-birindən o qədər uzaqdadır ki, onları maddi nöqtə hesab etmək olar. Odur ki, kütlələri $m_1$ və $m_2$, aralarındakı məsafə *r* olan iki göy cisminin qarşılıqlı cazibə qüvvəsi də $F = G\frac{m_1 m_2}{r^2}$ şəklində ifadə olunur. Nyutonun cazibə qanunu ona görə Ümumdünya cazibə qanunu adlanır ki, göy cisimlərinin həqiqi hərəkətlərinə bu qanun tətbiq olunduqda alınan nəticələr müşahidələrlə üst-üstə düşür. Məsələn, neptun planetinin kəşfi buna parlaq misaldır [3].

**Problemin aktuallığı**. Keplerin qanunları elmə məlum olduqdan sonra məşhur alimlər planetlərin bu qanunlarla hərəkətinin səbəbini tapmağa çalışdılar. Qalileyin kəşf etdiyi ətalət qanunu bu səbəbləri araşdırmaqda ilk addımlardan olmuşdur. Odur ki, planeti hərəkətə gətirən qüvvəni deyil, onu düzxətli və bərabərsürətli hərəkətdən çıxaran və orbitdə saxlayan qüvvənin – ümumdünya cazibə qüvvəsinin tədqiqi aktualdır.

**Problemin elmi yeniliyi**. Tədqiqat işində Ayın timsalında cazibə qüvvəsi ilə ağırlıq qüvvəsinin eyniliyi qarşılıqlı əlaqələndirilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqat işində iki maddi cisim arasındakı cazibə qanununun planetlər üçün də doğru olması faktı təsdiqlənir. Bu qanunun öyrənilməsi yeni planetlərin aşkar olmasına səbəb olmuşdur.

**Ədəbiyyat:**


1. Qaralov, Z. Fizika qanunlarının tədrisi. / Z. Qaralov. -Bakı: Elm, -1997.
2. Quluzadə, C. Klassik astronomiya. / C. Quluzadə. -Bakı, 2007.
3. Hüseynov, R. Astronomiya. / R. Hüseynov. -Bakı, 1997.
4. Quluzadə, C. Ümumi astronomiya kursu (Klassik astronomiyanın əsasları). / C. Quluzadə. -Bakı, 2018.
5. Малафеев, Р. И. Проблемное обучение физике в средней школе :Пособие для учителей / Р. И. Малафеев. - Москва: Просвещение, -1980. - 127 с.
6. Кононович, Э.В. Общий курс астрономии. / Кононович Э.В., Мороз В.И. 2-е изд., испр. - М.: Едиториал УРСС, -2004. - 544 с. (Классический университетский учебник.).
7. Orta məktəb. Fizika dərsliyi. X sinif. -Bakı, 2022.



**E-mail:** afet.memmedzade@bk.ru



**Rəyçilər:** *fiz-riy. ü. fəls. dok., dos,* **R. M. Məmmədov**
*fiz-riy. ü. fəls. dok., dos* **R. Ş. Rəhimov**
**Redaksiyaya daxil olub:** 06.03.2023

***BİOLOGİYANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ БИОЛОГИИ***
***METHODS OF TEACHING BİOLOGY***

*UOT 372.857*

***Əliyənnağı Məhəmmədtağı oğlu Məhərrəmov***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

***Veysəl Vüsal oğlu Abişov***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

## BİOLOGİYA FƏNLƏRİNİN TƏDRİSİNDƏ ANLAYIŞLARIN İNKİŞAF ETDİRİLMƏSİ METODİKASI (X-XI SİNİFLƏR)

***Алияннаги Магомедтаги оглы Магеррамов***
*доцент, доктор философии по педагогике*
*Азербайджанский Государственный Педагогический Университет*

***Вейсал Вюсал оглы Абышов***
*Азербайджанский Государственный Педагогический Университет*

## МЕТОДИКА РАЗРАБОТКИ ПОНЯТИЙ В ПРЕПОДАВАНИИ БИОЛОГИЧЕСКИХ НАУК (X-XI КЛАССЫ)

***Aliyannagi Mahammadtaghi Maharramov***
*doctor of philosophy in pedagogy, associate professor*
*Azerbaijan State Pedagogical University*

***Veysel Vusal Abishov***
*Azerbaijan State Pedagogical University*

## METHODOLOGY FOR DEVELOPMENT OF CONCEPTS IN TEACHING BIOLOGICAL SCIENCES (GRADES X-XI)

**Xülasə.** Məqalədə göstərilir ki, insanların hərtərəfli biliyi olmasa, inkişaf etmiş cəmiyyət qurmaq olmaz. Elmlərin əsaslarının öyrənilməsi məhz anlayışlardan başlayır. Anlayışı inkişaf etdirmək üçün təbii əyanilik, təsviri əyanilik əsas rol oynayır. Xüsusi vurğulanır ki, anlayışları inkişaf etdirmək üçün fənlərarası əlaqədən geniş istifadə olunmalıdır. Şagirdlərə hər hansı anlayışı başqa fənlə əlaqələndirməyi öyrətmək lazımdır.

Məqalədə anlayışların inkişafında sxemlərin rolunun böyük olduğu önə çəkilir, qeyd olunur ki, sxemləri biologiya müəllimləri lövhədə özü çəkə bilər və ya şagirdə evdə çəkməyi təklif edə bilər. Sxemlər müqayisə xarakterində olmalıdır. Həmçinin göstərilir ki, anlayışları əvvəlki anlayışlarla əlaqələndirdikdə, onun sistematik inkişaf etdirdikdə daha yaxşı yadda qalır.

***Açar sözlər*:** *anlayış, düşüncə, tərbiyə, ümumbioloji anlayış, fənlərarası əlaqə, sxem*

**Резюме.** В статье указано, что люди, без всесторонних знаний не смогут построить развитое общество. Изучение основ науки начинается с понятий. Естественная наглядность, описательная наглядность играет важную роль в развитии понятий. Особо подчеркивается, что для развития поня-

тий должна широко использоваться межпредметная связь. Учащихся следует научить связывать любое понятие с другим предметом.

В статье подчеркивается большая роль схем в развитии понятий, отмечается, что учителя биологии могут сами рисовать схемы на доске или предлагать учащимся нарисовать их дома. Схемы должны носить сравнительный характер. Показано также, что понятия лучше запоминаются, когда они связаны с предыдущими понятиями, таким образом они систематически развиваются.

***Ключевые слова***: *понимание, мышление, воспитание, общебиологические понятия, межпредметная связь, схема*

**Summary.** The article shows that a developed society cannot be built without comprehensive knowledge of people. Learning the basics of science begins with concepts. Natural visualization, descriptive visualization plays a key role in developing understanding. It is especially emphasized that interdisciplinary communication should be widely used to develop understandings. Students should be taught to relate any concept to another subject.

The article emphasizes the great role of diagrams in the development of concepts, it is noted that biology teachers can draw diagrams on the blackboard themselves or suggest that students draw them at home. Schemes should be comparative in nature. It is also shown that concepts are remembered better when they are linked to previous concepts, when they are systematically developed.

***Key words***: *understanding, thinking, education, universal understanding, interdisciplinary relationship, scheme*

Milli dövlətçiliyimizin möhkəmləndiyi, eləcə də milli təhsilimizin inkişaf edib çiçəklənərək dünyanın ən qabaqcıl dövlətlərinin təhsil sisteminə inteqrasiya etdiyi bir dövrdə böyüyən gənc nəslin dünyagörüşünün düzgün formalaşması xüsusi aktuallıq kəsb edir. Bildiyimiz kimi, insanların hərtərəfli biliyi olmasa, inkişaf etmiş cəmiyyət qurmaq olmaz. Elmin əsaslarının öyrənilməsi məhz anlayışlardan başlayır. Anlayışlar real dünyanın təzahürlərini, əşyaların ümumi spesifik xüsusiyyətlərini ifadə edən insan təfəkkürünün ali formasıdır. Fənni anlamaq onun spesifik xüsusiyyətlərini mənimsəmək deməkdir.

Anlayışlar, o cümlədən bioloji anlayışları bilərək insan düşünür. Düşüncə dünyada olan reallığı əks etdirir və o biliksizlikdən bilik qazanmağa gedən yolda bir neçə mərhələdən keçir. Dialektikada anlayışlar dinamikdir. Yəni insan təfəkküründə anlayışlar hərəkətsiz deyil. O, daim hərəkətdədir, onlar biri digərinə keçir, biri digəri ilə əlaqələndirilir. Belə olmasa anlayışlar canlı həyatı əks etdirə bilməz. Biologiya müəllimi hər kursda əsas anlayışları ayırd etməyi bacarmalı, onları yadda, diqqət mərkəzində saxlamalıdır.

Orta məktəb bioloji anlayışlar nəzəriyyəsinə aşağıdakıları daxil etmək olar:

-Biologiya dərslikləri (VI-XI siniflər) elmi və praktiki anlayışların əsasıdır.

-Anlayışlar şagirdlərin düşüncə və tərbiyəsində əsas rol oynayır.

-Anlayışlar – beyinin ən yüksək məhsuludur.

Anlayışlar bioloji prosesin ümumiləşdirilmiş inikasıdır, onlar bioloji proseslərin obyektiv əlaqələrini və bioloji inkişafın qanunauyğunluqlarını əks etdirir. Anlayışlar sisteminin mənimsənilməsi prosesin səbəb əlaqələrini və qanunauyğunluqlarını başa düşmək üçün lazımdır. Yalnız əsas bioloji anlayışlar sisteminə yiyələnmək vasitəsi ilə şagirdlər bir elm kimi biologiyanı başa düşməyə yaxınlaşa bilərlər. Məsələn, "Hüceyrə" əsas anlayışlardan biridir. Şagird bu anlayışın mahiyyətini tam dərk edən zaman canlı aləmlə cansızın fərqini anlaya bilərlər. Bitkinin vegetative və ya generative orqanlarının quruluşunu, funksiyalarını, onların canlı aləmdə rolunu dərk edən zaman bir elm kimi biologiyanı dərindən anlayır. Bioloji anlayışların mənimsənilməsi nəinki idraki cəhətdən, həm də ideyatərbiyə cəhətdən məktəbdə biologiya tədrisinin ən mühüm vəzifələrindən biridir (Gülşən)

Uzun dövr ərzində ümumi biologiyada anlayışlar səhv olaraq xətti sistem halında öyrədilirdi: belə ki, populyasiya, növ, biosenoz həyatın xüsusi sistemi kimi yox, orqanizmlərin cəmi kimi başa düşülürdü. Belə anlayış həyatın yaranması haqqında tam elmi təsəvvür yaratmır. Ona görə də müasir bioloji anlayışlar çoxpilləli xarakter daşıyır və təkamül ideyalarına əsaslanır. Biologiya kursunda bioloji anlayışlar aşağıdakı sistem əsasında verilir.




Göstərilən anlayışlar ümumi sistem halında öyrədilərsə, o, bütün anlayışların mahiyyətcə dərk olunmasına və inkişafına kömək edə bilər.

Biologiya kursunda (X-XI siniflər) maddələr mübadiləsinin orqanizmdə gedən biokimyəvi və biofiziki proseslərin nəticəsi kimi aydınlaşdırılır. Eyni zamanda, orqanizmdə qıcıqlanma, hərəkət, çoxalma, enerji mübadiləsi, maddələrin təbiətdə dövranı və s. hüceyrədə gedən fizioloji proseslərin sayəsində mövcud olur. Orqanizmlərin fərdi inkişafı, onun qanunauyğunluqları, bitkilər, insan və onun sağlamlığı kursunda şagirdlərin hüceyrə haqqında aldıqları biliyə əsaslanır. Belə ki, irsi məlumatların nəslə verilməsi orqanizmin fərdi inkişafı ontogenez və tarixi inkişafı filogenez E. Hekkel və F. Müllerin biogenetic qanunu əsasında öyrədilir. Eyni zamanda, sitologiyanın nailiyyətlərinə uyğun olan fərdi inkişaf dövründə gedən proseslərin mexanizmi, onun getmə səbəbləri açılır.

Müəllim kursların məzmununda olan mövcud imkanları qabaqcadan müəyyənləşdirməli və öyrədilməsi mümkün olan anlayışları qruplaşdırmalı, onu dərs prosesində şagirdlərə mənimsətməlidir.

Bioloji anlayışların şagirdlər tərəfindən yaxşı mənimsənilməməsi və yadda qalmamasının əsas səbəbi aşağıdakılardır:

a) onların biliklərinin qavrama və təsəvvür halında qalmasıdır;

b) anlayışların sistemlə inkişaf etdirilməməsi və başqa anlayışlarla əlaqələndirilməməsidir. Biologiya müəlliminin əsas vəzifəsi bio-loji anlayışları ustalıqla, sistemlə və məqsədəuyğun olaraq izah etməkdir.

Müəllim əvvəlcədən bir anlayışı başqa anlayışla əlaqələndirməyi müəyyənləşdirməlidir. Təbii obyektlər anlayış yaratmaq üçün mühüm mənbədir. Anlayışları inkişaf etdirmək üçün təbii əyanilik, təsviri əyanilik əsas rol oynayır. Anlayışı inkişaf etdirmək üçün təfəkkürü inkişaf etdirmək lazımdır. Anlayışı inkişaf etdirmək üçün fənlərarası əlaqə mühüm rol oynayır. Şagirdlərə hər hansı anlayışı başqa fənlə əlaqələndirməyi öyrətmək lazımdır. Fənlərarası əlaqəni müəllim və şagird özü həyata keçirməyi bacarmalıdır. Şagirdin düşüncəli fəaliyyətini fəallaşdırmaq, ona verilən sualdan asılıdır. Məsələn, assimilyasiya və dissimilyasiyanın qarşılıqlı əlaqəsini necə izah edə bilərsiniz? Mitozun bioloji əhəmiyyəti nədir? Mutasiya təkamüldə nə kimi rol oynayır? Ayrı-ayrı orqanları, onların quruluşunu öyrənməklə ümumbioloji anlayışlar, məsələn, assimilyasiya və dissimilyasiya kimi anlayış formalaşdırılır. Anlaylışların inkişafında sxemlərin rolu böyükdür. Müxtəlif sxemləri müəllim lövhədə özü çəkə bilər və ya şagirdə evdə çəkməyi təklif edə bilər. Sxemlər müqayisə xarakterində olmalıdır. Sxem şagirdin biliyinin sistemləşdirilməsi üçün çox vacibdir. Anlayışların

necə mənimsədildiyini öyrənmək üçün fənlərdən yoxlama işi aparılır.

X-XI siniflərdə belə bir cədvəl tərtib etmək olar.

**Nuklein turşularının müqayisəli xarakteristikası**

| ***Nuklein turşularının adı*** | ***Kimyəvi tərkibi*** | | ***Molekul quruluşu*** | ***Hüceyrədə vəziyyəti*** | ***Funksiyaları*** |
|---|---|---|---|---|---|
| | ***Karbohidratlar*** | ***Azot əsası*** | | | |
| **DNT** | | | | | |
| **RNT** | | | | | |

Anlayışların inkişafında plana uyğun olaraq keçmiş bilikləri təkrarlamanın əhəmiyyəti də çoxdur. Keçmiş bilikləri təkrarlamadan, əvvəlki anlayışla yeni anlayış arasında əlaqə yaratmadan onları inkişaf etdirmək və onu yadda saxlamaq çətindir. X-XI sinif biologiya kursunda ən mühüm anlayışlar məntiqi ardıcıllıqla inkişaf etdirilməlidir. Məsələn: üzvi aləmin inkişafı mövzusu keçmiş kurslardan VII-VIII siniflərdə bitkilər və heyvanlar haqqında elementar təkamül anlayışları ilə orqanizmin çoxalması və fərdi inkişafı ilə əlaqələndirilməlidir.

Anlayışların inkişaf etdirilməsinin əhəmiyyətini başa düşən müəllim bütün tədris prosesinin mahiyyətini düzgün təsəvvür edir, tədrisin gedişinə düzgün rəhbərlik edir. Anlayışların inkişaf nəzəriyyəsini aydınlığı ilə dərk edən müəllim dərs üçün materialı, metodları düzgün seçir, metodik priyomlardan yerindəcə istifadə edir. Bütün sualları problem xarakter daşıyır, təkrarı sistemlə aparır, əyani vasitələrdən səmərəli istifadə edir. Buna görə də şagirdlərin bilikləri şüurlu mənimsənilir, yaxşı yadda qalır.

Bioloji anlayışlar məqsədyönlü şəkildə sinifdən-sinfə ötürülə bilər. Bu biliklər həm sistematik olmalı, həm də bütün sahələri əhatə etməlidir. Bioloji anlayışların formalaşmasında və inkişafında müqayisələrin aparılması çox böyük əhəmiyyətə malikdir. Bu zaman anlayışlar arasında oxşar və fərqli cəhətlər müəyyən edilir. Anlayışların analizi aparılır. Müqayisə və analiz ümumiləşdirmə və nəticənin çıxarılmasına kömək göstərir.

Məsələn, "Suda-quruda yaşayanlar sinfi"nin tədrisində "Balıqlar sinfi" ilə müqayisə aparıla bilər. Bunu cədvəllərin və ya Venn diaqramının köməyi ilə etmək olar. Bu zaman şagird suda-quruda yaşayanların balıqlarla müqayisəsini və analizini aparmışdır. O, qurbağa ilə balığın oxşar və fərqli cəhətlərini aşkar edir. Nəticədə müqayisənin köməyi ilə suda-quruda yaşayanları daha dərindən tanıyır.

Müəllim hər mövzuda əsas anlayışları ayırmağı bacarmalıdır. Əsas anlayışlar daim təkrarlanmalı, tez-tez işlədilməlidir. Şagirdlər anlayışları həmin an anlamaya da bilərlər. Bunun üçün vaxt lazımdır. Müəllim bundan ötüb keçməməli, digər mövzularda da anlayışı xatırladıb, onun yeni keçilənlərlə əlaqəsini yaratmalıdır.

Bioloji anlayışların təşəkkülünə məktəb biologiya kursunun ən yüksək, son vəzifəsi kimi baxmaq olar. Yuxarı siniflərdə bioloji prosesin dərindən dərk edilməsi sadəcə olaraq konkret təsəvvürlərdən mücərrəd anlayışlara keçiddən ibarət olmayıb, həm konkret təsəvvürlərin, həm də ümumi bioloji anlayışların onların dialektik vəhdətində inkişafı, zənginləşməsi, məzmununun mürəkkəbləşməsidir. Şagirdlərdən müstəqil surətdə elmi təhlil aparmağı tələb olunmur, onlar biologiyadan və müasir həyatdan götürülmüş konkret faktları təhlil etməyin ən sadə üsullarını, konkret biologiyadan həm ümumi qanunları, həm də xüsusiyyətlərini başa düşməyi öyrənməlidirlər.

**Problemin aktuallığı**. İnsanların hərtərəfli biliyi olmasa, inkişaf etmiş cəmiyyət qurmaq olmaz. Elmlərin əsaslarının öyrənilməsi məhz anlayışlardan başlayır. Biologiya müəlliminin əsas vəzifəsi bioloji anlayışları ustalıqla, sistemlə inkişaf etdirməsidir. Anlayışları inkişaf etdirmək üçün təfəkkürü inkişaf etdirmək lazımdır. Anlayışları inkişaf etdirmək üçün başqa anlayışlarla əlaqələndirilməlidir, fənlərarası əlaqədən istifadə olunmalıdır. Sxemlərdən istifadə olunmalıdır. Bunları təhlil etmək üçün belə bir mövzunun işlənilməsi aktuallıq kəsb edir.

**Problemin elmi yeniliyi**. Anlayışlar real dünyanın təzahürləri, əşyaların ümumi spesifik forması-

dır. Anlayışlar şagirdlərin düşüncə və tərbiyəsində əsas rol oynayır. Biologiya müəllimi kursların məzmununda olan mövcud imkanları qabaqcadan müəyyənləşdirməli və öyrədilməsi mümkün olan anlayışları qruplaşdırmalı, dərs prosesində şagirdlərə mənimsətməlidir.

**Problemin praktik əhəmiyyəti.** Anlayışların inkişaf etdirilməsinin əhəmiyyətini başa düşən müəllim bütün tədris prosesinin mahiyyətini düzgün təsəvvür edir, tədrisin gedişinə düzgün rəhbərlik edir. Anlayışların inkişaf nəzəriyyəsini aydınlığı ilə dərk edən müəllim dərs üçün materialı, metodları düzgün seçir, metodik priyomlardan yerindəcə istifadə edir. Buna görə də şagirdlər bilikləri şüurlu mənimsəyirlər. Təhlil nəticəsində əldə olunmuş bu fikirlərdən biologiya müəllimləri istifadə edə bilərlər.

**Ədəbiyyat:**

1. Hüseynov, Ə.M. Orta məktəbdə biologiya tədrisinin nəzəri və metodiki əsasları / Ə.M. Hüseynov. -Bakı, -2000, -266 s.
2. Hüseynov, Ə.M. Biologiyanın tədrisinin ümumi metodikası / Ə.M. Hüseynov, M.Ş. Babayev, Ə.M. Məhərrəmov. -2003, -138 s.
3. Ə.M. Hüseynov, G. Qurbanova, H. Hacıyeva. Bioloji anlayışların tədrisi və elmi dünyagörüşünün formalaşdırılması. -1996.
4. Hacıyeva, G.N. Biologiyanın tədrisi metodikası / G.N. Hacıyeva. -Bakı, -2019,- 358 s.
5. Biologiya: X sinif. / N. Məmmədova, B. Həsənova, K. Mahmudova [və b.] -Bakı, -2017, -176 s.
6. Biologiya: XI sinif. / N. Məmmədova, B. Həsənova, K. Mahmudova. -Bakı, -2019, -192 s.

**E-mail:** aliyannagi.maharramov@gmail.com

**Rəyçilər**: *biol.ü.fəls.dok., dos.* **T.Q. Abdullayeva,**
*biol.ü.fəls.dok.,* **Q. Əliyev**
**Redaksiyaya daxil olub:** 06.01.2023.

*UOT 372.857*

***Xoşqədəm Qonaq qızı İbrahimova***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

***Sevinc Əmin qızı Məmmmədzadə***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# TEST TAPŞIRIQLARININ MAHİYYƏTİ VƏ BİOLOGİYANIN TƏDRİSİNDƏ TƏTBİQİ

***Хошгадам Гонаг гызы Ибрагимова***
*доктор философии по педагогике*
*Азербайджанский Государственный Педагогический Университет*

***Севиндж Амин гызы Мамедзаде***
*Азербайджанский Государственный Педагогический Университет*

# СУЩНОСТЬ ТЕСТОВЫХ ЗАДАНИЙ И ИХ ВНЕДРЕНИЕ ПРИ ПРЕПОДАВАНИИ БИОЛОГИИ

***Khoshgadam Gonag İbrahimova***
*doctor of philosophy in pedagogy*
*Azerbaijan State Pedagogical University*

***Sevinc Amin Mammadzada***
*Azerbaijan State Pedagogical University*

# THE ESSENCE OF TEST TASKS AND THEİR APPLİCATİON İN TEACHİNG BİOLOGY

**Xülasə.** Məqalədə son illərdə dünyanın əksər ölkələrində daha geniş tətbiq edilən test tapşırıqlarının mahiyyəti və biologiyanın tədrisində tətbiqi yolları araşdırılmışdır. Təlim-tərbiyə prosesinin keyfiyyətinin idarə edilməsi, inkişaf dinamikasının izlənilməsi və təkmilləşdirilməsi üçün real vəziyyətin öyrənilməsi xüsusi əhəmiyyət daşıyır. Məqalədə həmçinin test tapşırıqlarının təsnifatı, tərtibinə qoyulan tələblər və test tapşırıq nümunələri öz əksini tapıb.
***Açar sözlər:*** *test tapşırıqları, çoxseçimli testlər, alternativ testlər, uyğunluğu müəyyənləşdirən test tapşırıqları, ardıcıllığı müəyyənləşdirən test tapşırıqları, şəklə əsaslanan test*

**Резюме.** В статье исследована сущность тестовых заданий, которые в последние годы получили более широкое распространение в большинстве стран мира, и пути их применения при преподавании биологии. Изучение реальной ситуации имеет особое значение для управления качеством образовательного процесса, контроля и улучшения динамики развития. Также в статье приведена классификация тестовых заданий, требования к их составлению и образцы тестовых заданий.
***Ключевые слова:*** *тестовые задания, тесты с множественным выбором, альтернативные тесты, тестовые задания на определение совместимости, тесты на определение последовательности, тест на основе картинок*

**Summary.** In the article, the nature of test tasks, which have been more widely used in most countries of the world in recent years, and the ways of their application in teaching biology have been investigated.

The study of the real situation is of particular importance for the management of the quality of the educational process, monitoring and improvement of the development dynamics. The article also includes the classification of test tasks, the requirements for their compilation, and examples of test tasks.

***Key words:*** *test tasks, multiple choice tests, alternative tests, eligibility test tasks, test tasks determining the sequence, picture test*

Azərbaycan Respublikasında yaxın illər ərzindəki qiymətləndirmə məsələləri ilə bağlı tədbirləri idarə etmək üçün "Azərbaycan Respublikasının ümumtəhsil sistemində Qiymətləndirmə Konsepsiyası" nəzərdə tutulmuşdur. Qiymətləndirmə Konsepsiyası milli kurikulum ilə əlaqəli olub, onun tərkib hissəsidir. Konsepsiyaya əsasən qiymətləndirmə 3 istiqamətdə həyata keçirilir: *məktəbdaxili, milli və beynəlxalq.* Konsepsiya Azərbaycanda ümumi təhsilin müasirləşdirilməsi və yeniləşdirilməsi məqsədi ilə hazırlanmış milli kurikulum çərçivə sənədi ilə bilavasitə əlaqəlidir və onun tərkib hissəsini təşkil edir.

Milli və beynəlxalq qiymətləndirmə təhsil perspektivlərini müəyyənləşdirmək üçün aparılan qiymətləndirmə tədqiqatlarıdır ki, xüsusi qurumlar tərəfindən həyata keçirilir. Məktəbdaxili qiymətləndirmə rəsmi qiymətləndirmə olub, şagirdləri sinifdən-sinfə, bir təhsil səviyyəsindən digər təhsil səviyyəsinə keçirilməsinə xidmət edir. Təhsil standartlarının tətbiq edilməsi ilə əlaqədar olaraq qiymətləndirmə vasitələri öz aktuallığını qoruyub saxlayır. Şagird nailiyyətlərinin qiymətləndirilməsindəki əsas vasitələrdən biri də test tapşırıqlarıdır.

Testin eramızdan əvvəl III əsrdə qədim Şərqdə yaranmasına dair məlumatlar vardır. Bilik, bacarıq və vərdişlərə nəzarət vasitəsi kimi ilk obyektiv testlər XX əsrin əvvəllərində ortaya çıxdı. Pedaqoji test sahəsində tanınmış nüfuzlu E. Torndik məktəb praktikasına aid olan ilk standartlaşdırılmış testləri tərtib etmişdir. Testlərin inkişafının 4 mərhələsi qeyd olunur:

- ✓ Axtarış dövrü (1900 – 1915);
- ✓ Səs-küy dövrü (1915 – 1930);
- ✓ Müasir inkişaf dövrü (1930 – XX əsrin ortaları);
- ✓ Kompüterləşdirmə dövrü (XX əsrin ortalarından - müasir dövrümüzə qədər).

Məktəblərdə tətbiq edilən testlər tədris prosesinin keyfiyyətinin yaxşılaşdırılmasında mühüm rol oynayır. Siniflərdə testlərin düzgün və ardıcıl təşkil edilməsi şagirdlərə biliklərin möhkəmləndirilməsinə və sistemləşdirilməsinə, bilik boşluqlarını aradan qaldırılmağa, irəliləyişlərini tənqidi qiymətləndirməyə, müəllimlərə dərs materialının necə mənimsənilməsi, tədris zamanı hansı materialın kifayət qədər effektiv olmadığı, şagirdlərin idrak fəaliyyətinin məzmun və formasına hansı düzəliş tədbirlərinin daxil edilməsi barədə məlumat verir.

1992-ci ildə Azərbaycan Respublikasının ali təhsil müəssisələrinə tələbə qəbulunun şəffaf şəkildə keçirilməsi məqsədilə testdən istifadə olunmağa başlandı. Həmin ildə Tələbə Qəbulu üzrə Dövlət Komissiyası (TQDK) yaradıldı. TQDK öz fəaliyyətini 2016-cı ilin aprel ayına qədər davam etdirdi. 11 aprel 2016-cı ildən artıq Dövlət İmtahan Mərkəzi (DİM) yaradıldı.

*Test* ingilis sözü olub sınaq, yoxlama, ölçü, meyar deməkdir. Test pedaqoji nəzarətin bir vasitəsidir. Pedaqoji nəzarət pedaqoji prosesin bir sıra funksiyalarını yerinə yetirir:



Test ümumi şəkildə adi tapşırıqlar toplusu deyil, elmi məzmunu ilə daha zəngin olan “sistem” kateqoriyası, yəni müəyyən bütövlüyü təşkil edən, bir-biri ilə əlaqəli elementlər kompleksi kimi qəbul edilir. Deməli, onun tərkibində sistem yaradan xüsusiyyətlərə malik olan tapşırıqlar var.

Məktəblərdə şagirdin bilik, bacarıq və vərdişlərinə pedaqoji nəzarətin test vasitəsi 3 amilə əsaslandıqda daha effektiv nəticə alınır:

❖ Müddət – rüb, tədris ili və s.

❖ Tezlik – dərs, mövzu və ya bölmənin sonunda

❖ Mürəkkəblik

Testlərin müsbət və mənfi cəhətlərini aşağıdakı şəkildə xarakterizə etmək mümkündür.

| ***Müsbət*** | ***Mənfi*** |
|---|---|
| *1. Qiymətləndirmənin ən obyektiv və ədalətli üsuludur.*<br>*2. Tədris vahidinin bütün mövzu və anlayışlarının qiymətləndirməyə imkan verir.*<br>*3. Bütün şagirdlərə eyni şəraiti yaradır.*<br>*4. Qiymətləndirmə eyni vaxtda aparılır.*<br>*5.Vaxta qənaət olunur.* | *1. Məqsədə uyğun test tapşırığının tərtib edilməsi uzun vaxt tələb edir.*<br>*2. Şagirdlərin şifahi və yazılı nitqinə mənfi təsir göstərir.*<br>*3. Şagirdlərin cavabı təsadüfü xarakter daşıya bilər.* |

Testlər *ənənəvi* və *qeyri-ənənəvi* olmaqla 2 sinfə ayrılır. Ənənəvi testlər əvvəlcədən tədris olunmuş materialın şagirdlərin hazırlıq səviyyəsini yoxlamaq və strukturunun diaqnostikası üçün standartlaşdırılmış tapşırıq üsuludur. Ənənəvi testin *homogen* və *heterogen* formaları mövcuddur. Homogen formalı testlər bir fənn üzrə şagird nailiyyətlərinin qiymətləndirilməsində istifadə olunur. Heterogen formalı testlər bir neçə fənn üzrə şagird nailiyyətlərinin qiymətləndirməsini həyata keçirir. Heterogen formalı testlərə şagirdlərin ali məktəblərə qəbulu zamanı tətbiq olunan test tapşırıqlarını misal göstərmək olar.

Qeyri-ənənəvi testlərin *inteqrativ* və *adaptiv* formaları mövcuddur. İnteqrativ testlər şagirdlərdə iki və daha artıq fənn üzrə bilik və bacarıqlarının diaqnostikasında istifadə olunur. Belə test tapşırıqları yalnız iki və daha artıq fənn üzrə biliyə malik olan müəllimlər tərəfindən tərtib olunur. İnteqrativ testlərin heterogen testlərdən üstün cəhəti daha informativ məzmunda tərtib olunmasıdır. Adaptiv testlərdə şagird nailiyyətləri kompüter vasitəsilə qiymətləndirilir. Kompüterin yaddaşındakı test tapşırıqları 3 qrupa – sadə, orta və mürəkkəbə bölünür. Digər test formalarından fərqli olaraq şagirdlərə əvvəlcə orta test tapşırıqları təqdim olunur. Test tapşırığının cavabına əsasən ya sadə, ya da mürəkkəb tapşırıqlar şagirdlərə təqdim olunur. Əsas müsbət cəhəti qısa müddət ərzində şagird nailiyyətlərinin daha effektli qiymətləndirilməsidir.

Sınaq prosedurlarının müvəffəqiyyəti istifadə olunan test tapşırıqlarının növü, məzmunu və tərtibindən asılıdır. Biologiyada əsasən açıq və qapalı tipli test tapşırıqlarından istifadə olunur. Test tapşırıqları məzmun etibarilə aşağıdakılardan ibarətdir.

1. *Qapalı formada tapşırıqlar*. Tapşırıq cavab üçün stimul rolunu oynayan əsas mətndən (təlimatdan) və yalnız biri düzgün olan bir neçə cavab variantından ibarətdir.

2. *Açıq formada tapşırıqlar*. Onlar hazır cavablardan istifadə etmirlər və mövzu tapşırığın düzgünlüyünün göstəricisi olacaq çatışmayan sözü (sözlər qrupunu) daxil etməlidir.

3. *Uyğunluğun müəyyən edilməsi üçün tapşırıqlar*. Belə tapşırıqlarda imtahan verəndən iki siyahının elementləri arasında uyğunluğu müəyyən etmək tələb olunur.

4. *Düzgün ardıcıllığın qurulması üçün tapşırıqlar.* Bu tip tapşırıqlar müəyyən bir məzmunda təkrarlanan elementlərdən istifadə edilir və təhsil fəaliyyətlərində biliklərə nəzarət etməyə imkan verir.

*Tapşırıq sxemi – təlimat, əsas mətn, elementlərin siyahısından ibarətdir*.

Qapalı tipli tapşırıqlar verilən suala bir neçə hazır nömrələnmiş cavabın olmasını təmin edən tapşırıqlardır:

- yoxlanılan şəxs təklif olunan bir sıranın, siyahının düzgün (və ya səhv) elementlərindən bir və ya bir neçə düzgün cavabı seçir;

- siyahının elementlərini şərti ardıcıllıqla düzür və s.

*Çoxseçimli qapalı test tapşırıqları* – bu testlər pedaqoji testlərdə istifadə olunan əsas tapşırıq növüdür, çünki bu tapşırıqlar, ilk növbədə, səhvlərlə birlikdə düzgün cavabın olması səbəbindən sınaqçılar tərəfindən yaxşı başa düşülür; ikincisi, onlar yüksək texnologiyalıdır (biliklərə nəzarət asanlıqla avtomatlaşdırılır); üçüncüsü, onlar müəlliflərə məzmun və mürəkkəblik baxımından paralel olan unifikasiya (vahid şəklə salınma) - vahid test variantları yaratmaq üçün geniş imkan yaradır.

*1.Ümumiləşdirci test tapşırıqları*

Orqanlar sistemi haqqında düzgün mülahizəni seçin:

a) bədən boşluğunda yerləşən orqanlardır;

b) quruluşuna, mənşəyinə və yerinə yetirdiyi funksiyalara görə oxşar hüceyrələr qrupudur;

*c) ümumi funksiyaları bir yerdə yerinə yetirən orqanlar qrupudur;*

d) ümumi funksiyaları birgə yerinə yetirən toxuma qrupudur;

e) orqanizmə faydalı funksiyaları yerinə yetirmək üçün müvəqqəti birləşən hüceyrə qrupudur.

*2. Uyğunlaşdırıcı test tapşırıqları*

X, Y və Z – ni müəyyən edin.

Noxud Qarğıdalı




1. Çiçəkləri ikicinslidir
2. Mayalanma ikiqatdır
3. Külək vasitəsilə tozlanır
4. Dişi çiçəkləri qıça çiçək qrupunda toplanıb
5. Meyvəsi qurudur
6. Ləpə yarpaqlarında ehtiyat qida maddələri yerləşir

**X** **Y** **Z**

a) 1,3 4,5 2,6

b) 2,4 1,5 3,6

c) 3,6 2,4 1,5

***d) 1,6 2,5 3,4***

e) 1,5 2,6 1,4

*3. Ardıcıllığı müəyyənləşdirən test tapşırıqları*

Ulotriks sapının cinsi çoxalma ardıcıllığını düzgün tərtib edin.

1. Ziqot
2. 4 ədəd qamçısız sporların yaranması
3. 2 qamçılı qametlərin yaranması
4. Qametlərin birləşməsi
5. Yeni ulotriks

a) 13452

***b) 3 4 1 2 5***

c) 23415

d) 54321

e) 42135

*4. Hesablama tələb edən test tapşırıqları*

Normal şəraitdə insan 320 tənəffüs hərəkəti etmişdir. Bu zaman daxilində onun iki böyrəyində neçə litr qan daxil olmuşdur?

a) 50

b) 30

***c) 40***

d) 42

e) 20

*5. Şəkillərə əsaslanan test tapşırıqları*

Şəkildə xanı balığın neçə sümüyü qeyd olunmuşdur?



a) 2

***b) 3***

c) 1

d) 4

e) 5

*6. Terminlərə əsaslanan test tapşırıqları*

Latın mənşəli “transkripsio” sözünün mənası nədir?

*a) Üzünün köçürülməsi*

b) Rəng

c) Tamamlama

d) Çıxıntı

e) Həll edirəm

*7. İnkar hissəciyi olan test tapşırıqları*

Toxuma qruplarından hansına insan orqanizmində rast gəlmək olmaz?

a) Birləşdirici
b) Sinir
***c) İfrazat***
d) Epiteli
e) Əzələ

Testlər qısa müddət ərzində şagirdlərin bilik bacarıqlarını qiymətləndirməyə imkan verir. Buna görə də müasir təhsil sistemində şagird nailiyyətlərinin qiymətləndirilməsində testlərdən geniş istifadə olunur. Şagird nailiyyətlərinin qiymətləndirilməsində standart testlərlə yanaşı situasiya tipli tapşırıqlardan istifadə olunur ki, bunun da əsas məqsədi şagirdlərin test tapşırıqlarının cavablarını kor təbii seçməsinin qarşısının alınmasıdır.

**Problemin aktuallığı.** Azərbaycan Respublikasının təhsil sistemində şagird nailiyyətlərinin qiymətləndirilməsi test tapşırıqlarını ön plana çəkir. Test tapşırıqları müasir təhsil sistemində qiymətləndirmənin əsas vasitəsi hesab olunur. Ümumtəhsil məktəblərində düzgün məzmunda tərtib olunmuş test tapşırıqları şagirdlərin qiymətləndirilməsində müsbət rol oynayır.

**Problemin elmi yeniliyi.** Test tapşırıqlarının inkişaf tarixi araşdırılmış, onun pedaqoji nəzarətdə hansı funksiyaları yerinə yetirdiyi dəyərləndirilmiş, biologiya fənni üzrə ümumiləşdirici, uyğunlaşdırıcı, ardıcıllıq, hesablama tələb edən, terminlərə əsaslanan test tapşırıqlarının səmərəli yolları tərtib olunmuşdur.

**Problemin praktik əhəmiyyəti.** Təhsil perspektivlərin düzgün müəyyənləşdirilməsində qiymətləndirmə vasitələrindən istifadə etməmək qeyri-mümkündür. Bu məqsədlə şagirdlərin bilik, bacarıq və vərdişlərin həmçinin, təfəkkür və təxəyyülün qiymətləndirilməsində testlərin rolu danılmazdır.

**Ədəbiyyat:**

1. Батешов Е.А. Основы технологизации компьютерного тестирования: Учебное пособие. — Астана: ТОО «Полиграф-мир», 2007
2. Болотов, В.А. Система оценки качества образования / В.А.Болотов, Н.Ф.Ефремова. – М.: Университетская книга, Логос, 2007.
3. Кабанова Т.А., Новиков В.А. Тестирование в современном образовании. Уч. пособие. — М.: Высшая школа, -2010.
4. Test toplusu / 1994-2013 /
5. Elnur Məmmədov, Faiq Ağayev. Biologiya, Abituriyentlər üçün tapşırıqlar toplusu I,II hissə, -2021

**E-mail**: xosqedem.ibrahimova59@gmail.com
mammadovr00@gmail.com

**Rəyçilər:** *biol.ü.fəl.dok. dos.* **A.M. Həsənova,**
*biol.ü.fəls.dok.* **Q. Əliyev**
**Redaksiyaya daxil olub:** 16. 02.2023

# *TƏSVİRİ İNCƏSƏNƏTİN TƏDRİSİ METODİKASI*
# *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИЗОБРАЗИТЕЛЬНОГО ИСКУССТВА*
# *METHODS OF TEACHING FINE ARTS*

*UOT 372.87.0*

***Fərahim İbrahim oğlu Zeynalov***
*pedaqogika üzrə fəlsəfə doktoru,*
*Əməkdar rəssam*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti*

## MÜASİR TƏSVİRİ İNCƏSƏNƏT VƏ ONUN TƏDRİSİNİN AKTUAL MƏSƏLƏLƏRİ

***Фарахим Ибрагим оглы Зейналов***
*доктор философии по педагогике,*
*Заслуженный художник*
*доцент Азербайджанского Государственного Педагогического Университета*

## АКТУАЛЬНЫЕ ВОПРОСЫ СОВРЕМЕННОГО ИЗОБРАЗИТЕЛЬНОГО ИСКУССТВА И ЕГО ПРЕПОДАВАНИЯ

***Farahim Ibrahim Zeynalov***
*doctor of philosophy in pedagogy, Honored artist*
*associate professor of Azerbaijan State Pedagogical University*

## TOPICAL ISSUES OF MODERN FINE ART AND ITS TEACHING

**Xülasə.** XX əsin əvvəllərində bütün ənənələri və klassik bədii məktəbləri inkar edərək, yeni dünyagörüşləri ilə incəsənətə gələn və bir sıra cərəyanları özündə birləşdirən avanqardçılar müasirliyi tərənnüm etməyə başladılar. Lakin bu cərəyanların bəzilərinin təsviri nəticəsində incəsənətdə estetik dəyərlər itməyə başlayır və yerinə heç bir yeni ideal və dəyərlər təklif edilmirdi, incəsənəti tənəzzül səviyyəsinə gətirməklə insanların dünyagörüşlərində problemlər və xaos yaranırdı, insanlar idealsız, dəyərlərsiz, həyata uyğunlaşmağa məhkum olurdular.

Təsviri incəsənət hər zaman dövrü ilə həmahəng müasir olmuş və cəmiyyətin ümumi dünyagörüşünü əks etdirmişdir. Təsviri incəsənətin müasir tədrisi, qavramanın, təfəkkürün, incəsənət sahəsində biliklərin qazanılması, təsviri fəaliyyətin praktiki bacarıqlarına yiyələnməsi ilə bağlı geniş məsələləri özündə birləşdirir.

Bu cür məsələləri yalnız yüksək ixtisaslı, həm pedaqogika, həm də təsviri incəsənət sahəsində professional çalışan müəllim-rəssamlar həll edə bilərlər.

***Açar sözlər:*** *təsviri incəsənət, müasir, tədris, cəmiyyət, rəssamlar, inkişaf*

**Резюме.** В начале XX века авангардисты, пришедшие в искусство с новым мировоззрением и объединившие ряд течений, стали прославлять современность, отвергая все традиции и классические художественные школы. Однако в результате влияния некоторых из этих течений в искусстве стали исчезать эстетические ценности и на их место не предлагались новые идеалы и ценности. Все это привело искусство к упадку, стали возникать проблемы и хаос в мировоззрении людей, и они были обречены на приспособление к жизни без идеалов и ценностей.

Изобразительное искусство всегда было современным, гармонировало с эпохой и отражало общее мировоззрение общества. Современное преподавание изобразительного искусства объединяет широкий круг вопросов, связанных с восприятием, мышлением, усвоением знаний в области искусства, приобретением практических навыков изобразительной деятельности.

Такие вопросы могут решать лишь высококвалифицированные педагоги и художники, профессионально работающие в сфере педагогики и изобразительного искусства.

***Ключевые слова:*** *изобразительное искусство, современный, преподавание, общество, художники, развитие*

**Summary.** At the beginning of the 20th century, avant-garde artists, who came to art with a new worldview and united a number of trends, began to glorify modernity, rejecting all traditions and classical art schools. However, as a result of the influence of some of these currents, aesthetic values began to disappear in art and new ideals and values were not proposed in their place. All this led art to decline, problems and chaos began to arise in the worldview of people, and they were doomed to adapt to life without ideals and values.

Fine art has always been modern, harmonized with the era and reflected the general worldview of society. Modern teaching of fine arts combines a wide range of issues related to perception, thinking, mastering knowledge in the field of art, and acquiring practical skills in fine arts.

Such issues can be solved only by highly qualified teachers and artists who professionally work in the field of pedagogy and fine arts.

***Key words:*** *fine arts, contemporary, teaching, society, artists, development*

XX əsr incəsənəti bütün ənənələrdən və klassik bədii məktəblərdən imtina edərək yeni həqiqətlər – yeni ifadə vasitələri axtarışlarına çıxan avanqardçıların nümayişləri ilə başlayır. Kubizm, sürrealizm, dadaizm, futurizm, ekspressionizm, abstrakt incəsənət, funksionalizm cərəyanlarını bir adda – "modernizm"də birləşdirən avanqardçılar (XIX ə. axırı – XX ə. əvvəlləri incəsənət və ədəbiyyatı) müasir incəsənət kimi əsrlər boyu formalaşan ənənəvi incəsənətin yerini tutmağa başlayır.

XX əsr kəskin ziddiyyətli, dərin sosial münaqişələr və ümidsizlik əsri olmaqla bərabər, insanların ümidləri ilə bağlı cəmiyyətin inkişafında yeni, daha kamil axtarışlar əsri kimi də tarixə yazıldı. Bu əsrdə baş verən dərin dəyişikliklər insan fəaliyyətinin bütün sahələrinə, o cümlədən ideologiya, mədəniyyət və incəsənət sahələrinə də öz təsirini göstərdi.

Əvvəlki dövrlərdə rəngkarlıq, heykəltəraşlıq və qrafika real həyatla bu qədər daha sıx bağlı olmamışdı. Buna baxmayaraq hər bir şeyin kəskin inkar edilməsi də əvvəllər bu qədər aydın özünü göstərməmişdi. Əsrin əvvəllərindən coşqun inkişaf edən incəsənət özünün əvvəlki üslub tamlığını itirməyə, daha da qeyri-bərabər, sıçrayışlı davam etməyə başlayır, incəsənətin ayrı-ayrı növlərinin yaradıcılıq əlaqələri pozularaq fərdilik qayələrinə geniş yer verməyə başlayırdı. Əvvəlki dövrlərdə olduğu kimi, XX əsrdə də rəngkarlıq üslubları dövrün mənası və onun əsatirləri ilə sıx bağlılıq təşkil edir. Lakin bu dövrdə əsatirlərin yerini rəssamları dünyanı adət elədikləri baxışdan imtina etmələrinə vadar edən elmi-texniki tərəqqi tutmağa başladı. İnqilabi və eksperimental islahatlar, çoxsimalılıq, yaradıcılıq axtarışlarındakı müxtəliflik və kontrastlıq XX əsrin incəsənətinin fərqləndirici xüsusiyyətlərindəndir. XX əsrin əvvəllərində incəsənət formaların həyatiliyi prinsiplərindən inadla uzaqlaşmağa başlayır. Bu sahədə ilk addımları kubistlər atdılar. Kubistlər naturanı deformasiyaya uğradaraq sadə həndəsi formalara saldılar. Onları isə surətin gözəlliyini və həyatın dinamizmini tərənnüm edən futuristlər, rənglərin uyğunluğunda harmoniya axtaran orfistlər, maşın estetikasını təbliğ edən puristlər və s əvəz etdilər.

Elmi-texniki tərəqqinin sürətli inkişafı insan təfəkküründə böyük dəyişikliklərə gətirib çıxardı. Bəşərin ictimai və mənəvi həyatında neçə-neçə əsrlər formalaşan əxlaqi və tərbiyəvi məsələləri, həyatın məqsədyönlüyü ideyaları qısa bir müddətdə məhv olmaq qorxusu ilə üzləşdi. Məğzini irrasionallıq təşkil edən bu cərəyanlar gerçəkliyi özünə ram etmək üçün sürət almaqda davam edirdi.

Ümumi qeyri-şüuriliyə aparan, qadağan olunmuş və qaranlıq məsələlərə maraq yaradan və s. postmodernizm rəssamları XX əsrin sonuna qədər dünyaya yeni baxış, bir insanda (rəssamda) tarixçini, filosofu, yazarı birləşdirərək incəsənəti keyfiyyətcə yeniləşdirməyə çalışırdılar.

Ən böyük sosial fəlakətlər və dəhşətli dünya müharibələrilə bərabər elmi-texniki tərəqqinin sürətli sıçrayışı ilə zəngin XX əsrin bədii mədəniyyəti bəşəriyyətə özünün müsbət cəhətləri ilə yanaşı, mənfi təsirlərini də göstərməkdə idi. Bu, təbii olsa da bir çox xalqların

əsrlər boyu formalaşan mədəni irsində özünü göstərməyə başlayır. Cəmiyyətdə yaranan kəskin kontrastlıq onun sonrakı inkişafında ziddiyyətlər yaratmağa başladı.

Bu cür cərəyanlardan bəzilərinin hansı fəlsəfi ideyalara arxalandığına nəzər salaq.

*Dadaizm* - Birinci dünya müharibəsi illərində yaranmış bu cərəyanın ardıcılları həyatı mənasız sayırdılar. Onlar bütün etik qaydaların məhvini əsas ideya kimi götürmüşdülər. Əsas prinsip – elm, məntiq və idrakı inkar etmək idi. Baniləri: şair Hüqo Ball, Riçard Hölsenbek və rəssamlar Hans Arp, Maks Ernst və Marsel Yanko.

*Futurizm* – Mədəni irsi, xüsusən estetik, bədii, mənəvi-əxlaqi dəyərləri və sərvətləri inkar edən futuristlər urbanizmi təbliğ etmişlər. İtaliyada yaranan futurizm əvvəlcə Rusiyaya, sonra isə digər Avropa ölkələrinə yayılmışdı. Cərəyanın banisi şair Filippo Marinneti faşizmin fəal təbliğçilərindən olmuşdur.

Əsrlər boyu formalaşan üslublar – nümunələr öz dəyərlərini itirirdi. Hər bir "söz deməyə" qadir rəssam öz üslubunu, öz dəsti-xəttini yaratmağa çalışır. Bütün və hər cür mövcud meyarların silinməsi insanların hisslərində böyük bir boşluq yaratmaqda idi. Əsl incəsənət saxtalaşmış, gözəllik – eybəcərliklə, mənəvilik – mənəviyyatsızlıqla əvəz edilmişdi. Mədəniyyət kiçilərək maraqlara tabe edilmişdi.

Əsrin əvvəllərində Avropada vüsət almış bu cərəyanlar tez bir zamanda insanların təfəkküründə özünə yer etdi. Ənənəvi etik və estetik dəyərləri sürətlə itirən avropalılar qlobal fəlakətlərlə üzləşməyə başladılar. Buna baxmayaraq, incəsənətdə böyük hadisələr baş verirdi. Korbuzye, Rayt, Pikasso, Şaqal, Matiss və bir sıra başqa sənətkarlar öz bədii fərdilikləri sayəsində böyük iz buraxmağa nail oldular.

Avropadan digər istiqamətlərdə yayılmağa başlayan incəsənət müxtəlif ərazilərdə müxtəlif cür təsirlər göstərirdi. Əsrin ilk yarısında Rusiya və bir sıra şərq dövlətlərində baş verən inqilab nəticəsində yaranan Sovetlər birliyi bu cür cərəyanlara qarşı duraraq öz dəyərlərini yaratmağa başlayır. Lakin bu cərəyanların güclü axını təzə yaranan sovetlər birliyinə də təsir göstərilməkdə idi. Dövlət başçıları bununla mübarizəni gücləndirərək əks dəyərlər qarşıya çıxarmalı idilər. Ona görə Sovetlər dönəmində realizmi yenidən dirçəldərək postmodernizmə qarşı sosialist realizmini qoymağa başladılar. Heç də asan başa gəlməyən bu cür qarşıdurmalar milyonlarla insanların həyatı bahasına baş verirdi. Rus təsviri sənət məktəbinin əsasında inkişaf etməyə başlayan sosialist realizmində özünəməxsus (ideya məhdudiyyətli təbliğat maşını) təsviri sənət məktəbləri inkişaf edirdi. Bu cür məktəblər isə böyük rəssamlar yetişdirməyə nail oldu. Bu totalitar rejimli dövlətin daxilində olan və əvvəllər heç bir təsviri sənət məktəblərinə və ya rəssamlarına malik olmayan kiçik dövlətlər və xalqlar da bu məktəblərdən bəhrələnərək öz incəsənətlərini yaratmağa nail olurlar.

XX əsrin sonlarında sosialist imperiyasının dağılması ilə onun tərkibindəki dövlətlər azadlıq əldə etdikdən sonra digər Avropa və Amerika məktəblərindən də bəhrələnməyə başlayırlar. Sovetlər birliyində yaradılan və formalaşmağa başlayan dəyərlər yenidən məhv edilməyə başlayır. Bu dəyərlərin məhvi təlim, tərbiyə, mənəvi, etik və estetik normaların itməsi ilə bu sahədə boşluğun yaranmasına gətirir. Bu boşluğun yerini xalqın ənənələrinə arxalanmış, onun mənəviyyatına uyğun və müasir dövrün tələblərinə cavab verən əsl dəyərlərin doldurulması vacib bir məsələyə çevrilir. Əks təqdirdə bu boşluğu xalqın mənəvi dəyərlərinə yad olan "modernist" dəyərlər tuta bilər.

XX əsrin əvvəlləri – incəsənətdə estetik dəyərləri itirən və yerinə heç bir yeni ideal və dəyərlər təklif etməyən postmodernizm incəsənəti tənəzzül səviyyəsinə gətirməklə insanların dünyagörüşlərində problemlər və xaos yaratdı, insanlar idealsız, dəyərlərsiz həyata uyğunlaşmağa başladılar. Yada salsaq ki, müqəddəs yer boş qalmır... Bu ideallar saxtalaşdı və yerinə yığıcılıq idealı gəldi.

Modernistlər incəsənətin kütləyə deyil, yüksək intellekt sahiblərinə aid olduğunu iddia edirdilər.

Belə bir sual yaranır. Onda incəsənətin mənası nədir və ya incəsənət nə üçündür və ya nəyə, kimə xidmət edir?

*Müasir dövrdə təsviri incəsənətin tədrisinə dair*

Dövrümüzdəki tərəqqi, elm və texnikadakı nailiyyətlər incəsənəti müasir dünya ilə özünəməxsus bir formada bağlayır. Bütün sahələrdə olduğu kimi, incəsənət də bu cür nailiyyətlərin

təsiri altına düşərək insanlığın mədəni inkişafında özünün yeni səviyyəsini müəyyən edir. Bu isə, eyni zamanda, bədii təhsil sistemində də böyük dəyişikliklərə gətirib çıxardır.

Müasir cəmiyyətdəki ziddiyyətlərin xarakterizə edilməsi göstərir ki, mövcud olan estetik dəyərlərdəki dəyişikliklər tamaşaçıda anlaşılmazlıq yaradır, bu isə əsrlər boyu formalaşmış dəyərlərin itirilməsi ilə nəticələnir. Böyüməkdə olan nəsil isə kütlə olaraq milli-mədəni irsi öyrənməyə maraq göstərmir. Xalqın tarixi abidələri, zəngin ədəbiyyatı və incəsənəti dəyərlərinin dəyişilməsi nəticəsində öz xüsusiyyətlərini itirməkdə davam edir. Elmi-texniki tərəqqinin müasir şəraitdə inkişafı isə elmin, təhsilin, mədəniyyətin və incəsənətin rolunu və ona olan tələbatı daha da artırır.

Təsviri incəsənət hər zaman dövrü ilə həmahəng müasir olmuş və cəmiyyətin ümumi dünyagörüşünü əks etdirmişdir. Kütlələrə güclü təsir etdiyi üçün rəssamın həyata olan münasibəti mühüm əhəmiyyət kəsb edir. “Təsviri incəsənət” anlayışı bədii yaradıcılığı ümumilikdə əhatə edir ki, buraya rəngkarlıq, qrafika, dekorativ-tətbiqi sənət, memarlıq, ədəbiyyat, musiqi, kino, teatr və digər fəaliyyət növləri aiddir. Bu fəaliyyət növlərini isə gerçəkliyin bədii obrazlar formasında əks edilməsi birləşdirir.

Mədəniyyət sahəsinin ən görkəmli nümayəndələri: rəssamlar, qrafiklər, memarlar, heykəltəraşlar, yazıçılar, aktyorlar, kinomatoqraflar daim öz yaradıcılıqlarında insanlığın ən yaxşı fikir və hisslərini ifadə etməyə çalışır, dünya mədəniyyəti incilərinə qayğı ilə yanaşırlar.

Spesifik xüsusiyyətlərinə görə təsviri incəsənət gerçəkliyin əyani formada əks olunması deməkdir. Bununla belə o, əqli, mənəvi, estetik, əmək və fiziki tərbiyə vasitəsi kimi dünyagörüşü formalaşdırır. Bu xüsusiyyətlər onun nə qədər böyük əhəmiyyət kəsb etdiyini göstərir və onun digər fənlər ilə bir sırada durmasını təmin edir. Təsviri incəsənət dərsləri yaradıcı təfəkkürü və nəzəri yaddaşı, fəza təsəvvürünü, bədii bacarıqları, təsviretmə bacarıq və vərdişlərini, iradələrini, şəxsi keyfiyyətləri inkişaf etdirən bir vasitə rolunu oynayır. Bu səbəbdən təhsilin ilk illərində ətraf mühiti düzgün görməyi, analiz və təsvir etməyi öyrətmək vacibdir. Ona görə də tələbələrin qarşısında təsviri savadın obyektiv qanunlarına əsaslanaraq gerçəkliyin düzgün təsviri durur.

Diqqət əsasən təsvir qayda və qanunauyğunluqlarının müəyyən zaman və mərhələlərlə aparılmasına verilməlidir. Müasir dövrün tələblərinə uyğun savadlı müəllimin rəhbərliyi ilə çalışan uşaqlar tədricən onları əhatə edən əşyaları öyrənməyə, formalar baxımından analiz etməyə çalışırlar. Müasir məktəbin vəzifəsi maraq və məsuliyyətlə, sevgi və ilhamla öz işini görə bilən insanı tərbiyə etməkdir. Bu vəziyyət təsviri incəsənətin tədrisinin müvafiq qoyuluşunu tələb edir. Onu yalnız estetik tərbiyə və təsviri savadın əsasları ilə məhdudlaşdırmaq olmaz. Təsviri incəsənətin müasir tədrisi qavramanın, təfəkkürün, incəsənət sahəsində biliklərin qazanılması, təsviri fəaliyyətin praktiki bacarıqlarına yiyələnməsi ilə bağlı geniş məsələləri özündə birləşdirir. Bu cür məsələləri yalnız yüksək ixtisaslı, həm pedaqogika, həm də təsviri incəsənət sahəsində professional çalışan müəllim-rəssamlar həll edə bilərlər.

Digər vacib məsələlərdən biri də müasirliyin düzgün qavranılması məsələsidir. Müasirlik dedikdə nə nəzərdə tutula bilər? İdeya baxımından bu necə ifadə edilməlidir? İstiqamətləndirici yol seçilməlidir. Bəs dəyərlər necə təyin edilməlidir? Tərbiyəvi rol nədən ibarət olmalıdır? Bu və digər başqa məsələlər öz həllini tapmalıdır.

Bəzən belə iddia edirlər ki, müasirlik hər cür köhnəliyə, mühafizəkarlığa, vaxtı ötmüş prinsiplərə zidd olmalıdır. Müasirlik novatorluq kimi götürülməli, yaradıcılıq yalnız müasir həyatın bədii təhlili kimi çıxış etməlidir. Sənət əsəri dövrün, zəmanənin, müasirliyin dərin fəlsəfi mənasını ibrətamiz bəşəri həqiqətləri açmalıdır. Vaxtı ötmüş, köhnəlmiş forma və üslub prinsiplərindən imtina edilməlidir. Müasir məzmun bədii formanın da müasir olması deməkdir. Eyni zamanda, bir çox dövrlərdə olduğu kimi, siyasi və sırf tələbat baxımından da bu məsələyə yanaşmaq olmaz. Və bunu da qeyd etmək lazımdır ki, zaman keçdikcə əldə edilən nailiyyətlər dövrün tələblərinə uyğun gəlmədikləri üçün silinib atılmamalıdır. Bu cür yanaşma tarixi köklərin itməsi, ənənələrin unudulması ilə nəticələnə bilər.

Xalqımızın tarixi olan sovetlər birliyi dövründə siyasi ideyalar məngənəsində məhdudlaşdırılan təfəkkür azadlığı psevdonovatorluq ide-

yaları ilə istiqamətləndirilirdi. Bu dövrdə insanlarda formalaşan ictimai və estetik ideallarının tələblərinə uyğun dəyərlər tərbiyə edilirdi, incəsənətdə də digər sahələrdə olduğu kimi, xalqın həyatı başlıca amil götürülərək sənət adamları, əmək və müharibə qəhrəmanları ön plana çəkilərək siyasi-ideya qayəsi kimi təqdim edilirdi. Bu cür təfəkkür "azadlığı" dövründə incəsənət ustaları tariximizə yazılacaq monumental əsərləri yaratmağa nail olmuşlar. Onilliklər ərzində özünəməxsus formada və ənənələrə arxalanaraq formalaşan məktəblər bir çox incəsənət xadimlərinin yetişməsinə səbəb olmuşdur.

Son dövrlər baş verən ictimai-siyasi dəyişikliklər keçmiş dövrün nailiyyətləri müasirlik üçün heç bir qiyməti olmayan bir dəyərlər kimi kökündən silinərək atılmaqdadır. Bir çox sənət adamları bu cür əsərləri incəsənət əsərləri kimi qəbul etmir, burada "azad ruhun" olmaması kimi qiymətləndirirlər.

Yaddan çıxarmaq lazım deyil ki, bu da xalqın bir tarixidir və bu tarixin həm yaxşı, həm də pis tərəfləri olmuşdur. Və bu tarixin tamamilə silinərək hər şeyin yenidən qurulmasını çıxış yolu kimi görmək düzgün olmaz. Bu dövrdə yaranan və formalaşan məktəblər, ixtisaslaşan və təkmilləşən mütəxəssislər hələ neçə-neçə nəsilləri yetişdirə bilər. Ona görə hər bir yeni tələb xalqın tarixi irsinə əsaslanaraq formalaşmalı və inkişaf etdirilməlidir. Hər bir müasir təhsil metodlarının seçilərək kor-koranə tətbiq edilməsi və bir neçə illər sonra lazımı nəticələrin əldə edilməməsi baş verdikdə hansı problemlərin yaranacağı nəzərə alınmalıdır. Bunun baş verməməsi və daha da yaxşı nəticələr əldə edilməsi üçün mövcud olan və ənənələrə arxalanan məktəblərdə dövrün tələblərinə uyğun islahatların aparılması daha səmərəli olardı. Hər bir yeni yaxşı, yaddan çıxan köhnə ola bilər.

XXI əsrin əvvəllərində təhsildə olan problemlərin aktuallığı və əhəmiyyəti müasir tələblərə uyğun islahatların aparılmasını tələb edir. Təhsilalanların yaradıcılıq potensialı artırılmalı, maraqlı və keyfiyyətli olmalı, istedadlı uşaqlar üzə çıxarılmalıdır.

Təsviri incəsənətin tədrisi bizə nə verir? Tədrisin düzgün qoyuluşu savadlı görməyi, ətraf mühiti analiz və təsvir etmək bacarıqlarına yiyələnməyi öyrədir, tərtibli və çalışqan olmağa sövq edir. Bu səbəbdən gələcək nəsillərin tərbiyəsi və mədəni inkişafı üçün böyük məsuliyyət müəllimlərin üzərinə düşür, istər orta, istərsə də ali məktəb müəllimlərinin professional hazırlığı tədris edilən biliklərin həcminin, məzmununun və keyfiyyətinin yüksək olması deməkdir. Təsviri incəsənət dərslərinin düzgün qoyuluşu, yaxşı təşkil olunması, sistematik və maraqlı keçirilməsi onların mənəvi inkişafında, dünyagörüşlərinin formalaşmasında, yaradıcılıq bacarıqlarının üzə çıxmasında və təkmilləşməsində böyük rol oynayır. Bunun üçün təbiətdəki və incəsənətdəki gözəllikləri dərindən hiss etmək və qiymətləndirmək, səmərəli çalışmaq lazımdır.

Təsviri incəsənətin tədrisinə yanaşmanın yeni yolları, onların müxtəlifliyi, tədris və təsvir metodların çoxluğu əks təsir də göstərə bilər. Tarixə nəzər salsaq görərik ki, təsviri incəsənətin tədrisində yeniliklər etmək xatirinə realizmdən uzaqlaşmaq bu sistemlərin tez bir zamanda aradan qalxmasına səbəb olmuşdur. Çünki bu cür sistemlər əsrlərlə formalaşmış və özünü doğrultmuş ümumi tədris və tərbiyə məsələləri ilə ziddiyyət təşkil etmişdir.

Orta ümumtəhsil məktəblərində realistik təsvirin əsaslarının tədrisinə ya lazımi diqqət yetirilmir, ya da ki, ümumiyyətlə, təsviri incəsənət dərsləri ikinci dərəcəli fənn kimi yanaşılaraq digər dərslərlə əvəz edilir. Bu çox böyük bir səhv mövqedir. Yaddan çıxarmaq lazım deyil ki, rəsm fənni bütün digər fənlərlə sıx əlaqəlidir. Çox zaman insanlar riyaziyyat, fizika, tarix kimi fənlərin əhəmiyyətini yüksək tutduqları halda, yaddan çıxarırlar ki, o fənlərin hər biri rəsmsiz keçinə bilməz.

Digər səhv yanaşma isə rəsm müəllimlərinin dərsə münasibətlərindədir. Çox zaman təsviri incəsənət müəllimləri şagirdlərə müstəqil mövzular verərək sadə tamaşaçıya çevrilirlər. Verilən tapşırığı məsuliyyətlə yerinə yetirən uşaqlar yaradıcılıqdan uzaqlaşaraq icraçıya çevrilirlər. Buna baxmayaraq, təsviri incəsənətin tədrisi metodikasının əsas prinsipləri yaradıcılıq məsələlərindən ayrıca baxıla bilməz. Lakin təsviri biliklərlə möhkəmlənməmiş yaradıcılıq işləri gerçəkliyin sadəlövh və primitiv əks olunmasına gətirib çıxaracaq. Təsviri sənət təsvir qanunlarına, tarixi təcrübə və təsviri savadın ənənələrinə əsaslanmalıdır. Təsvir vasitələrinə yiyələnmək üçün mütləq şəkildə yaradıcı münasibət olmalıdır ki, bu da tədricən tərbiyə və inki-

şaf etdirən güclü çalışmaların sayəsində mümkündür.

**Problemin aktuallığı**. Müasir dövrdə nəzəri və praktik məsələlərinin öyrənilməsində yeni yanaşmalar tələb olunur. Təsviri incəsənət insanın dünyagörüşünün formalaşmasında, həyat hadisələrinin dərk olunmasında mühüm rol oynayır.

**Problemin elmi yeniliyi.** Məqalədə müasir dövrdə təsviri incəsənətin yeni yanaşmalar əsasında tədqiqi və tədrisin əhəmiyyəti, tədris prosesində müəllimin fəaliyyət istiqamətləri şərh olunur.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə əksini tapmış ideyalardan tədris prosesində, dərslik və metodik vəsaitlərin hazırlanmasında istifadə edilə bilər.

**Ədəbiyyat:**

1. Əfəndiyev, R.S. Təsviri sənət. / R.S. Əfəndiyev, M.M. Nəcəfov, M.N. Tərlanov. ‒Bakı: ‒1992.
2. Həbibov, N.D. Təsviri sənət haqqında. / N.D. Həbibov. ‒Bakı: ‒1967.
3. Cəlilov, Y.Q. Naturadan rəsm dərsinin təşkili. / Y.Q. Cəlilov. ‒Bakı: ‒2000.
4. Zeynalov, D.İ. Plener. / D.İ. Zeynalov, A.Ə. Həşimov ‒Bakı: ‒2008.
5. Власов, В. Теория формообразования в изобразительном искусстве. / В. Власов.‒ Санкт-Петербург: ‒2017.
6. Смит, Р. Настольная книга художника. / Р. Смит.‒Москва: ‒2004.
7. Сокольникова, Н.М. История изобразительного искусства. / Н.М. Сокольникова, ‒Москва, ‒2007.
8. Сонстон, К. Рисунок XVII-XVIII веков. / К. Сонстон ‒Москва: Боленусю,‒1985.
9. Омельяненко, В.В. Основы изобразительного искусства. / В.В. Омельяненко.‒Ростов на Дону: ‒2010.

**E-mail:** farahim@mail.ru
**Rəyçi:** *ped.elm.dok.,prof.* **İ.H. Cəbrayılov**
**Redaksiyaya daxil olub:** 22. 02.2023

## *MÜNDƏRİCAT*
## *ОГЛАВЛЕНИЕ*
## *CONTENTS*

### *ÜMÜMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN ANADAN OLMASININ 100 İLLİYİ QARŞISINDA*
### *К 100-ЛЕТИЮ СО ДНЯ РОЖДЕНИЯ ОБЩЕНАЦИОНАЛЬНОГО ЛИДЕРА ГЕЙДАРА АЛИЕВА*
### *ON THE 100 th ANNIVERSARY OF THE NATIONAL LEADER HEYDAR ALIYEV*



### *ÜMUMPEDAQOJİ PROBLEMLƏR*
### *ОБЩЕПЕДАГОГИЧЕСКИЕ ПРОБЛЕМЫ*
### *GENERAL PEDAGOGICAL PROBLEMS*

*TƏLİM TEXNOLOGİYALARI*
*ОБУЧАЮЩИЕ ТЕХНОЛОГИИ*
*LEARNING TECHNOLOGIES*

***DİSTANT TƏHSİLİN AKTUAL PROBLEMLƏRİ***
***АКТУАЛЬНЫЕ ПРОБЛЕМЫ ДИСТАНЦИОННОГО ОБРАЗОВАНИЯ***
***ACTUAL PROBLEMS OF DISTANCE EDUCATION***



***TƏHSİLİN İDARƏEDİLMƏSİ MƏSƏLƏLƏRİ***
***ISSUES OF EDUCATIONAL MANAGEMENT***
***ВОПРОСЫ УПРАВЛЕНИЯ ОБРАЗОВАНИЕМ***



***MƏKTƏBƏQƏDƏR TƏHSİL VƏ TƏRBİYƏ***
***ДОШКОЛЬНОЕ ОБРАЗОВАНИЕ И ВОСПИТАНИЕ***
***PRESCHOOL EDUCATION AND UPBRİNGİNG***

***İBTİDAİ TƏHSİLİN AKTUAL PROBLEMLƏRİ***
***АКТУАЛЬНЫЕ ПРОБЛЕМЫ НАЧАЛЬНОГО ОБРАЗОВАНИЯ***
***ACTUAL PROBLEMS OF PRIMARY EDUCATION***



***MƏKTƏB VƏ PEDAQOJİ FİKİR TARİXİ***
***ИСТОРИЯ ШКОЛЫ И ПЕДАГОГИЧЕСКОЙ МЫСЛИ***
***HISTORY OF SCHOOL AND PEDAGOGICAL THOUGHT***



***PSİXOLOGİYA, YAŞ FİZİOLOGİYASI VƏ İNKLÜZİV TƏHSİL MƏSƏLƏLƏRİ***
***ПСИХОЛОГИЯ, ВОЗРАСТНАЯ ФИЗИОЛОГИЯ***
***И ВОПРОСЫ ИНКЛЮЗИВНОГО ОБРАЗОВАНИЯ***
***ISSUES OF PSYCHOLOGY, AGE PHYSIOLOGY AND INCLUSIVE EDUCATION***

*TƏSVİRİ İNCƏSƏNƏTİN TƏDRİSİ METODİKASI*
*МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИЗОБРАЗИТЕЛЬНОГО ИСКУССТВА*
*METHODS OF TEACHING FINE ARTS*

## İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYATIN BİBLİOQRAFİK TƏSVİRİ
## БИБЛИОГРАФИЧЕСКОЕ ОПИСАНИЕ ИСПОЛЬЗОВАННОЙ ЛИТЕРАТУРЫ
## BİBLİOGRAPHİC DESCRİPTİON OF USED LİTERATURE

Jurnalımızın son səhifələrində azərbaycanca, rusca və ingilis dilində "Məqalələrin yazılışına verilən tələbləri" əks etdirmişik. Bəzi müəlliflər həmin tələbləri ciddi şəkildə nəzərə aldıqları halda digər müəlliflər mövcud qaydaları gözləmədən redaksiyaya məqalə gətirir, yaxud elektron poçtla göndərirlər. Bu isə, o deməkdir ki, təqdim olunan məqalə işlənmək üçün geri qaytarılmalı, yaxud da redaksiya tərəfindən redaktə edilməlidir. Belə məqalələr, adətən zəif olur, özündə elmi ideya əks etdirmir, təsviri xarakter daşıyır, məqalənin sonunda verilən ədəbiyyat siyahısı da necə gəldi formalaşdırılır.

2019-cu ildə Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının yeni Əsasnaməsi təsdiq olunmuş, dissertasiyaların, avtoreferatların, ədəbiyyat siyahısının tərtibinə yeni tələblər verilmişdir. Ölkəmizdə dissertasiyaların əsas nəticələrinin dərc olunması tövsiyə edilən elmi nəşrlərdə öz məqalələrini görmək istəyən alimlər, gənc tədqiqatçılar – doktorantlar və dissertantlar "İstifadə edilmiş ədəbiyyatın biblioqrafik təsviri və nümunələr"i ilə tanış olmalı, həm dissertasiyalarında, həm məqalələrində, həm də konfrans materiallarında mövcud tələbləri nəzərə almalıdırlar.

"İstifadə edilmiş ədəbiyyatın biblioqrafik təsviri və nümunələr"i aşağıdakı bölmələrə ayrılır: nəşrin növü; biblioqrafik təsvirin forması; nümunələr.

**Tələblərə** diqqət yetirək: Çoxcildli nəşrlər belə yazılır: 1. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir: [46 cilddə] / H. Əliyev. – Bakı: Azərnəşr, – c. 45. 2013. – 384 s. 2. Azərbaycan Milli Ensiklopediyası / Red. hey. sədri İ.H. Əliyev. – Bakı: Azərbaycan Milli Ensiklopediyası Elmi Mərkəzi, – c. 8: Enollar – Fedin. – 2018. – 598 s. Müəllifi göstərilməyən nəşrlər: Azərbaycan bayatıları / tərt. ed. B.Abdulla – Bakı: XXI Yeni nəşrlər evi, – 2004. – 304 s.

**Müəllifi dörd nəfərədək olan nəşrlər**, o cümlədən bir müəllifli nəşrlər: Əlizadə, Ə.Ə. Qadın psixologiyası: Fəlsəfi-psixoloji esselər / Ə.Ə. Əlizadə. – Bakı: Təhsil, – 2015. – 416 s.

**İki və üç müəllifli nəşrlər**: Abbasov, A.N. Pedaqogika: Müntəxəbat. Dərs vəsaiti. / A.N. Abbasov, R.R. Məmmədzadə, L.A. Məmmədli. – Bakı: Mütərcim, – 2021. – 608 s.

**Müəllifi dörd və daha çox olan nəşrlər**. Dörd və beş müəllifli nəşrlər: Pedaqogika: Ali məktəblər üçün dərs vəsaiti / Y.R. Talıbov, Ə.Ə. Ağayev, A.İ. Eminov [və b.] – Bakı: Adiloğlu, – 2003. – s. 48

**Beşdən çox müəllifli nəşrlər**: Kurikulum bələdçisi: İzahlar və tətbiqlər / Ə.M. Abbasov [və b.] – Bakı: Elm və təhsil, – 2019. – 320 s.

**Jurnal məqalələri**: Məmmədli L.A. Şagirdlərin milli qəhrəmanların nümunəsində tərbiyə olunması // – Bakı: Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, – 2020. № 6, – s. 59-62.

**Müəllifi üçdən çox olan jurnal məqalələri**: Rüstəmov, Q.Ə. Vibrasiyalı kəsmə prosesində müqavimət momenti dəyişməsinin tədqiqi / Q.Ə. Rüstəmov, İ.A. Yolçuyev, Ə.T. Həzərxanov [və b.] // Milli Aviasiya Akademiyasının Elmi əsərləri, – Bakı: – 2005. №1, – s. 80-86.

**Konfrans materialları**: Аббасов, А.Н. Подготовка подростков и молодежи к семейной жизни // Материалы 66-й Международной научно-практической конференции на тему: «Актуальные вопросы науки», Москва: Спутник: -10 августа 2020, с. 33-37 Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, Cild 89 , № 6, 2022, № 5

**Dissertasiyalar**: Əliyeva, L.X. Təhsilin demokratikləşdirilməsi pedaqoji kadrların hazırlanmasının mühüm prinsipi kimi: ali pedaqoji məktəblərin bakalavr pilləsinin materialları əsasında: / pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyası) / – Bakı, 2012. – 147 s.

**Dissertasiyanın avtoreferatı**: Əliyev, R.S. Yeniyetmələrin yenidəntərbiyəsi üzrə işin sistemi: / pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyasının avtoreferatı) / - Bakı, 2003. - 29 s.;

**Elektron resurslar**: Меликов, А. Легенда о любви [Звукозапись] / – Баку, 1994. – CDROM. Azərbaycan etnik musiqisi: [Elektron resurs] / tərt. ed. T. Məmmədov və b.; Azərbaycan Respublikası Mədəniyyət və Turizm Nazirliyi. – Bakı, 2006. – DVD+; 13 sm

**Normativ-hüquqi sənədlər**: Azərbaycan Respublikasının Konstitusiyası // 12 noyabr 1995-ci ildə qəbul edilmişdir (24 avqust 2002-ci il tarixdə olan dəyişiklik və əlavələr). – Bakı: Qanun, – 2002, – 48 s.

**Qəzet məqalələri**: Abbasov, A.N. Pedaqoji internatura // Azərbaycan müəllimi. -2020, 22 avqust. – s. 6

**Arxiv materialları**: Xarici İşlər naziri Məhəmməd Həsən Hacınskinin məruzəsi (Gəncə: 15 iyul 1918-ci il) // Azərbaycan Respublikası Dövlət Arxivi, Fond № 1061, siyahı №1, iş № 95, vərəq –1.

Azərbaycan Respublikasının Təhsil İnstitutunun "Elmi əsərlər"inə pedaqogikanın, təhsil, təlim və tərbiyənin, didaktikanın, təhsilin idarə olunmasının müxtəlif məsələləri ilə bağlı məqalə yazan alimlərə, gənc tədqiqatçılara xahişimiz budur ki, istifadə edilmiş ədəbiyyatın siyahısını hazırlayarkən yuxarıda göstərilən qaydalara əməl etsinlər.

## TƏQDİM OLUNAN MƏQALƏLƏRƏ VERİLƏN TƏLƏBLƏR

1. Digər redaksiyalara təqdim olunmamış məqalələr qəbul edilir.
2. Məqalələr son tədqiqatların nəticələrini əks etdirməli, yeni ideyalarla zəngin olmalı, elmi məqalələrin yazılışına qoyulan tələblər gözlənilməlidir.
3. Məqalənin mətni təxminən 6-8 səhifə olmalıdır. Azərbaycan, rus və ingilis dillərində məqaləyə aid açar sözlər verilir.
4. Məqalənin mətni Azərbaycan dilində latın əlifbası (Times New Roman), rus dilində krill əlifbası və ingilis dilində ingilis (ABŞ) əlifbası ilə Times New Roman - 14 şrift ilə 1,5 intervalla yığılmalı, elektron variantı ilə birlikdə (disklə) təqdim olunmalıdır.
5. Məqalələr üç dildən - Azərbaycan, rus və ingilis dillərindən birində çap olunur. 3 dildə (Azərbaycan, rus və ingilis) məqalənin xülasəsi təqdim edilir. Xülasədə irəli sürülən başlıca elmi müddəalar, tədqiqatdan alınan nəticələr, problemin nəzəri və praktik əhəmiyyəti öz əksini tapmalıdır.
6. Məqalə aşağıdakı ardıcıllıqla yazılır: birinci sətirdə müəllif(lər)in adı, atasının adı və soyadı; ikinci sətirdə elmi dərəcəsi və elmi adı (yaxud doktorant də dissertant olması və s.); üçüncü sətirdə iş yeri, vəzifəsi; dördüncü sətirdə böyük hərflərlə məqalənin adı. Daha sonra bu qaydada həmin məlumatlar rus və ingilis dillərində təkrar edilir.
7. Həmmüəlliflərin üç nəfərdən artıq olması məqsədəuyğun deyildir.
8. Redaksiya məqalədə zəruri dəyişiklər və ixtisarlar, redaktə aparrmaq hüququna malikdir. 9. Məqalələrə iki mütəxəssisin rəyi, şöbə və ya kafedranın, həmçinin ali məktəbin Elmi Şurasının və ümumtəhsil, yaxud orta ixtisas təhsili müəssisəsinin pedaqoji şurasının iclas protokollarından çıxarışlar əlavə olunur.
10. Məqalədəki faktların, məlumatların dürüstlüyünə müəlliflər cavabdehdir. İrəli sürülən elmi müddəalar müəllifin özünə məxsus olmalı, istifadə edilmiş nəzəri fikirlərin mənbəyi göstərilməlidir.
11. Məqalədə son 5-10 ildə çap olunan əsərlərə istinadlara üstünlük verilməlidir. Məqalənin sonunda verilən ədəbiyyat siyahısı əlifba ardıcıllığı ilə deyil, istinad olunan ədəbiyyatların mətndə rast gəlindiyi ardıcıllıqla nömrələnməli və məsələn, (1) və ya (1, s. 119) kimi işarə olunmalıdır. Eyni ədəbiyyata mətndə başqa bir yerdə təkrar istinad olunarsa, onda istinad olunan həmin ədəbiyyat əvvəlki nömrə ilə göstərilməlidir.
12. Jurnal öz profilinə uyğun məqalələri dərc edir.
13. Elmi məqalələrin sonunda elm sahəsinin və məqalənin xarakterinə uyğun olaraq aktuallıq əsaslandırılmalı, elmi yeniliyi, tətbiqi əhəmiyyəti, iqtisadi səmərəsi və s. aydın şəkildə verilməlidir.
14. Daha sonra istinad olunmuş ədəbiyyatın siyahısı verilir.
15. Plagiatlıq faktları aşkar edildikdə həmin məqalənin nəşri dayandırılır.
16. Məqalə müəlliflərinin hüquqları qorunur.
17. Jurnalda "ardı növbəti nömrədə" adı altında seriya məqalələr dərc olunmur.
18. Məqalələrin müxtəlif dillərdə olan xülasələri bir-birinin eyni olmalı və məqalənin məzmununa uyğun gəlməlidir.
19. Məqalənin sonunda rəyçilərin adı, atasının adı və soy adı, elmi dərəcəsi və elmi adı; sonrakı sətirdə məqalə müəllifinin elektron ünvanı (E-mail) göstərilməlidir.
20. Məqaləyə müəllif haqqında aşağıdakı məlumatlar əlavə olunur: məqalə müəllif(lər)inin adı, atasının adı soyadı, işlədiyi müəssisə (hansı müəssisədə doktorant və dissertant olması) və müəssisənin ünvanı, müəllif(lər)in vəzifəsi, elmi dərəcəsi və adı, iş və ev telefonları, ev ünvanı, elektron poçt ünvanı (Email).

## ТРЕБОВАНИЯ К ПРЕДСТАВЛЕННЫМ СТАТЬЯМ

1. Принимаются статьи, не представленные в других редакциях.
2. Статьи должны отражать результаты последних исследований, быть богатыми новыми идеями, в них должны быть соблюдены требования, предъявляемые написанию научных статей.
3. Текст статьи должен составлять около 6-8 страниц. Ключевые слова для статьи должны быть представлены на трех языках: азербайджанском, русском и английском.
4. Текст статьи должен быть представлен на диске вместе с электронным вариантом, с интервалом

1,5; шрифтом 14 Times New Roman - латинского алфавита на азербайджанском языке, кириллицы на русском языке, и английским алфавитом (США) на английском языке.

5. Статьи публикуются на одном из трех языков - азербайджанском, русском и английском. Резюме статьи предоставлено на 3 языках (азербайджанском, русском и английском). В статье должны быть отражены основные научные положения, изложенные в резюме, выводы, сделанные из исследования, должна быть представлена теоретическая и практическая значимость проблемы.
6. Статья должна быть написана в следующем порядке: на первой строке имя, фамилия и отчество автора (авторов); вторая строка содержит ученую степень и ученое звание (диссертант или докторант и т. д.); третья строка указывает место работы, должность; на четвертой строке представлено название статьи прописными буквами. Затем эта же информация повторяется на русском и английском языках.
7. Нежелательно иметь более трех соавторов.
8. Редакция имеет право вносить изменения и сокращения в статью.
9. Вместе со статьей должно быть предоставлено два отзыва специалистов: заведующих кафедрой или отделом, а также выписка из протокола Ученого совета вузов и педагогического совета общеобразовательного или среднего специального образования.
10. Авторы статьи несут ответственность за достоверность приведенных в статье фактов и информации. Предлагаемые научные положения должны принадлежать автору и должен быть указан источник используемых теоретических идей.
11. Ссылки следует давать на работы, опубликованные за последние 5-10 лет. Список литературы, приведенный в конце статьи, должен быть пронумерован не в алфавитном порядке, а в том порядке, в котором указанная литература появляется в тексте, например (1) или (1, стр. 119). Если та же самая литература повторяется в другом месте в тексте, то эта же литература должна быть указана под предыдущим номером.
12. Журнал публикует статьи, имеющие отношение к его профилю.
13. В конце научной статьи должна быть обоснована актуальность в соответствии с характером статьи и областью науки, четко указана научная новизна, важность ее применения, экономическая эффективность и т.д.
14. Затем предоставляется список использованной литературы.
15. При обнаружении фактов плагиата публикация статьи прекращается.
16. Права авторов статьи защищены.
17. Журнал не публикует серии статей под заголовком «продолжение в следующем номере».
18. Резюме статей на разных языках должны быть одинаковыми и соответствовать содержанию статьи.
19. В конце статьи должно быть указано имя, отчество и фамилия рецензентов, их ученая степень и ученое звание; следующая строка должна содержать адрес электронной почты автора статьи.
20. В статью добавляется следующая информация об авторе: имя, фамилия, отчество автора (авторов), учреждение, где он работает (докторантом или диссертантом которого является) адрес учреждения, должность, ученая степень и звание автора(ов), домашний и рабочий телефоны, домашний адрес, электронная почта (E-mail).

**REQUIREMENTS FOR SUBMITTED ARTICLES**

1. Submitted articles should not be published or accepted for publication in other editions.
2. Articles should reflect the results of recent research, be rich in new ideas and they must comply with the requirements for writing scientific articles.
3. The text of the article should be about 6-8 pages. Keywords for the article should be presented in three languages: Azerbaijani, Russian and English.
4. The text of the article should be presented on the disk together with the electronic version, with an interval of 1.5; 14 point Times New Roman font - Latin alphabet in Azerbaijani, Cyrillic in Russian, and English alphabet (USA) in English.
5. Articles are published in one of three languages - Azerbaijani, Russian and English. A summary of the article is provided in 3 languages (Azerbaijani, Russian and English). The article should reflect the main scientific provisions presented in the summary, the conclusions drawn from the study, the theoretical and practical significance of the problem should be presented.
6. The article is written in the following order: on the first line the name, surname and patronymic of the author (s); the second line contains the academic degree and academic title (doctoral student or candidate for a degree, etc.); the third line indicates the place of work, position; the fourth line represents the title of the article in capital letters. Then in this order the same information is repeated in Russian and English.
7. It is undesirable to have more than three co-authors.
8. The Editorial Board has the right to make changes and reductions in the article.
9. Two expert reviews should be provided together with the article: heads of department or chair, as well as extract from the protocol of Academic Council of the higher school and the Pedagogical Council of general or secondary special education institutions.
10. The authors of the article are responsible for the accuracy of the facts and information provided in the article. The proposed scientific provisions should belong to the author and the source of used theoretical ideas must be indicated.
11. The articles should refer to works published in the last 5-10 years. The list of references given at the end of the article should not be numbered in alphabetical order, but in the order in which the indicated literature appears in the text, for example (1) or (1, p. 119). If the same literature is repeated elsewhere in the text, then the same literature should be indicated under the previous number.
12. The journal publishes articles related to its profile.
13. At the end of a scientific article, the relevance should be justified according to the nature of the article and the area of science, scientific novelty, importance of its application, economic efficiency, etc. should be clearly indicated.
14. Then a list of references is provided.
15. When the facts of plagiarism are discovered, the publication of the article is stopped.
16. The rights of the authors of the article are protected.
17. The journal does not publish a series of articles under the heading “continued in the next issue”.
18. Summary of articles in different languages should be the same and consistent with the content of the article.
19. At the end of the article the name, patronymic and last name of the reviewers, their academic degree and academic title should be indicated; the next line should contain the email address of the author of the article.
20. The following information about the author is added to the article: name, surname, patronymic of the author (authors), the institution where he works (doctoral student or candidate for a degree), address of the institution, position, academic degree and the title of the author (s), home and work phones, home address, email address.

